AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASININ
FOLKLOR İNSTİTUTU

# MİSKİN ABDAL – SƏFƏVİLƏRİN BÖYÜK İDEOLOQU, SUFİ ŞEYXİ

*(şeirləri və dastanları)*

Bakı – 2018

**Azərbaycan Milli Elmlər Akademiyasının Folklor İnstitutunun Elmi Şurasının 14.12.2018-ci il tarixli (protokol №7) qərarı ilə nəşr edilir.**

---

**"MİSKİN ABDAL –
SƏFƏVİLƏRİN BÖYÜK İDEOLOQU, SUFİ ŞEYXİ"**
Bakı, 2018, 496 səh.

**Toplayan, tərtib edən,
ön sözün müəllifi:** Mahmud Qara oğlu Allahmanlı
filologiya elmləri doktoru, professor

**Elmi redaktor:** Hüseyn Ələsgər oğlu İsmayılov
filologiya elmləri doktoru, professor

**Rəyçilər:** Qüdrət Umud oğlu Umudov
filologiya üzrə fəlsəfə doktoru

Tacir Şaban oğlu Qurbanov
filologiya üzrə fəlsəfə doktoru

Bu kitabda I Şah İsmayıl Xətainin mürşidi, Səfəvilər dövlətinin görkəmli ideoloqu və dövlət xadimi, tanınmış diplomat, hərbi sərkərdə, təsəvvüf mütəfəkkiri, filosof, sufi şair, ozandan aşığa, qopuzdan saza keçidin banisi, Haqq aşiqliyi (Haqq aşıqlığı) sənətinin əsasını qoymuş, çoxsaylı sufi-təsəvvüf musiqiləri – aşıq havalarının müəllifi, Qeyb Ərəni (Ricalül-Qeyb), Pir, Övliya, Allahdan əta edilmiş böyük möcüzələr, kəramətlər, fəzilətlər və müqəddəs «Ocaq» sahibi, tarixi şəxsiyyət, 1430-1535-ci illərdə yaşamış, bəşəriyyətin beşiyi, tarixi Oğuz yurdu – Göyçə mahalının Zərgərli (Sarıyaqub) kəndindən olan Miskin Abdalın – Seyyid Hüseyn Məhəmməd oğlunun həyatı haqqında məlumat, böyük ədibin indiyədək toplanılmış şeirləri, onun haqqında özünün sağlığında və ya vəfatından sonra sufi aşiqləri tərəfindən yaradılmış «Miskin Abdal və Sənubər», «Miskin Abdal və Şah İsmayıl» dastanları, habelə özü tərəfindən yaradılmış «Aslan şah və İbrahim» və «Yetim Hüseyn» dastanları» toplanmışdır.

**ISBN 978-9952-476-98-9**

*«Bizim tarixi torpaqlarımız İrəvan xanlığıdır, Zəngəzur, Göyçə mahallarıdır. Bugünkü Ermənistan tarixi Azərbaycan torpaqlarında yaradılıb. İrəvan xanlığının əhalisinin 70-80 %-i azərbaycanlılar olub. Bunu gənc nəsil də, dünya da bilməlidir. Çox şadam ki, mənim tövsiyəmlə bizim əzəli torpaqlarımızın tarixi ilə bağlı, İrəvan xanlığı haqqında çox sanballı elmi əsərlər yaradılır, bir neçə xarici dilə tərcümə edilir. Bu əsərlər faktlar, həqiqətlər üzərində yaradılır. Biz növbəti illərdə bu istiqamətdə daha fəal olmalıyıq. Çünki, İrəvan bizim tarixi torpağımızdır və biz azərbaycanlılar bu tarixi torpaqlara qayıtmalıyıq. Bu, bizim siyasi və strateji hədəfimizdir və biz tədricən bu hədəfə yaxınlaşmalıyıq».*

**İLHAM ƏLİYEV**
*Azərbaycan Respublikasının Prezidenti*

# ÖN SÖZ

## *(SƏFƏVİLƏRİN BÖYÜK İDEOLOQU – MİSKİN ABDAL)*

Miskin Abdal kimi məşhur olan Seyyid Hüseyn Məhəmməd oğlunun (1430-1535) barəsində aparılan tədqiqatlar da, məhz Prezident İlham Əliyev cənablarının Azərbaycan dövlətçiliyinin, bu günkü və gələcək nəsillərin qarşısında qoyduğu həmin strateji hədəflərə nail olmaq yolunda son dərəcə əhəmiyyətlidir. Bu baxımdan, Miskin Abdal, nəinki Qərbi Azərbaycanın, bütövlükdə Vahid, Böyük və möhtəşəm Azərbaycan tarixinin fəxridir.

XV-XVI yüzilliklərdə yaşayıb-yaratmış, I Şah İsmayıl Xətainin mürşidi, tarixdə ilk dəfə ideoloji doktrinanı, nəzəriyyəni Vahid və Böyük Azərbaycan idealı uğrunda reallaşdıraraq, «Səfəviyyə» təsəvvüf-ürfan cərəyanının siyasi hakimiyyətə gəlməsi ilə Azərbaycan tarixində ən qüdrətli, nəhəng bir dövlətin qurulmasının (1501) baş ideoloqu, Səfəvilərin böyük dövlət xadimi, dövrünün tanınmış diplomatı, hərbi sərkərdə, təsəvvüf mütəfəkkiri, filosof, sufi şair, ozandan aşığa, qopuzdan saza keçidin banisi, Haqq aşiqliyi (Haqq aşıqlığı) sənətinin əsasını qoymuş, çoxsaylı sufi-təsəvvüf musiqiləri – aşıq havalarının müəllifi, Qeyb Ərəni (Ricalül-Qeyb), Pir, Övliya, Allahdan əta edilmiş böyük möcüzələr, kəramətlər, fəzilətlər və müqəddəs «Ocaq» sahibi, tarixi şəxsiyyət Miskin Abdal – Seyyid Hüseyn Məhəmməd oğlu təxminən 1430-cu ildə bəşəriyyətin beşiyi, tarixi Oğuz yurdu, qədim Göyçə mahalının (Basarkeçər rayonunun) keçmiş Zərgərli, sonralar Sarıyaqub adlanan kəndində

«Zərgərli» tayfasının adlı-sanlı nümayəndəsi Cəfər oğlu Məhəmmədin ailəsində doğulmuşdur. Zərgərli kəndi Çar Rusiyası dövründə XIX əsrdə Miskin Abdalın yeganə oğlu Şadmanın şəcərəsindən olan «Sarı» ləqəbli Yaqub Ağanın şərəfinə Sarıyaqub adlanmışdır.

Miskin Abdalın ulu babası Yaqub, Səfəvilərin ulu babası Şeyx Səfiəddinlə yaxın dostluq, pir-murşid əlaqəsi, təsəvvüf-sufilik ideyasına, «Abdallıq konsepsiyası»nın bir qolu olan «Səfəviyyə» təriqətinə mənsubluq və həmin təriqətin yayılması ilə bağlı sıx münasibətlərdə olduğundan bu dostluq ənənələri nəslin sonrakı nümayəndələri tərəfindən də uğurla davam etdirilmişdir.

Miskin Abdal özünün şeirlərində Seyyid olduğunu ifadə etmişdir. Məlum olduğu kimi, «Seyyid» ərəbcə «ağa, bəy» deməkdir, Məhəmməd Peyğəmbərin nəvələri, İmam Əlinin övladları: Hüseynin nəslindən olanlara Seyyid, digər nəvəsi Həsənin nəslindən olanlara isə Şərif deyilmişdir. Miskin Abdal şeirlərində «Seyyid» olduğunu göstərərək, Məhəmməd Peyğəmbərin Əhli-Beyti olan Hüseynin nəslindən olduğuna işarə etmişdir:

*«Seyyid Miskin Abbal mənəm, söz mənim meydan mənim,*
*Qoruyanım, özün qoru, xain dostlardan məni».*

Digər bir şeirində isə o, yuxuda İmam Əlini gördüyünü, Haqqdan ona kəramət «Pir», «Seyyid» olduğunun sorağının verildiyini, müjdələndiyini göstərir:

*«Bu gecə vayğamda gördüm Əlini,*
*«Səni pir sahibi görürəm» – dedi.*
*Gülüb, kürəyimə vurdu əlini,*
*«Ömrünə bir çələng hörürəm» – dedi.*

*«Allahın şiriyəm, bir bax, didəmə,*
*Qoru din-məzhəbi, olmaz sədəmə,*
*Dolan bu dünyanı, yoruldum, demə,*
*Dalında dağ kimi dururam» – dedi.*

*«Sərində ağıl var, qüvvət qolunda,*
*Mələklər qoruyur sağı-solunda,*
*Seyyidsən, dərvişsən Haqqın yolunda,*
*Abdala Haqq payı verirəm» – dedi».*

Digər bir «Əlif-Lam» adlı şeirində isə özünün təmiz, pak nəsildən olduğunu belə ifadə etmişdir:

*«Təmiz əkilmişəm, pak doğulmuşam,*
*Atadan-anadan lütfi-halalam.*
*Dərsimi Haqq verib, ağdan almışam,*
*Dilimdə əzbərdir, doxsan min kəlam».*

Miskin Abdalın özündən əvvəlki nəsil şəcərəsində, bizə, XIII əsrdə yaşamış, Şah İsmayıl Xətainin babası Şeyx Səfiəddinin müasiri olmuş Yaqub adlı babasının və ondan sonrakı oğul, nəvə-nəticələrinin adları məlumdur. Miskin Abdaldan əvvəlki nəsil şəcərəsi belədir: ulu babası Yaqub, onun oğlu İbrahim, onun oğlu İsmayıl – XIII əsrdə; İsmayılın oğlu Əli, onun oğlu Cəfər, onun oğlu Məhəmməd (Miskin Abdalın atası) – XIV-XV əsrlərdə yaşamışlar. Miskin Abdal özü isə 1430-1535-ci illərdə – XV-XVI əsrlərdə yaşamışdır.

Miskin Abdalın yeganə oğlu Şadmanın (digər iki oğlu Əli və Həsən Dağıstan dağlarında həlak olmuşlar) nəsil şəcərəsinin mərkəzi – əsas xətti barəsində əldə edilmiş məlumatlar belədir:

Şadman XV-XVI əsrlərdə yaşamışdır. Şadmanın oğlu Qənbər, onun oğlu Yağnalı, onun oğlu Yaqub XVI əsrdə, Yaqubun oğlu Hüseyn, onun oğlu İsmayıl, onun oğlu Məhəmməd XVII əsrdə, Məhəmmədin oğlu Yafəs, onun oğlu Hacı Mehdi, onun oğlu Kərbalayi Qənbər XVIII əsrdə, Kərbalayi Qənbərin oğlu Məşədi Hasan, onun oğlu Hüseyn, onun oğlu Paşa Həsənov XIX əsrdə (Hüseyn və oğlu Paşa həmçinin, XX əsrdə), Paşa Həsənovun oğlu Məhəmməd Hüseynov, onun oğlu Tofiq Hüseynzadə isə XX əsrdə yaşamışlar.

Yaxın dostluq və təriqət qardaşlığı münasibətləri çərçivəsində Miskin Abdalın atası Məhəmməd Cəfər oğlunun Şeyx Heydərlə yaxınlığı və qarşılıqlı etimadı sayəsində Şeyx Heydərin oğlu İsmayılın hələ uşaq olarkən düşmənləri tərəfindən təqib edildiyi illərdə, məhz Göyçədə ən çox etibar etdiyi Hüseyn Məhəmməd oğlu – Miskin Abdal və atası Məhəmməd Cəfər oğlu tərəfindən Göyçə gölündəki Ağdamar adasında yerləşən Ağdamar qalasında təqiblərdən gizlədilərək mühafizə edilməsi, ilk tərbiyəsini də Miskin Abdaldan alması barədə qaynaqlar mövcuddur. Ona görə də bu münasibətlər qardaşlıq-ailə münasibətləri qədər səmimi, yaxın və etibarlı olmuşdur.

Hüseyn (Miskin Abdal) atası Məhəmmədin yaxından qayğısı sayəsində kiçik yaşlarından o dövrün ədəbi və rəsmi dövlət həyatı üçün zəruri sayılan ərəb və fars dillərinə mükəmməl yiyələnmiş, cəng oyunlarını mənimsəmiş, Göyçə ozan, qopuz mühitinin sirrlərinə yaxından bələd olmuş, çox erkən yaşlarından İslam dininin, o cümlədən, «Quran»ın incəliklərini dərindən öyrənərək, «Abdallıq nəzəriyyəsi» və onun əsasında yaranmış, Səfəvilərin ideya məsləki olan «Səfəviyyə» sufilik təriqətinin geniş təbliğinə başlamış, çox qısa zamanda yüksək ad-san qazanmışdır. Təsadüfi deyildir ki, Miskin Abdal şeirlərində

İslamda ən müqəddəs məkanlardan olan Türkiyənin Cizrə şəhərində Nuh Peyğəmbərin qəbri üzərində türbəsi (və yanında böyük cami) olan «Günbəz-əl Cizrə» və tarixi Fələstin torpaqlarında – Qüds şəhərinin şərqində «Qədim Şəhər» hissəsində yerləşən, Məhəmməd Peyğəmbərin meracını gerçəkləşdirdiyi, «Quran»da «ətrafını mübarək etdik» kimi şərəfləndirilən «Məscidi-Əqsa»da, özünün «Dür Usta» – Pak Ustad kimi tanındığını göstərmişdir ki, bu da onun öz dövründə İslam arealında nə qədər böyük nüfuza və etimada malik din xadimi, ilahiyyatçı, mürşid olduğunu sübut edir.

Miskin Abdal Sufilik – Təsəvvüf yolunda böyük bir yol, Təsəvvüfün Şəriət, Təriqət, Mərifət mərhələlərini keçərək, Həqiqət mərhələsinə (Abdallıq) qovuşmuş, «Abdallıq konsepsiyası»na uyğun olaraq «Qırx Abdal» – «Qurxlar piri» dərsini almış, ulu babaları kimi ona da Haqqdan hikmət, fəzilət, kəramət – İlahi vergi, müqəddəslik, möcüzələr sahibi olmaq – Pir, «Ocaq» nazil olmuş, Pir məqamları sayılan «Miskin» və «Abdal» zirvələrinə çatmış və tarixdə, məhz bu adları, hər iki – ən yüksək sufi dərəcələrinin vəhdəti ilə tanınmışdır.

Miskin Abdalın barəsində indiyədək toplanmış çoxsaylı tarixi fakt və məlumatlara əsasən, onun Təsəvvüf – Sufilik mərtəbələrinin hər üçünü – Şəriət, Təriqət və Mərifət mərhələlərini keçərək, «İlahi vergi» ilə mükafatlandırılaraq, Həqiqət mərhələsinə – Ali Haqq Yaradana qovuşduğu, buna görə də, təsəvvüf ordeni kimi «Abdal» adını aldığı təsdiq edilmişdir. Miskin Abdal Azərbaycan və dünya sufi ədəbiyyatının böyük şairi və övliyasıdır. Miskin Abdalın əsl adından (Hüseyn Məhəmmədoğlu) kənarda daşıdığı «Miskin» və «Abdal» anlayışları da birmənalı olaraq, onun təsəvvüf – sufilik təriqətində qazandığı ən yüksək mərtəbə – silsilə adları ilə bağlı olmaqla həmin sözlərin adi mənasından tam fərqli şəkildə qəbul edilir.

1500-ci ildə təriqət Şahı – Şeyx Heydər oğlu İsmayıl «Qızılbaşlar hərəkatı» çərçivəsində Şimali Azərbaycana yürüşlər edərkən, Göyçəyə səfər edərək, Zərgərli (Sarıyaqub) kəndində, mürşidi olmuş, bu yerlərdə ən böyük dayağı olan lələsi Seyyid Hüseyn – Miskin Abdalı ziyarət edir, onun xeyir-duası ilə ətraf ərazilərdən çoxsaylı tərəfdarlar toplanır.

Bu münasibətlə Miskin Abdal şeirlərində deyir:

*«Vədə verdiyin ilqara,*
*Oğul, İsmayıl xoş gəldin!*
*Göyçə adlı bu diyara,*
*Oğul, İsmayıl, xoş gəldin!*

*Sazın-sözün sirri burda,*
*İgid olan qalmaz darda,*
*Sənə sadiq olan yurda,*
*Oğul, İsmayıl, xoş gəldin!*

*Bəxt yazılıb hər alına,*
*Bax Abdalın əhvalına,*
*Gözəlliklər mahalına,*
*Oğul, İsmayıl xoş gəldin».*

Digər vilayətlərdən zəfərlə qayıdan İsmayıl, yenə də Göyçədə Seyyid Hüseynin – Miskin Abdalın qonağı olur. Miskin Abdal bu münasibətlə şeirində deyir:

*«Sən getdin hünərlə, gəldin zəfərlə,*
*Qurtardın elləri yasdan, İsmayıl!*
*Yolların bəzənsin xalıyla, zərlə,*
*Adına yazılsın dastan, İsmayıl!».*

İsmayıl Göyçədəki beş kəndin vergisinin də ustadı Miskin Abdala çatacağına dair göstəriş verir, onun anadan olduğu Zərgərli (Sarıyaqub) kəndini vergidən azad edir və onu özü ilə Təbrizə aparır.

1501-ci ilin sentyabr ayının 24-də Təbrizdə Şeyx Heydər oğlu İsmayıl şahlıq şərbətini, məhz Seyyid Hüseynin – Miskin Abdalın əlindən alıb, içir, onun Övliya xeyir-duası ilə qırmızı geyinib, şahlıq taxtında əyləşir. Bu münasibətlə Miskin Abdal şeirlərinin birində deyir:

*«Bu tac, bu taxt qılsın vəfa,*
*Şeyx oğlu Şah İsmayıla!*
*Xıdır Nəbi, ol Mustafa,*
*Olsun pənah İsmayıla.*

*Abdal telə mizrab vurar,*
*Gün gələr ki, dastan qurar,*
*Yerdə Əli kömək durar,*
*Göydə Allah İsmayıla».*

Qızılbaşlar şahının məsləhəti ilə Miskin Abdal Səfəvilərin xarici əlaqələrinin qurulması və inkişafında misilsiz xidmətlər göstərir, bu məqsədlə Səfəvilərlə qonşu dövlətlərə səfərlərə gedib, diplomatik görüşlər keçirir, danışıqlar aparır, Səfəvilərin beynəlxalq səviyyədə mövqelərinin gücləndərilməsi və tərəfdar dövlətlərin dəstəyini daha da artırmaq missiyasını yerinə yetirir. Eyni zamanda, o, 1501-ci ildə Səfəvilərin şimal sərhədlərində – Dağıstan ərazilərində yaşayan əhali arasında Qızılbaşlar (Səfəviyyə) ideologiyasının yayılması məqsədilə dövlət elçisi, səlahiyyətli səfir qismində xidmətlər göstərir. Orada əsas dayaq

məntəqəsi kimi indiki Axtı rayonunun Miskincə kəndində məskən salır. Həmin kənd məhz onun şərəfinə yerli əhali tərəfindən «Miskincə» – yəni «Miskinli» adlanır. Maraqlı faktdır ki, həmin kənd Dağıstanın ləzgilər yaşayan ərazisində İslamın «Şiə» məzhəbində olan yeganə kənddir.

Hüseynin (Miskin Abdalın) atasının adı Məhəmməd, babasının adı Cəfər olmuşdur. Hüseynin ulu babalarının və törəmələrinin adları peyğəmbərlərin, atasının adı Məhəmməd Peyğəmbərin, özü isə onun nəvəsi, eyni zamanda İmam Əlinin oğlu İmam Hüseynin adını daşımışdır. Hüseynin ilk həyat yoldaşı Təbrizli Mahmudun («Miskin Abdal və Sənubər» dastanında o, «İlan Mahmud» adlanır) qızı Sənubər olmuş, onunla evlilikdən cəmi bir neçə ay sonra Sənubər vəfat etdiyindən, o 50 yaşınadək evlənməmiş, yalnız 50 yaşında İrəvandan tacir qızı Həlimə adlı qadınla evlənmiş, Həlimədən 4 övladı olmuş – oğlanlarının adı Şadman, Əli və Həsən, qızının adı Məleykə olmuşdur. Miskin Abdal ilk övladının adını Şadman qoymuşdur ki, bunun da çox hikmətli tarixçəsi vardır. «Şad» (Şadman) adı Azərbaycan xalqının genezisində başlanğıc və əsas rol oynamış qədim Azər (As, Az) tayfalarında, Altay, Mesopotomiya və Misir türklərində Tanrı adı olmuş, eyni zamanda, buna müvafiq olaraq, Göytürk və Xəzər xaqanlıqlarında ən yüksək Türk hökmdarı Titulu (Xaqan kimi) da olmuş, Xəzər Xaqanının oğlunun da adı Şad olmuşdur. Təsəvvüfdə də «Şad» sözü çox yüksək dərəcə, məna ifadə etmişdir. «Şad» sözü təsəvvüf mənasında Miskin Abdalın Təsəvvüf Şeyxi kimi Sufi yolçuluğunda ən yüksək pillələrindən birinə qovuşması anlamını daşıyır. Belə ki, «Şad» sözü Türk dilindən bir çox dillərə keçdiyi kimi, fars dillərinə də keçmiş və onlarda «sevinc, bəxtiyarlıq, xoşbəxtlik, nəşə» mənalarını verir. Təsəvvüfdə Sufinin Qəbz (İlyas) halından Bast (Xızır) halına

(ölməzliyə) keçməsinə «Şad» deyilir. Bast halı – Xızırı, Qəbz halı – İlyası tərənnüm edir. Xızır Hz.Musa zamanında yaşamış, Vəli və ya Peyğəmbər olması bilinməyən mübarək Zatdır. «Abi-həyat» deyilən əbədilik suyunu Hz.İlyas ilə tapıb, içdiyi üçün hər ikisinin qiyamətə qədər diri olduqlarına inanılır.

Təsəvvüfdə «Bast» halına Xızır, «Qəbz» halına İlyas deyilir. «Qəbz» – «bir şeyi barmaq ucları ilə tutub almaq» mənasını verir. «Qəbz» halı Allaha qovuşmaq yolunda sufini çətin vəziyyətə salır, qəlbində sıxıntı hiss etdirir, lakin bunun səbəbinin nə olduğu bilinməz. Sufilər bu hala tabe olmaq lazım gəldiyini söyləyərlər. Çünki, zamanın hökmünə boyun əyən, səbr edən sıxıntıdan, «Qəbz»dən qısa müddətdə qurtulur. «Bast» isə – «yaymaq, sərmək, döşəmək» mənalarını verir, təsəvvüfdə «Həvf», «Qəca» və «Qəbz» hallarından sonra gəlir, «Qəbz» halından daha şiddətlidir, «Qəbz» halında döş qəfəsinin sıxışdırıldığı və daraldığı hiss edildiyi halda, «Bast» halı bunlardan «qurtuluş, açılma və həfifləmə, yüngülləşmə» halıdır. Təsəvvüf kitabları Həqiqət əhlinin «Qəbz» və «Bast» hallarından Allaha sığındıqlarını ifadə edirlər. Zamanın Qütbünə həm də «Xızırı-Vaxt» adı verilir.

Göründüyü kimi, böyük Təsəvvüf Şeyxi ilk övladını sufilik yolunda əldə etdiyi böyük uğurun, yəni sufiliyin ən keşməkeşli, əzablı mənəvi yolçuluğunu qət edərək, ən şərəfli sayılan mərhələsinə, əbədiyyətə qədəm qoyması – Xızır, yəni əbədi diri olmaq halına keçməyi münasibəti ilə «Şadman» adlandırmışdır, yeni doğulan oğluna da Xızır məqamına yüksəlməyi, Haqqın dərgahında əbədi var olmağı arzulamışdır. «Şadman», bu mənada «Şad adam» mənasını daşımaqla, «Şad» – «şadlıq», «Man» isə qədim Türk dillərində «Mən», «Man» variantlarında mənsubiyyət, həmçinin «şəxs, adam» mənalarında işlənilmiş və əksər linqvistlərin qənaətlərinə görə, qərb dillərinə də bu söz, «Man»

olaraq, məhz Türk dillərindən keçmişdir. Xalq arasında «Ruhu Şad olsun!» deyimi də, bəsit mənada ruhun «şadlığı»nı, «şənliyini» deyil, əslində ruhun təsəvvüfdə qəbul olunduğu kimi, çətinlikdən, ağrı-əzablardan qurtularaq, «Şad» mərhələsinə, yüngüllüyə, yəni Xızır məqamına, həmişə diri olmaq məqamına, başqa sözlə, əbədiyyətə qovuşmasının arzu olunmasını ifadə edir.

Miskin Abdal, həmçinin digər övladlarına da təsəvvüfdə yüksək mənəvi mənalar ifadə edən adlar qoymuş – ikinci oğluna, İslam təsəvvüfündə «Şahi-Mərdan», «Şahi-Nəcəf», «Şahi-Vilayət», «Sultanül-Övliya», «Qurani-Natiq» (Danışan Quran), «Əsədulla» (Allahın aslanı), «Şiri-Yəzdan», «Seyfulla», «Heydəri-Kərrar», «Murtaza», «Əmirəl-Möminin» kimi uca adları olan, 10 yaşında İslamı qəbul edən İmam Əlinin, digərinə isə onun sevimli oğlu Həsənin adını qoymuşdur. Tarixdən məlumdur ki, Əlinin Hz.Fatimədən üç oğlu: Həsən, Hüseyin və Möhsün (hər üç ad «hüsn» sözündəndir, mənası hərfi olaraq «gözəl» mənasını verir) və iki qızı: Zeynəb və Ümmü Gülsüm olmuşdur. Hz.Əlinin künyələrindən biri də «Əbu Həsən» olmuş, yəni «Həsənin atası» kimi tanınmışdır. Miskin Abdal qızının adını isə Allahın yaratdığı ən pak məxluq, ucalıq, saflıq, ülvilik rəmzi olan varlığın şərəfinə Məleykə qoymuşdur. Təsəvvüfdə Şadman, Əli, Həsən və Məleykə adları çox yüksək idealları simvolizə edir.

Müəyyən səbəblər üzündən Miskin Abdal, 1503-cü ildə diplomatik missiyasını başa vurub, geri qayıdarkən Dağıstan dağlarında ailəsi ilə birlikdə güclü borana düşür. Boranda özü, arvadı Həlimə, böyük oğlu Şadman, qızı Məleykə xilas olsalar da, kiçik yaşlı oğlanları Həsən və Əli bu köçün qurbanı olurlar. Bu barədə o, məşhur «Dağlar» və «Dünya, səndə nəyim qaldı» adlı şerlərində həmin bədbəxt hadisəni də qələmə almışdır:

*«Nəhs illərdən satın aldın nəhs günü,*
*Çağırıb dumanı, tökdün çiskini,*
*Gözü yaşlı qoydun Cüda Miskini,*
*Eylə gülə-gülə tamaşa, dağlar.»;*

*«Ərşə-gürşə bəlli əslim,*
*Yaradana ollam təslim,*
*Adla, sanla olan nəslim,*
*Bir oğlum, bir qızım qaldı.*

*Şadman könlüm tari-mardır,*
*Şanda balım zəhri-mardır,*
*Günüm, gecəm ahu-zardır,*
*Şirin-şirin sözüm qaldı».*

Miskin Abdal 1514-cü ilə qədər Azərbaycanla qonşu olan dövlətlərdə diplomatik missiyasını ləyaqətlə yerinə yetirir, yüksək səfirlik məharəti göstərir. Uzaq məmləkətlərdə olduğu müddətlərdə Göyçə həsrəti onun qəlbini qübar etmiş, tez-tez şeirlərində bu həsrəti nəzmə çəkmişdir:

*«Qürbət eldə yanar ömür sürənlər,*
*Yasa batdı bu halımı görənlər.»;*

*«Həsrət qaldım Göyçə kimi elimə,*
*Əl uzatdım, əl çatmadı əlimə.»;*

*«Ya Rəbb, görən, kimlər yetər dadıma!?*
*Həsrət qaldım ocağıma, oduma,*
*Miskinəm, ərənlər düşdü yadıma,*
*Didəm yaşı selə döndü, ağlaram».*

Miskin Abdal 1514-cü ildə Cənubi Azərbaycanın Maku şəhəri yaxınlığında Osmanlılarla Səfəvilər arasında baş vermiş «Çaldıran döyüşü»ndə bir sərkərdə kimi iştirak etmiş və bu barədə şeirlərində göstərmişdir:

*«Qoymaynan, Miskin Abdal qəzada həlak olacaq,*
*Ey könül, gəl düş havadan, axırın xak olacaq!»;*

*«İslam bada gedir cəllad əlində,*
*Paşam, mürvət eylə, belə kar olmaz».*

1515-ci ildə Səfəvilər şahı I Şah İsmayıl Xətai Miskin Abdalın adına, onun məhz «Ricalül-qeyb»ə (Qeyb ərənləri) daxil olan müqəddəs Abdal – Övliya, Haqqdan kəramət, fəzilət, hikmət verilmiş şəxs olması kimi xüsusiyyətlərini ehtiva edən fərman imzalamışdır. Fərmanın məzmunu belədir: «Ey mömin insanlar, Miskin Abdal mötəbər şəxsdir, ona sidq ürəklə inanın, nə mətləbiniz varsa, ondan diləyin!». Bu fərmanda, Abdalların «Ricalül-qeyb» iyerarxiyasında malik olduğu kəramət, ilahi hikmət, mistik qüvvə, metafizik xüsusiyyətlər – «Abdalların Allahdan nə istəsələr, Allahın onu yerinə yetirəcəyi, onların yer yüzündə Allahın sevimli bəndələri və peyğəmbərlərin xələfi olması və sair möcüzələrə sahib olması»na dair inamların nə qədər təsirli olduğu özünü göstərir. Həmin fərman adi bir fərman deyildi. Bu, sufi mərtəbələrinin ən ali məqamlarına qovuşmuş qüdrətli bir Sufi Mürşidinin Təriqət Şahı tərəfindən, «Abdal»lıq doktrinasına aid müqəddəs «Abdal», «Pir» elan olunması demək idi, onun peyğəmbərlərin mənəvi Xələfi (ruhunun daşıyıcısı) – Haqqa qovuşmuş Abdal olması təsdiq olunurdu. Məhz bu fərmanda, «40 Abdal», «Qırxlar piri», müqəddəs şəxsiyyətlər, Peyğəmbərlərin

xələfləri olan Abdalın mistik, metafizik qüdrətə sahib olması öz əksini tapmışdır. «Abdal»ın malik olduğu qeyri-adi, mistik məziyyətləri barədə Tofiq Hüseynzadənin 2018-ci ilin noyabr ayında nəşr olunmuş «Miskin Abdal – Qeyb Ərəni və Təsəvvüf Piri» elmi-tədqiqat əsərində ətraflı məlumat verilmişdir.

Miskin Abdalın tarixin yaddaşında qalan, haqqında yaradılmış dastanlarda və xalqın hafizəsində daşlaşıb qalan, dillərdən düşməyən çoxsaylı kəramətləri, mistik – metafizik, fəvqəladə qabiliyyətləri və möcüzələri vardır ki, onlardan bir neçəsini təqdim edirik:

– Göyçədə, yaşadığı Zərgərli kəndində əhali içməli sudan əziyyət çəkdiyinə görə, Miskin Abdal hamının yanında bir neçə rükət namaz qılaraq, Allaha dərin zikrdə bulunaraq, dua etmiş, «Allahın qüdrəti və qüvvəti qarşısında hər şey acizdir» – demiş, Allah onun duasını qəbul edərək, göy üzü tutulmuş, möhkəm ildırım çaxmış, ildırım Miskin Abdalın yaşadığı evin arxasındakı böyük qayaya düşüb, qayanı ikiyə parçalamış, möcüzə olaraq həmin qayanın yarılan hissəsindən bir bulaq fışqırmışdır, həmin bulaq oğlunun adı ilə «Şadmanlı bulağı» adlanmışdır. Bu hadisə «Bibliya»da (Əhdi-Ətiq) «Saylar» kitabının 20-ci bölməsində xalqın sussuz qalaraq Musa Peyğəmbərə və qardaşı Haruna sudan əziyyət çəkmələrini bildirmələri, Musa və Harunun Allaha səcdəyə qapanaraq, bu xahişi Allaha çatdırmaları və Allahın izni ilə və Musaya bildirdiyi kimi, Musanın əsasını qayaya iki dəfə vurması nəticəsində qayadan bol su fışqırması, xalqın susuzluğunu aradan qaldırması əhvalatını xatırladır. «Şadmanlı bulağı»nın dibində boy atan ağacın dibində müqəddəs günlərdə gecələr şam yanmasına bənzər nur şöləlşənmişdir. XX əsrin başlanğıcında bir naxələf şəxs deyilənləri eşitməyərək, bu ağacı kəsib odun etmişdir. Bir il keçməmiş, həmin ailədən ancaq bir xarabalıq nişanə qalmışdır;

– Miskin Abdal Qərbi Azərbaycanın Axta (Razdan) rayonunun Miskin (sonradan «Qayğı ocağı» (yaxud Qayıb ocağı, Qeyb ocağı – bu adın, Miskin Abdalın Qeyb Ərəni – «Ricalül Qeyb» olması ilə əlaqədar verilməsi ehtimal edilir) və daha sonralar «Dədə Qışlaq» və ən sonda M.F.Axundovun adı ilə «Axundov» adlanmışdır) kəndində olarkən yerli əhali onun müqəddəsliyinə inanmayıb, sınamaq məqsədilə gur ocaq qalamış, Miskin Abdal qucağında qumral bir quzu ocağın içinə girmiş, ocaq yanıb qurtarmış, lakin nə özü, nə də quzu heç bir zərər görməmiş, bundan sonra əhali ona inam gətirmiş və kəndi onun adına «Miskin» adlandırmış, sonradan SSRİ dövründə həmin kənd «Qayğı ocağı» və «Axundov» ilə əvəzlənmişdir. Bu əhvalat «Quran»da «əl-Ənbiya» surəsinin 68-70-ci, «Səffat» surəsinin 97-98-ci və «əl-Ənkəbut» surəsinin 24-cü ayələrində göstərilən İbrahim Peyğəmbərin Nəmrud tərəfindən yandırılması üçün odun içərisinə atılması, lakin Allahın onu qoruması və zərər çəkmədən xilas olması əhvalatını xatırladır;

– Miskin Abdalın Göyçədə Zərgərli kəndindəki evinin həyətinə qeybdən marallar gəlmişdir; bundan başqa, bir dəfə oğlu Şadman quldurları öldürdüyünə görə həyətdə arvadı Həlimənin qaladığı ocağa qazanda qoyulmuş maral südü qan kəsmiş, bu əlamətə əsasən, ona, oğlu Şadmanın haradasa «qan salması» – adam öldürməsi əyan olmuş, Şadman evə qayıtdıqda quldurları öldürməsini atasına bildirmiş, Miskin Abdal hirslənərək, əlindəki çəliyi yerə qeyzlə vurmuş, bu vaxt zəlzələ baş vermiş, əsa burum-burum olmuş (hazırda da həmin çəlik saxlanılır), o, ocaqdan höyüş bir odun götürüb, Şadmana tərəf atmış, lakin Allah Şadmanı, günahı olmadığı üçün, atasının qəzəbindən qorumuş, odun ona çatmamış yerə sancılaraq, «Yanıq armud» ağacına çevrilmiş, ağac hər axşam sanki yanırmış kimi, özündən nur saçmış, yerli

əhali tərəfindən ziyarət edilmişdir. Həmin əhvalat Sarıyaqub və ətraf kəndlərin əhalisinin uşaqdan-böyüyə hamısının dilinin əzbəridir. Qərbi Azərbaycanın indiki Qarakilsə (Quqark) rayonunun Haydarlı və Hollavar kəndləri və Axta (Razdan) rayonunun Miskin (Axundov) kəndlərinin əhalisi arasında da «Yanıq armud» ağacı ilə bağlı maraqlı əhvalatlar indi də yaşayır;

– Gədəbəy rayonunda 11 kəndi əhatə edən Miskinli obasında da Miskin Abdal bir müddət yaşamış, orada da onun ocaq çatdığı, namaz qıldığı yerlər müqəddəs sayılmışdır. Orada Miskin Abdalın adına bir neçə «Ocaq» yeri hazırda da insanlar tərəfindən ziyarət edilir, həmin obanın əhalisi də Miskin Abdalı mənəvi cəhətdən «ulu baba»ları sayırlar;

– Dağıstanın Axtı rayonunun «Miskinci» kəndi də Miskin Abdalın bir müddət yaşadığı yerlərdən olmuş, həmin kənddə də onun adına çoxsaylı (19 ədəd) ziyarət yerləri olmaqla, bu gün də həmin kəndin əhalisi Miskin Abdalı özlərinin mənəvi cəhətdən ulu babası kimi yad edirlər;

– Qərbi Azərbaycanın indiki Qarakilsə (Quqark) rayonunun Mollaqışlaq, Haydarlı və Hollavar kəndlərinin ərazisində Miskin Abdal ilə bağlı 8 ziyarət – Ocaq yeri vardır. Həmin kəndlərin əhalisi arasında bu gün də yaşayan rəvayətlərə görə, bir dəfə Miskin Abdal Maymaq dağının başına çıxmış, oradakı cahil, gənc şəxslər Miskin Abdaldan bir möcüzə göstərməsini xahiş etmiş, Miskin Abdal Allaha dua edib, çəliyini yerə möhkəm vurmuş, həmin yerdə həmin vaxtadək heç bir su mənbəyi, bulaq olmamasına və bulaq çıxması üçün ehtimal belə olmadığı, yəni çox uca yer olmasına baxmayaraq, çəlik dəyən yerdən su, bulaq qaynamağa başlamış, içindəki xırda daşlar da rəngarəng olmuşdur. Həmin gündən bu bulaq «Miskin bulağı» adlanmışdır. Sonrakı əsrlərdə ora köçürülən ermənilər bulağı murdarladıqları üçün bulaq qurumuşdur;

– Qarakilsə (Quqark) rayonunun Mollaqışlaq kəndinin ərazisində Cəbrayıl, Şorax və Xamoy dağlarının arasında Şorax dərəsində XVI əsrdən yadigar qalan «Miskin Abdal ocağı» 1988-ci ilin məlum hadisələrinə qədər dini ziyarətgah kimi insanların ümid, pənah yeri olmuşdur. Həmin kəndlərin əhalisi, hamısı Miskin Abdalı özlərinin mənəvi cəhətdən «ulu baba»sı hesab edirlər;

– Miskin Abdal Təbrizdə sarayda olduğu vaxtlarda, Allahın lütfü olaraq verilmiş – gözə görünə bilməmək («Tayyi məkan» və «Tayyi zaman») kəramətinə görə, Şah İsmayıl Xətainin sarayında Şahın otağına keçərkən saray mühafizəçiləri onu görməmiş, yəni onların gözünə görünməmiş, ona görə də mühafizəçiləri Şahı xəbərdar edə bilməmiş, içəri daxil olduqda Şah bu işə heyran qalmış, mühafizəçilərini çağırtdırıb, soruşmuş, onlar Miskin Abdalın içəri keçməsini görməmələrini demişlər. Bu hadisə «Miskin Abdal və Şah İsmayıl Xətai» dastanında, habelə Miskin Abdal və Şah İsmayıl Xətainin şeirlərində öz əksini tapmışdır (Miskin Abdalın törəmələrindən olan, Tofiq Hüseynzadənin babası Paşanın qardaşı – XX əsrdə yaşamış Həsənov Abuzər Hüseyn oğlunda da eyni qəbiliyyətlər olmuşdur);

– Səfəvilərin apardığı döyüşlərin birində Miskin Abdal sərkərdə kimi iştirak edərkən, qoşunun azuqəsi qurtarmış, çıxılmaz vəziyyətdə qalmış, Miskin Abdal qoşunu yeməklə təmin edəcəyini bildirib, Allahı zikr edərək, çoxsaylı dualar edərək, kömək istəmiş, Allah onun duasını qəbul buyurmuş, o, bir badya qatıq və bir kömbə çörəklə bütün qoşunu doydurmuş, yeyildikcə, qatıq qabda bulaq kimi qaynayıb, artmış və çörək də yeyildikcə artmış, hələ artıq da qalmışdır. Bunu görən Şah İsmayıl və qoşunu çox heyrətlənmiş və onun böyük kəramət sahibi olduğuna qəti iman etmişlər. Miskin Abdalın həmin badyası (qab) indi də «Ocağ»ında

saxlanılır. Bu əhvalat «Bibliya»nın tərkib hissəsi olan «İncil»də İsa Peyğəmbərin bir dəfə göyə baxaraq, Allaha dua edib 5.000 nəfər kişini (qadın və uşaqlar istisna olmaqla) 5 çörək və 2 balıqla doyurması, 12 dolu səbətin də artıq qalması, bir dəfə isə «şükran duası» edərək, 3 gündür ac qalan 4.000 kişini (qadın və uşaqlar istisna olmaqla) 7 çörək və bir az da balıqla doyurması, 7 dolu zənbil yeməyin də artıq qalması əhvalatlarını xatırladır;

– Şadmanın, atası Miskin Abdalın vəsiyyətinə uyğun olaraq, atasının əşya və sənədlərini – «Ocağ»ı saxlamaq üçün bacısı Məleykəyə verərkən atasının burum əsasının evdə qalması, qalan əşya və sənədləri isə verməsi, həmin gecə «Ocaq»dakı əşya və sənədlərin Məleykənin evindən, taxçada qoyduğu yerdən qeyb olması, yəni Şadmanın evinə qayıtması, Şadmanın «Ocağ»ı qaytarsa da, yenə də bir neçə gün həmin halın təkrarlanması, sonradan, atası Miskin Abdalın Şadmanın yuxusuna girməsi, Şadmana, evində atasından yadigar saxladığı, «harma»ya taxdığı burum əsasını da həmin «Ocağ»ın içərisinə qoyub, bacısına qaytarmasını bildirməsi və bundan sonra bir daha «Ocağ»ın geri qayıtmaması – Göyçədə ən çox yayılmış rəvayətlərdən biri idi;

– «Miskin Abdal» dünyadan köçdükdən sonra da onun «Ocağı» daim ona inam bəsləyənlərin ümid, pənah yeri olmuş, dara düşən, darlıqda qalan, bədbəxt tale və hadisə ilə üzləşən hər kəs onun vasitəsilə Allahı köməyə çağırmış, Göyçədə istənilən bədbəxt hadisənin qarşısının alınması üçün əhali Miskin Abdalın «Ocağı»nı ziyarət etməklə, Allahdan kömək diləmiş, Allah da onların dua və çağırışlarını eşidərək, kömək etmişdir. Son illərdə – 1986-cı ildə Sarıyaqub kəndinə dəhşətli sel fəlakətinin itkisiz ötüşməsi və 1988-ci ilin dekabr ayında əhalinin ermənilər tərəfindən doğma yurdlarından zorla çıxarılarkən, qışın ən sərt

çağında Kiçik Qafqazın keçilməz dağ yollarından bütöv bir elin, mahalın sağ-salamat keçməsi vaxtı da hamı Miskin Abdalın ocağı vasitəsilə Allahı köməyə çağırırdı, Miskin Abdal öz imdad şahpərini, elə bil ki, doğmalarının üstünə çəkmişdi.

– Miskin Abdal cismən doğmalarının yanında olmasa da, Qeyb Ərəni – «Ricalül Qeyb» kimi onun həmişə diri olan müqəddəs ruhu və mistik qüvvəsi doğmalarının yurdunda, ocağında dolaşırdı. Bu müqəddəsliyin təzahürü kimi vaxtilə Miskin Abdalın, sonra isə oğlu Şadman və törəmələrinin, 1988-ci ilin məlum hadisələrinə qədər isə, Tofiq Hüseynzadənin ailəlikcə yaşadığı ocaqda – evin həyətində həmişə bir «Ocaq ilanı» yaşayırdı. Bundan başqa, 1988-ci ilin məlum hadisələrindən sonra bir dəfə Sarıyaqub kəndinə gedən Tofiqin əmisi, qonşuluqda yaşayan Lətif Hüseynov çox maraqlı bir faktın şahidi olmuşdu. Lətif Hüseynov 1988-ci ilin dekabr ayınadək Sarıyaqub kənd orta məktəbində təsərrüfat müdiri vəzifəsində işlədiyindən, 1988-ci ilin məlum hadisələri ilə əlaqədar, kəndin Azərbaycanlı əhalisi doğma yurdlarını tərk etdikdən sonra dövlət xətti ilə kənd orta məktəbinin maddi vəsaitlərinin təhvil-təslimi üçün 1989-cu ildə Sarıyaqub kəndində qayıtmalı olmuş, orada kəndə yenicə köçmüş bir yaşlı erməni ona vaxtilə Miskin Abdalın yaşadığı, Tofiqin isə 1988-ci ilədək yaşadığı həmin «Ev damı» deyilən yerin «Pir» olduğunu demiş (ermənilər ziyarətgahlara, «Ocağa» «Pir» deyirdilər), əmisi L.Hüseynov bu müqəddəs yurdun – evin ermənilər tərəfindən murdarlanacağından və ya dağıdılacağından çəkinərək, orada Pir olmasını inkar etməyə çalışmış, lakin həmin erməni, bu evdə gözünə «Nur» göründüyü və digər çox təsirli möcüzə faktları ilə qarşılaşdığını («Nur» görməsindən başqa, digər nələrin şahidi olması barədə əmim L. Hüseynova danışmaqdan imtina etmiş) israrla bildirərək, evin

«Pir», yəni «Ocaq» olduğunu demişdir. Məhz həmin faktdan sonra ermənilər həmin evlərə, yəni Tofiqin yaşadığı və qonşuluqda, ona bitişik olan əmisi Lətifin evlərinə toxunmamış və orada yaşamaqdan çəkinmişdilər. Allahın izni ilə, Miskin Abdalın müqəddəs ruhu öz möcüzəsi ilə naxələf erməniləri «Ocağı»na ayaq basıb, orada yurd salmağa imkan verməmişdir.

Göstərilənlərdən başqa, Miskin Abdalın çoxsaylı kəramətləri, möcüzələri barədə 2005-ci ildə nəşr olunmuş, Tofiq Hüseynzadənin müəllifi olduğu «Səfəvilərin böyük övliyası – Miskin Abdal», 2018-ci ilin mart ayında nəşr olunmuş 3 cildlik «Xəyal cığırı» kitabının 3-cü cildinə daxil edilmiş «Miskin Abdal – Qeyb Ərəni, Təsəvvüf Piri» elmi tədqiqat əsərində (həmin əsər 2018-ci ilin noyabr ayında ayrıca kitab şəklində əsərin adı ilə yenidən nəşr olunmuşdur) daha ətraflı məlumat verilmişdir.

Əməkdar rəssam, Miskin Abdalın portretini yaratmış Cabbar Quliyev Miskin Abdal ilə bağlı bir möcüzəni belə danışır: «Xoşbəxtəm ki, Miskin Abdal kimi bir dahi şəxsiyyətin ilk əzəmətli portretini yaratmaq mənə nəsib oldu. Bu portreti yaratmazdan əvvəl çox düşünüb-daşındım. Nəhayət, 15 gündən sonra yuxumda Miskin Abdalı gördüm və ayılıb, gördüyüm kimi eskizini verdim və portreti yaratmağa başladım. «Miskin Abdal» mənim şah əsərimdir».

Vaxtilə Miskin Abdalın olduğu, bir müddət yaşadığı, möcüzələr göstərdiyi yerlər indiyədək onun adı ilə tanınmışdır. Tədqiqatçı Yaqub Babayev 18 aprel 1991-ci il tarixdə «Kommunist» qəzetində «Miskin Abdalın söz gülüstanı» məqaləsində bildirmişdir ki, «Miskin Abdalın bir müddət indiki Gədəbəy rayonunun ərazisində yaşadığını söyləmək olar». Miskin Abdalın adı ilə Gədəbəyin 11 kəndini əhatə edən, mərkəzi isə əvvəlki adı Qarabulaq və ya Böyük Qarabulaq, (red. 25.10.2011-ci il

tarixdən rəsmi adı «Miskinli») olan böyük bir oba – «Miskinli obası» adlanır. Həmin kənd «Miskinli çuxuru» adlanan coğrafi ərazinin ən böyük yaşayış sahəsidir. Bu kənd son tunc dövrünü əhatə edən Xocalı-Gədəbəy mədəniyyəti ərazisinə daxildir. Kəndin cənub-qərb hissəsini əhatə edən yüksəklikdə «Koroğlu qalası» adlandırılan müdafiə tikilisi vardır. Həmin kənddən olan məşhur şair-aşıq Miskinli Vəli, Fəzail Miskinli, məhz Miskinli obasından olduqları üçün həmin təxəllüsü götürmüşlər. Gədəbəy rayonu ilə həmsərhədd olan Şəmkir rayonunda da, Şəmkir çayının sahilində Plankənd inzibati-ərazi vahidliyində Miskinli kəndi vardır.

Bundan başqa, Dağıstanın ləzgilər yaşayan ərazisində yeganə Şiə məzhəbində olan, Dağıstanın Axtı (Doqquzpara) rayonunda ən böyük yaşayış məntəqəsi olan «Miskinci» («Miskinli») kəndi də Miskin Abdalın adını daşıyır. Miskin Abdal bir müddət həmin kənddə yaşamış, çoxsaylı möcüzələr göstərmiş, kənd əhalisi Miskin Abdal sayəsində Sufizmin Səfəviyyə təriqətinə (mənbələrdə, həmçinin, Şiəlik) keçmiş, Miskin Abdalın möcüzələr göstərdiyi yerlər indi də ziyarətgah kimi onun adını daşıyır və ziyarət olunur. Tarixi mənbələrdə olan məlumatlara görə, həmin kəndin əhalisi Qacar elinin böyük icması sayılmışdır, Türk soyludur, kənd daxilində 7 yaşayış məntəqəsi (qazmalar) xüsusi müdafiə-təsərrüfat funksiyalarını yerinə yetirmişdir. Kəndin tarixi Dağıstan ərazisində müharibələrlə zəngin olmuşdur. Bu kəndin əhalisi son dərəcə igid, döyüşkən və mərd olmaqla Rusiya İmperiyasının tərkibində olduqları müddətdə dövlətin apardığı müharibələrdə rəşadətlə vuruşmuş, böyük itkilər vermiş, Rusiya İmperatoru və Cənubi Qafqazda rus ordusunun komandanlığı tərəfindən mükafat olaraq kənd əhalisinə Şalbuzdağın bütün qərb yamacları verilmiş, Samur çayının üzərindən körpü salaraq, əks tərəf əra-

ziləri istifadə etməyə icazə verilmişdir. II Dünya müharibəsində kənddən 330 nəfər döyüşlərdə iştirak etmiş, onlardan 196 nəfəri qəhrəmancasına həlak olmuşdur. Kənd çoxsaylı tarixi şəxsiyyətləri, elm adamları – alimləri ilə də məşhurdur. Ərazisində – Şalbuzdağın ətəklərində Çexi Pir, Miski Ərənlər, Mir-Süleyman Piri kimi 19 müqəddəs ziyarətgah olması Şalbuzdağa «Şeyx» statusu vermiş, həmin ziyarətgahların olduğu yaşayış məntəqəsi isə «Miskidin çkyar» adını almışdır. Son dərəcə maraqlı və əhəmiyyətli faktlardır ki, Şalbuzdağa gedən yolun üstündə kəndin ətrafında İmam Əlinin abidə daşları vardır: qılıncın gücünü göstərən daş, onun namaz qıldığı daş və İmam Əlinin and içib, vəd verdiyi yer. 19 ziyarət yeri (Pir) və məscidlər, İmam Əlinin abidə yerləri, müqəddəslərin məşhur məzarları bütün müsəlmanlar üçün müqəddəs istinadlara çevrilmişdir.

Qeyd etdiyimiz kimi, Qərbi Azərbaycanın (Ermənistanın) Axta (Razdan) rayonunun Miskin kəndi də Miskin Abdalın şərəfinə o cür adlanmışdır. Qərbi Azərbaycanın Qarakilsə (Quqark) rayonunun Hollavar kəndində də əhali arasında Miskin Abdalın kəramətləri ilə bağlı çoxsaylı əhvalatlar indi də yaşamaqdadır. Həmçinin Miskin Abdalın Oğuz rayonunun Xaçmaz kəndində da bir müddət olması, 20-yə qədər tərəfdarlarının qəbirlərinin orada olmasını da irəli sürənlər vardır. Hazırda Yevlax rayonunun Yuxarı Bucaq kəndində də «Miskin Baba piri» mövcuddur. Kənd əhalisi arasında həmin babanın pir olması haqqında çoxsaylı rəvayətlər indi də dolaşmaqdadır. Göründüyü kimi, Miskin Abdalın olduğu, ocaq çatdığı, möcüzələr göstərdiyi hər yerdə onun adı müqəddəsləşmiş, xalqın ziyarətgahına çevrilmişdir.

Miskin Abdal Səfəvilər dövründə təkcə diplomatik fəaliyyəti ilə kifayətlənməyib, Azərbaycan ədəbiyyatşünaslığına çox dəyərli töhfələr verməklə, onu zənginləşdirmişdir. O, sağlığında

Azərbaycan folklorşünaslığı üçün çox qiymətli incilər sayılan, hazırkı kitaba daxil edilən «Yetim Hüseyn» və Şeyx Heydər övladlarının, o cümlədən, Şah İsmayıl Xətainin mərhum qardaşı İbrahimin şərəfinə «Aslan şah və İbrahim» dastanlarını yaratmışdır. Tədqiqatçıların qənaətinə görə, bu dastan Şeyx Heydər övladlarının taleyinə həsr olunmuş, dastanda Şah İsmayıl –Aslan şah, Miskin Abdal isə Şah İsmayılın qardaşı İbrahim kimi, Ağqoyunlu ögey dayı isə Rey padşahı – Ata Zülal şah kimi verilmişdir. Rəvayətlərə görə, Şah İsmayıl Xətai Miskin Abdala o qədər böyük məhəbbət və hörmət bəsləmişdir ki, onu qardaşı İbrahimə əvəz saymış, çox vaxt ona «qardaşım İbrahim», «şahim İbrahim» deyə xitab etmişdir. Əslində, «Şah İsmayıl dastanı»nın süjet xətti ilə «Aslan şah və İbrahim dastanı»nın süjet xətti o qədər yaxındır ki, əksər folklorşünaslar onu «əkiz qardaşlar», eyni kökdən  olan dastanlar hesab edirlər. Tanınmış folklorşünas Abbas Vəfadağlının kitabında oxuyuruq: «Miskin Abdal məktəbinin dərin köklərə malik olmasına şübhə ola bilməz. Bu məktəbin Şah İsmayıl Xətaiyə təsiri öz izlərini açıq-aydın göstərir. Şah İsmayılın Miskin Abdala hüsn-rəğbətinin səbəbi də bu keyfiyyətlərdən irəli gəlmişdir.»

Miskin Abdalın özünün barəsində isə hazırkı kitaba daxil edilən, Miskin Abdalın sağlığında və ya vəfatından sonra, əsasən onun öz şeirləri əsasında sufi aşiqləri tərəfindən yaradılmış «Miskin Abdal və Sənubər», həmçinin «Miskin Abdal və Şah İsmayıl» dastanları yaradılmışdır.

Məlumdur ki, Miskin Abdalın dövlətçilik, diplomatik, fəlsəfi, sufi təriqətçiliyi, ədəbi yaradıcılıq, hərbi-sərkərdəlik və sair çoxşaxəli fəaliyyəti içərisində, adi, bəsit mənada «aşıq mahnıları, havacatları» adlansa da, batini, daxili anlamda, yəni təsəvvüfdə sufi yolçuluğunun yüksək hal və məqamlarını simvolizə edən

– rəmzləşdirən, ruhun həmin məqam və hallara qovuşmasından, ruhi yüksəliş pillələrinin təzahürünü canlandıran, yüksək ürfani hiss məqamlarından doğan coşqu nəğmələri kimi – musiqi bəstələri – Şah İsmayıl Xətainin şərəfinə yaratdığı «Baş (Şah) divani» (Çıldır divanisi), Osmanlı sultanına həsr etdiyi «Ayaq divani» (Osmanlı divanisi), habelə digər – «İsmayılı», «Sultani», «İbrahimi», «Heydəri», «Şah qalxdı», «Şah İsmayıl gəraylısı», «Şah sarayı», «Şahsevəni», «Miskini», «Abdalı», «Sənubəri», «Hüseyni», «Dərbəndi», «Göyçə gözəlləməsi», «Göyçə çuxuru», «Göyçə döndərməsi», «Göyçə şikəstəsi», «Göyçə gülü», «Atlandırma», «Paşa köçdü», «Misri», «Oxşarı», «Yedəkləmə», «Dərvişi» və sair Haqq aşiqliyinin məqamlarını ehtiva edən sufi musiqisi, sonrakı adı ilə «aşıq havaları» onun Azərbaycan və bütövlükdə Türk musiqisinə, aşıq yaradıcılığına verdiyi misilsiz bəstəkarlıq töhfələri olmaqla, aşıq yaradıcılığını, musiqisini zirvələrə qaldırmışdır. Miskin Abdal həm də təsəvvüfdə Allaha qovuşmaqda vasitə olan sazın dördüncü pərdəsini Şah İsmayılın şərəfinə «Şah pərdə» adlandırmışdır.

Miskin Abdal şeirlərində bir çox təxəllüslərdən istifadə etmişdir ki, bunlardan, «Miskin», «Abdal», «Qulam» (Miskin Abdal, Miskin Qulam və ya sadəcə Miskin, Abdal) onun təsəvvüfdə tutduğu ən yüksək dərəcəsi, mövqeyi ilə əlaqədardır. Digər təxəllüsləri, yəni «Qərib» və «Cüda» (Qərib Hüseyn, Qərib Miskin, Cüda Miskin) təxəllüsləri isə onun həyatının böyük hissəsinin doğma Vətəni – Göyçədən uzaqlarda keçməsi səbəbindən, doğma yurdundan, elindən, obasından, doğmalarından uzaqda qalması nəticəsində Vətən niskili, həsrəti ilə yaşaması ilə bağlı olmuşdur. Miskin Abdal şeirlərinin birində «Ocaqzadə» olduğunu qeyd edir:

*«Ocaqzadə bir təb əhli nökərəm,*
*Kuyində qələndər, sinə dəftərəm,*
*Mimnən Məhəmmədəm, cimnən Cəfərəm,*
*Ləqəbi çox olan Miskin Abdalam.»*

«Ocaqzadə» termini təsəvvüf terminidir. Hərfi mənada «ocaq» içində odun, kömür yandırılan, dumanı üst bacadan çıxan xüsusi od yandırma yerinə deyilir. Məcazi olaraq, «Ocaq» – «quruluş, boy, soy, kök, dirlik, düzənlik» mənalarını verir. Ocaqzadə, bu baxımdan, «Ocaq oğlu» deməkdir. Sufi cərəyanı olan «Ələvilər»də «Dədə» deyilən mürşidin Seyyid nəslindən gəlməsi, yəni Məhəmməd Peyğəmbərin, onun nəvəsi Hüseynin nəslindən olması şərt sayılmışdır. Onlara görə, Bəktaşi ənənəsinə girmiş, Sarı Saltuq, Pir Sultan Abdal və sair də seyyiddirlər. Onların soyundan gələn Dədələr də o Ocaqdandır. Buna görə də Ələvilərdə «Dədə»lərə «Ocaqzadə» deyilmişdir, hazırda da belədir. Ələvilər də bu Ocaqlardan birinin talibi – tələbəsi sayılırlar. Bu Ocağa mənsub olanlar da bir başqa Ocağı «Pir» adlandırırlar. «Ocaq» sözü «Bəktaşi» cərəyanında da istifadə edilmişdir. Bəktaşi təkkələrində meydan odalarında (Göyçənin Sarıyaqub kənd orta məktəbində məhz «müəllimlərin oturduğu» otağa – «Müəllimlər odası» deyilirdi) qiblənin olduğu yerdəki Ocağı nəzərdə tutmuşdur. Ocaq olmayan meydandakı guşənin biri ocaq halına salınırdı. Ocağın bir tərəfində Seyyid Əli Sultan postu (məqamı), digər tərəfində Xorasan postu (məqamı) olurdu. Miskin Abdalın şeirində özünün təsəvvüf anlayışı kimi «Ocaqzadə» olması ilə bağlı misra, həm onun Seyyid olması – İmam Hüseynin nəslindən olması, həm də, «Qırxlar piri», «Qırxlar ocağı»nın nümayəndəsi olduğunu göstərən bir anlayışdır.

1524-cü ildə Şah İsmayılın ölümü Miskin Abdalı bərk sarsıdır. O, sarayla biryolluq vidalaşaraq doğma Göyçəsinə, Zərgərli (Sarıyaqub) kəndinə qayıdır. Burada məktəb açıb, maarifçilik işləri ilə məşğul olur, xalqının övladlarının elm, təhsil alması qayğısına qalır. Onun Sarıyaqubda açdığı ilk məktəb Göyçənin elm, irfan və sənət dünyasında qazandığı bütün sonrakı uğurlarda çox mühüm və həlledici rol oynamışdır.

Miskin Abdal, təxminən 1535-ci ildə 105 yaşında dünyasını dəyişir, Zərgərli (Sarıyaqub) kənd qəbristanlığında öz ulularının yanında hörmətlə dəfn olunur. Özündən sonra Zərgərli (Sarıyaqub) kəndində Miskin Abdalın adı ilə iki tayfa: «Şadmanlı» – oğul və «Ocaqlı» – qız tayfaları qalır. «Şadmanlı» tayfası, eyni zamanda «Məşədihasanlı», «Yaqublu», «Abdullalı» və «Məşədi Qədimli» qollarından – nəsillərindən ibarətdir. Miskin Abdal vəfatından əvvəl, oğlu Şadmanın vaxtilə 10 quldurு öldürdüyünə görə, hər bir halda «qan» etdiyini bildirərək, özündən sonra əşya və sənədlərinin qorunub-saxlanılmasını paklıq, təmizlik mücəssiməsi sayılan qızı Məleykəyə tapşırır və bu barədə oğlu Şadmana vəsiyyət edir, Şadman atasının vəsiyyətinə əməl edir.

Sarıyaqub kəndində hamıya məlum olan fakt idi ki, Miskin Abdalın qızı Məleykə həmin kənddə yaşayan əmisi oğlu ilə evlənmişdir. Zərgərli (Sarıyaqub) kəndində 1988-ci ilin məlum hadisələrinə qədər də Miskin Abdalın oğlu Şadman və qızı Məleykənin törəmələri, yəni hər iki – nəslinin ata evləri qonşuluqda yerləşməklə ailələr də qonşuluqda yaşamışlar. Miskin Abdal və oğlu Şadmanın yaşadığı ev 1988-ci ilədək Şadmanın nəslinin tanınmış nümayəndəsi Tofiq Hüseynzadənin ailəsi tərəfindən «Ev damı» adı ilə qorunub saxlanılırdı və zəruri əşyaların saxlanılması məqsədilə istifadə olunurdu. Həmin «Ev

damı»nın yanında Tofiq Hüseynzadənin atası Məhəmməd tərəfindən ona bitişik tikilmiş müasir evdə də Tofiq Hüseynzadənin ailəsi 1988-ci ilin dekabr ayınadək yaşamışdır.

Qeyd etdiyimiz kimi, Miskin Abdalın vəfatından sonra yeganə oğlu Şadman, atasının vəsiyyətinə uyğun olaraq atasından qalan dəyərli əşya və sənədləri qorunub-saxlanılması üçün bacısı Məleykəyə (həm də onun həyat yoldaşı olan əmisi oğluna) verir. Bu səbəbdən ona məxsus əşya və sənədlər indiyədək «Miskin ocağı» adı ilə qorunduğu «Ocaqlı» tayfasına məxsus, Miskin Abdalın qız nəslindən – Məleykədən olan törəmələrində saxlanılır və «Miskin ocağı» kimi ziyarət edilir. Bununla bağlı baş vermiş, dildən-dilə keçib, bu günədək xalqın yadaşında qalan çox maraqlı möcüzə faktı – Şadmanın «Ocağ»ı bacısına verərkən atasının burum əsasının evdə qalması, qalan əşya və sənədləri verməsi, həmin gecə «Ocaq»dakı əşya və sənədlərin qeybdən Məleykənin evindən, taxçada qoyduğu yerdən qeyb olması, yəni Şadmanın evinə qayıtması, Şadmanın «Ocağ»ı qaytarsa da, yenə də bir neçə gün həmin halın təkrarlanması, sonradan, Şadmanın yuxusuna atası Miskin Abdalın girməsi, Şadmana, evində atasından yadigar saxladığı, «harma»ya taxdığı burum əsasını da həmin «Ocağ»ın içərisinə qoyub, bacısına qaytarmasını bildirməsi və Şadmanın onun sözlərinə əməl edərək, əsasını «Ocağ»ın içinə qoyub, bacısına verməsi, bundan sonra bir daha «Ocağ»ın geri qayıtmamasına dair rəvayət barədə Şadmanın nəslinin tanınmış nümayəndəsi Tofiq Hüseynzadənin «Səfəvilərin böyük övliyası – Miskin Abdal» (Bakı, 2005) kitabında ətraflı məlumat verilmiş, onun «Şadman» poemasında da bu fakt qüdrətlə nəzmə çəkilmişdir.

Bundan sonra Miskin Abdalın oğul nəsli Şadmanlı, qızı Məleykənin nəsli isə Miskin Abdala məxsus əşya və sənədlərin saxlanıldığı, xalqın ziyarətinə çevrilmiş «Miskin Ocağı» kimi

«Ocaqlı» tayfası adlanmışdır. İndinin özündə də həmin nəslin nümayəndələri «Şadmanlı» və «Ocaqlı» tayfaları kimi tanınır.

Miskin Abdal «Dünya səndə nəyim qaldı» adlı çox məşhur şeirində bu barədə deyir:

*«Ərşə-gürşə bəlli əslim,*
*Yaradana ollam təslim,*
*Adla-sanla olan nəslim,*
*Bir oğlum, bir qızım qaldı.*

*Bir şəcərəm, bir kəşkülüm,*
*Gur ocağım, odum, külüm,*
*Yığın-yığın varım, mülküm,*
*Al qumaşım, bezim qaldı».*

1988-ci ilin məlum hadisələrindən sonra tarixi Azərbaycan torpaqlarında yaradılmış «Ermənistan» adlanan qondarma dövlətin apardığı soyqırım siyasəti nəticəsində Azərbaycanlılar tarixi yurdlarından növbəti dəfə kütləvi surətdə qovuldu. Kənd əhalisi kimi, Miskin Abdalın qız nəslindən olan həmin ailə də Goranboy rayonunun Qaradağlı kəndində məskunlaşdı. Miskin Abdala məxsus çox dəyərli tarixi əşya və sənədlər, həmçinin 1515-ci ildə Səfəvilər şahı I Şah İsmayıl Xətai tərəfindən Miskin Abdala verilmiş, «Ey mömin insanlar, Miskin Abdal mötəbər şəxsdir, ona sidq ürəklə inanın, nə mətləbiniz varsa ondan diləyin!» məzmunlu fərman da orada saxlanılır və qəlbi Allaha imanla dolu insanlar tərəfindən tarixi-dini abidə kimi ziyarət edilir.

Miskin Abdalın «Ocağındakı» əşyalar və sənədlər bunlardır: 1515-ci ildə Şah İsmayıl Xətai tərəfindən Miskin Abdalın adına verilmiş fərman, üzərində ay və səkkizguşəli ulduz təsviri olan möhür daşı, «Haçadil» atının bədnəzər duası, əl əsası, canamazı,

qələmdanı və qələmləri, çuxası, sənədləri saxlamaq üçün taxta mücrü, müxtəlif tarixi və adi sənədlər, sənədlərin Səfəviyyə təsdiqləməsi, xörək yediyi taxta qab, ağacdan düzəldilmiş kiçik təhnə, İrəvan xanlığı qazisinin şəhadətnaməsi, «Qurani-Kərim»dən müxtəlif xətt üslubları ilə yazılmış dualar, müxtəlif zamanlarda Məkkədən, Mədinədən və Məşhəddən qiymətli və əziz xatirə kimi gətirilən müxtəlif dini hədiyyələr və digər müxtəlif əşyalar.

Miskin Abdalın həyatı və yaradıcılığı haqqında ilk kitab Azərbaycan Milli Elmlər Akademiyasının Folklor İnstitutunun sabiq direktoru, filologiya elmləri doktoru, professor Hüseyn İsmayılovun 2001-ci ildə Bakı şəhərində Azərbaycan Milli Elmlər Akademiyasının Nizami adına Ədəbiyyat İnstitutunun Elmi Şurasının qərarı ilə nəşr olunmuş «Miskin Abdal» kitabıdır.

Həmin kitabın nəşrindən sonra Miskin Abdalın oğlu Şadmanın nəslinin tanınmış nümayəndəsi, şair, publisist, jurnalist, tədqiqatçı-folklorşünas Tofiq Hüseynzadənin (1946-2006) 2005-ci ildə «Səfəvilərin böyük övliyası – Miskin Abdal» kitabı işıq üzü görmüşdür.

Tofiq Hüseynzadənin 2005-2006-cı illərdə qələmə aldığı «Miskin Abdal – Qeyb Ərəni, Təsəvvüf Piri» elmi-tədqiqat əsəri 2018-ci ilin mart ayında nəşr olunmuş 3 cildlik «Xəyal cığırı» şeirlər kitabına daxil edilmiş, həmçinin 2018-ci ilin noyabr ayında ayrıca kitab şəklində «Miskin Abdal – Qeyb Ərəni, Təsəvvüf Piri» adı ilə nəşr olunmuşdur.

Tofiq Hüseynzadənin üç cildlik «Xəyal cığırı» kitabının 3-cü cildinə daxil edilmiş, 2018-ci ilin noyabr ayında ayrıca kitab kimi nəşr edilmiş «Miskin Abdal – Qeyb Ərəni, Təsəvvüf Piri» elmi-tədqiqat əsəri təkcə ən yüksək sufi məqamları, mərtəbələri və mərhələlərini simvolizə edən «Miskin» və «Abdal» kateqoriyalarının ədəbiyyatşünaslığımızda ilk dəfə son dərəcə dərin və əhatəli

tədqiqatı ilə məhdudlaşmayıb, tarixi Azərbaycan torpaqlarının coğrafiyası, Azərbaycan ərazilərinin insanlığın ilk məskəni olması, bütün xalqların, məhz bu ərazidən kənar ərazilərə yayılmaları, Azərbaycan xalqının genezisi, təşəkkülü, «Azərbaycan» adının yaranması və sair əhəmiyyətli mövzularla bağlı tarixi-elmi cəhətdən tamamilə yeni, mütərəqqi, müfəssəl, mükəmməl, fundamental konsepsiya təqdim edən inqilabi elmi-tədqiqat əsəridir.

2018-ci ilin noyabr ayında digər bir kitab – Azərbaycan Yazıçılar Birliyinin üzvü, şair-publisist, filoloq, tədqiqatçı-folklorşünas Niftalı Göyçəlinin «Miskin Abdal və Səfəvilər» kitabı işıq üzü görmüşdür.

Sadalanan nəşrlərdə əsaslı elmi-tarixi mənbələrə istinad edilməklə Miskin Abdalın həyatı, çoxşaxəli fəaliyyəti, zəngin yaradıcılığı, nəsil şəcərəsi barədə ətraflı, dolğun və dəqiq məlumatlar verilmişdir.

Azərbaycan Milli Elmlər Akademiyasının Folklor İnstitutunun Elmi Şurasının 14.12.2018-ci il tarixli (protokol №7) qərarı ilə nəşr olunan bu kitabda Miskin Abdalın zəngin ədəbi yaradıcılığı – şeirləri və dastanları (özünün yaratdığı və barəsində yaradılmış) toplanmışdır.

**Mahmud Allahmanlı**
***(filologiya elmləri doktoru, professor,***
***B.Çobanzadə adına Ukrayna Respublikası***
***mükafatı laureatı)***



**Miskin Abdal**
**(Tofiq Hüseynzadənin ulu babası)**
**(1430 – 1535)**


Miskin Abdalın soykökü
XIII əsr
Yaqub
İbrahim
İsmayıl
Yaqub Şeyx Səfiəddinlə silahdaş imiş
XIV əsr
Əli
Cəfər
Məhəmməd
XV əsr
Miskin Abdal (Hüseyn)
Şadman
XVI əsr
Qənbər
Yağnalı
Yaqub
XVII əsr
Hüseyn
İsmayıl
Məhəmməd
XVIII əsr
Yafəs
Hacı Mehdi
Kərbəlayı Qənbər
XIX əsr
Məşədi Hasan
Hüseyn
Paşa
XX əsr
Məhəmməd
Tofiq
Mehdi
XXI əsr
Şadman



**Qədim Göyçə mahalında Basarkeçər rayonunun Sarıyaqub kəndində Miskin Abdalın və yeganə oğlu Şadmanın yaşadığı evin yerində tikilmiş, Şadmanın nəslindən olan Tofiq Hüseynzadənin yaşadığı ev (foto - 1986)**

**I Şah İsmayıl Xətai tərəfindən Miskin Abdalın adına verilmiş 1515-ci il tarixli fərman**



**Fərmanın məzmunu: «Ey mömin insanlar, Miskin Abdal mötəbər şəxsdir, ona sidq ürəklə inanın, nə mətləbiniz varsa ondan diləyin!»**



**Şah İsmayıl Xətainin 1515-ci ildə Miskin Abdalın adına verdiyi fərman 1820-ci ildə Göyçədəki Çaxırlı kənd kəndxudası tərəfindən yenidən təsdiq edilmişdir.**

# MİSKİN ABDALIN
# ŞEİRLƏRİ

# G Ə R A Y L I L A R

## BİLİR ZƏVVAR

Canım indi altıdadır,
Yeddiyə də vədəsi var.
Yeddidən başladım yolu,
Altıda tutmuşam qərar.

Pənci-əla zatı beşəm,
Qeybi-məkana yetmişəm.
Haqqdan səda eşitmişəm,
Cismim beşdə qalıb naçar.

Miskin Abdal etməz təkvir,
İzin yoxsa, açammaz sir.
Hər əmələ mizan-tədbir
Olacaqdır, bilir zəvvar.

# DAĞLAR

Süsən-sünbül, bənövşəli,
Allı-güllü bizim dağlar.
Toy-düyündə, şenniklərdə,
Elatda var izim, dağlar.

İgidlərin çapar gəzər,
Yar yolunda dərdə dözər.
Sevənləri həsrət üzər,
Cəfadır, bu, dözüm, dağlar.

Hüseynin də bir yarı var,
Buta verən yolun açar,
Gərçi, uzaq məkan, diyar,
El-obalar gəzim, dağlar.

# DÜNYA, SƏNDƏ NƏYİM QALDI...

Eşit, deyim, dünya səndə,
Ayım, ilim, yazım qaldı.
Qövr eləyir söz sinəmdə,
Dil-dil ötən sazım qaldı.

Yar sevmişdim, yarım getdi,
Var yığmışdım, varım getdi,
Eşqim, etibarım getdi,
Ahım, ünüm, sızım qaldı.

Qayaları sökdürərdim,
Zərdən saray tikdirərdim,
Yağıları çökdürərdim,
Məndən təpər, dözüm qaldı.

Ərşə-gürşə bəlli əslim,
Yaradana ollam təslim,
Adla, sanla olan nəslim,
Bir oğlum, bir qızım qaldı.

Hər nə varsa, hədər imiş,
Hər şey gəldi-gedər imiş,
Ölüm yaman betər imiş,
Yol-ərkanım, izim qaldı.

Şadman könlüm tari-mardır,
Şanda balım zəhri-mardır,
Günüm-gecəm ahu-zardır,
Şirin-şirin sözüm qaldı.

Yaşayan kim, ölən kimdir,
Ağlayan kim, gülən kimdir,
Gedən gedir, gələn kimdir,
Nə mizrabım, nə sim qaldı.

Yoxdur daha Şahənşahım,
Ərşə bülənd oldu ahım,
Adım, sanım, qibləgahım,
Haqq çağıran səsim qaldı.

Telli saza mizrab vurdum,
Məclislərdə dastan qurdum,
Neçə-neçə aşıq yordum,
Sözüm düzüm-düzüm qaldı.

Bir şəcərəm, bir kəşkülüm,
Gur ocağım, odum, külüm,
Yığın-yığın varım, mülküm,
Al-qumaşım, bezim qaldı.

Dünya puçdu, puçdu dünya,
Dünya heçdi, heçdi dünya,
Abdal, yaman keçdi dünya,
Yaşamaqda gözüm qaldı.

# QOCALIRAM

Ay dolanır, il ötüşür,
Yavaş-yavaş qocalıram.
Cavanlığım yada düşür,
Əriyir yaş, qocalıram.

Nə qədər həmdəmim vardı,
İndi mənlə qalan yardı.
Şəvə kimi telim vardı,
Çallaşır baş, qocalıram.

Heyıf, ömrüm getdi bada,
Əlim çatmır dosta, yada,
"Sözüm keçmir" arvada da,
Bişməyir aş, qocalıram.

Zimistandır hər gələn yaz,
Dünya uzun, ömür nə az,
Dilimdə söz, əlimdə saz,
Gözümdə yaş qocalıram.

Miskin Abdal – bəlli adım,
Pərvazlanmır qol-qanadım,
Qayaları oynadardım,
Tərpənmir daş, qocalıram.

# NƏDİR?

Tərs düşüb fələyin işi,
Lil basan arxdımı, nədir?
Fani dünyanın gərdişi,
Dolanan çarxdımı, nədir?

Qalanıb küfrün kürəsi,
Yanırsan gözüm görəsi,
Tutulub yolun yörəsi,
Bir bilən yoxdurmu, nədir?

Miskin Abdal, işin xata,
Ünün gedib, ərşə çata,
On iki ay müdam yata,
Görünən baxtdırmı, nədir?

# DÖNƏR

Vətən deyib, ağlayanın,
Göz yaşları selə dönər.
Axıb gedər gecə-gündüz,
Bir məkanda gölə dönər.

Yolu yorğun dağ aşanın,
Axırı yox, şöhrət-şanın,
Qürbət eldə yaşayanın,
Bir həftəsi ilə dönər.

Bir yandadır hay-haraylar,
Bir yandadır sonsuz vaylar,
Çil-çıraqlı çox saraylar,
Yanıb-yanıb, külə dönər.

Mayasıdır Haqqdan halal,
Hər kəlməsi sirrli sual,
Qərib olan Miskin Abdal,
Bəlkə, bir gün elə dönər.

# BAŞIN

Namərd ilə yoldaş olma,
Uzun ağrı çəkər başın,
Halallıqla ərsəyə çat,
Daş qalalar sökər başın.

Xain çıxma Yaradana,
Qibləgahdır ata-ana.
Arxalanma bəyə, xana,
Qoy sağ olsun nökər başın.

Haqqdan istə bəxtı-iqbal,
Yaradanı yadına sal,
Söz gövhərdir, Miskin Abdal,
Saxla, dürrdür, tökər başın.

# DÜŞƏRSƏN

İnsan oğlu, kələk qurma,
Kələyə, fəndə düşərsən.
Nahaq yerə üzə durma,
Zülmündən anda düşərsən.

Hər adamla olma tanış,
Yaz gününü eyləyər qış.
Fikir eylə, sonra danış,
Qəfil kəməndə düşərsən.

Miskin Abdal, xəbərdar ol,
Yoldaşına düz ilqar ol,
Yaman günə şükürdar ol,
Dönüb, hasanda düşərsən.

# FƏLƏK

Yıxdın könül şəhrini,
Dad fələk, aman fələk!
İçdim hicran zəhrini,
Zülm etdin yaman, fələk!

Qara geyibdir sazım,
Nə oxuyum, nə yazım?..
Nakam qaldı murazım,
Vermədin aman, fələk!

Zülm olmaz beyləsindən,
Qoru şər hiyləsindən,
Abdalın naləsindən
Bir diksin, oyan fələk!

# ALLAH, ÖLÜMÜN HAQQDIR!

Bu dünya, o dünya var,
Allah, ölümün haqqdır!
Bir dirilik suyu var,
Allah, ölümün haqqdır!

Axırın puçdu, dünya,
Var ikən heçdi dünya.
Hey gəldi, keçdi dünya,
Allah, ölümün haqqdır!

Abdal, yastıq daş olar,
Üst torpağın yaş olar,
Mələklər yoldaş olar,
Allah, ölümün haqqdır!

# GEDİN, DEYİN LƏLƏ BƏYƏ

Gedin, deyin Lələ bəyə,
Bu naleyi-əfqanımı.
Qanlı fələk zülm elədi,
Ayırdı candan canımı.

Mən bu bağa girərəmmi?
Gül dəstəsin hörərəmmi?
Ya Rəbb, bir də görərəmmi,
Öz mürşidi-sultanımı?

Miskin Abdal, bu nə kələk?
Dövran qoymaz bizi gülək,
Yerə vurdu məni fələk,
Ucaltdıqca düşmanımı.

# YARIM

Dodaqları gül qönçəsi,
Yanaqları lala yarım.
Kölgən gələndə gün qaçar,
Sən bəlasan, bəla, yarım.

Tanrı səni var edibdir,
Aşiqini xar edibdir,
Fələkləri kar edibdir,
Çəkdiyim ah-nala, yarım.

Miskinin söhbət-sözüsən,
Cümlə gözəllər gözüsən,
''Ağrı dağı''n nərgizisən,
Bürünmüsən şala, yarım.

# BU DA MƏNİ

Ay dilbilməz, neyləmişəm,
Yandırırsan oda məni.
Cəlladsansa, al xəncəri,
Gecə-gündüz buda məni.

Bu eşq mənə qış gətirdi,
Başıma min iş gətirdi,
Bir tacirə tuş gətirdi,
Ucuz satdı yada məni.

Qoxlamadım qızılgülü,
Aldı məni qürbət eli,
Həliмənin fitnə-feli,
Saldı eldən cüda məni.

Hüseynəm Abdal olmuşam,
Dərd əlindən saralmışam.
Allah, nə günə qalmışam,
Bəyənməyir bu da məni.

# XOŞ GƏLDİN

Vədə verdiyin ilqara,
Oğul, İsmayıl, xoş gəldin!
Göyçə adlı bu diyara,
Oğul, İsmayıl, xoş gəldin!

Bura gələn bir də gələr,
Qəm çəkənin üzü gülər,
Pişvazına çıxıb ellər,
Oğul, İsmayıl, xoş gəldin!

Sazın-sözün sirri burda,
İgid olan qalmaz darda,
Sənə sadiq olan yurda,
Oğul, İsmayıl, xoş gəldin!

Bu günümüz taydır ilə,
Toy-bayramdır bizim elə,
Lalə, nərgiz gəlib dilə,
Oğul, İsmayıl, xoş gəldin!

Bəxt yazılıb hər alına,
Bax Abdalın əhvalına,
Gözəlliklər mahalına,
Oğul, İsmayıl, xoş gəldin!

## AĞRI DAĞI

Dayanıbdır mətin, qoşa,
Şah vüqarlı Ağrı dağı.
Bir qüdrətdir başdan-başa,
Bar-baharlı Ağrı dağı.

Başda Nuhun gəmisi var,
Ayağında zəmisi var.
Tarixində qan izi var,
Boran-qarlı Ağrı dağı.

Mövlam verib sirri pünhan,
Səcdəsinə gəlir cahan,
Abdal kimi sürür dövran,
Etibarlı Ağrı dağı.

# İSMAYILA

Bu tac, bu taxt qılsın vəfa,
Şeyx oğlu Şah İsmayıla,
Xızır Nəbi, ol Mustafa
Olsun pənah İsmayıla.

Haqqdan yerə gəlir bir səs:
Bəxtin üzü dönməsin tərs.
Qır qazana düşər nakəs,
Etsə günah İsmayıla.

Abdal telə mizrab vurar,
Gün gələr ki, dastan qurar,
Yerdə Əli kömək durar,
Göydə Allah İsmayıla.

# TAPINMIŞAM

Anadan pür kamal olub,
Şəriətə tapınmışam.
Din yolunda Abdal olub,
Təriqətə tapınmışam.

Miskin günüm gəlməz saya,
Qismətimdir ismət, həya,
Qulluq edib tək Xudaya,
Mərifətə tapınmışam.

Miskin Abdal Tanrı qulu,
Qəlbindədir Haqqın yolu,
Ulalardan daha ulu,
Həqiqətə tapınmışam.

# VAR

*(mədhiyyə)*

Şükür Haqqın dərgahına
Mətləbimi soranım var.
Sirrli qüdrət Heydər kimi
Köməyimdə duranım var.

Əbu-David pəhləvanı,
Yerə vurdu, çıxdı canı.
Kəşt eyləyən asimanı,
Div qolunu buranım var.

Mətləbini Haqqdan alan,
Abdal olmaz darda qalan.
Müsəlmana qanun olan,
Bir müqəddəs Quranım var.

# İMAM RZA
(mərsiyyə)

Ahularla zalım olan,
Qara bulud kimi dolan,
Xorasanda şəhid olan,
Qərib olan məzlum Rza,
Şəhid olan imam Rza.

Zəhər ilə gül tək solan,
Bacı deyib, darda qalan,
Vay, ciyərləri doğranan,
Qərib olan məzlum Rza,
Şəhid olan imam Rza.

Ölsə, görən, kim ağlayar?
Bacı, gözün kim bağlayar?
De, yasını kim saxlayar?
Qərib olan məzlum Rza,
Şəhid olan imam Rza.

Məlum ona verdi zəhər,
Kimsəsi yox, qərib şəhər.
Bacısına verin xəbər.
Qərib olan məzlum Rza,
Şəhid olan imam Rza.

Badi-sələt, bacı gəlmədi,
Başın dizi üstə olmadı.
Öldü didarı görmədi.
Qərib olan məzlum Rza,
Şəhid olan imam Rza.

Babasının kövsər-saqi,
Qərib Hüseyni[1] baqi,
Niyə başa gəlməz taqı?
Qərib olan məzlum Rza,
Şəhid olan imam Rza.

Qərib Miskin sənə qurban,
Niyə belə gəldi dövran?
Çoxdur mənim qəmim, naləm.
Qərib olan məzlum Rza,
Şəhid olan imam Rza.

(1- Hüseyn – Miskin Abdaldır)

# Q O Ş M A L A R

## YA ƏLİ

Ələstü-Rəbbi cəm xitab olanda,
Xub qailəm o adına, ya Əli.
Sənin pənahına iman gətirdim,
Bərqəraram o sevdana, ya Əli.

O, ”zey”, ”fey” adına, o nuri səfa,
Yetişsin şəninə hər quli-kəfa,
Varlığın mənası dini-Musdafa,
Sərxeyli-Karvanın Cüda, ya Əli.

Fəthi şəhri - Zərrin, qatili-Salsal,
Mürşidi - Cəbrayıl, şahi-beyzaval,
Qəşəmşəm, Qəzənfər, Şiri-Zülcəlal,
Müsəmmasan bir Minada, ya Əli.

Əzrayıl çəngəlin cana çalanda,
Ruhlar pərvaz olub, cəsəd qalanda,
Üz xakə döşənib, zəlil olanda,
Özün yetiş o fəryada, ya Əli.

Məhşər günü özün tutarsan camı,
Tutmuş ətəyindən nikü-bad, hamı,
Seçmə muxsullardan Miskin Qulamı,
Kərəm et kövsərdən badə, ya Əli.

# UNUTMA

Aşıq, kəşt eləyib ağır elləri,
El içində namus, arı unutma.
Yaxşı dolan, təmiz saxla adını,
Dost yanında etibarı unutma.

Halal mala haram qatmaq nə lazım?
Hədər yerə kaman atmaq nə lazım?
Yar-yoldaşa yalan satmaq nə lazım?
Əhdi-peyman, düz ilqarı unutma.

Miskin Abdal, bir qonaqsan dünyada,
Könlün bir dəryadır, ürəyin ada,
İstəsən ki, yetişəsən murada,
Yaş torpağı, dar məzarı unutma.

# DAĞLAR

Məğribdən məşriqə səf çəkib durub,
Qüdrətdən çəkilib baş-başa dağlar.
İtaət boynuna həmayıl vurub,
Misli-pəsənd, xotkar, xan, paşa, dağlar.

Baxıb hökmü yek, dal dürey dükafa,
Gah kükrəyib, gah gəlirsən insafa,
Dey peykarə çəkib, bəyazil əffafə,
Pərvərdin geydirir qumaşa, dağlar.

Ağ çeşmən sərindən car eylər seli,
Yaşıl tirmə qurşar adaca beli,
Zabitə kölgəsi, Dağıstan yeli,
Sədrin səfasıdır həmişə, dağlar.

Nəhs illərdən satın aldın nəhs günü,
Çağırdın dumanı, tökdün çiskini,
Gözü yaşlı qoydun Cüda Miskini,
Eylə gülə-gülə tamaşa, dağlar.

# A DAĞLAR

Xudahafiz deyək, gəl halallaşaq,
Daha ayrılıqdı, köçdü, a dağlar.
Soldu gül, nərgizin döndü xəzələ,
Pozuldu işrətin, keçdi, a dağlar

Zənbur sızıldaşır şan üstə bala,
Aldadıb çoxların qoyubsan dala,
Bənd olma dünyada dövlətə, mala,
Axır aqibətin puçdu, a dağlar.

Keçdi novbaharın, yazın qış oldu,
Çərx hərləndi, ömür qəmə tuş oldu,
Miskin Abdal, xəyalların puç oldu,
Dolanıb güzarım düşdü, a dağlar.

# DAĞLARIN

Adəmdən cavandır, Nuhdan qocadır,
Bir sirrdir, bilinməz yaşı dağların.
Tufana əyilməz, yada basılmaz,
Həmişə qar olar başı dağların.

Əhvalı necədir – bir səyyaddan sor,
Quşa cələ olur, ahulara tor,
”Can” desən – ”can” deyər, ”çor” söyləsən – ”çor”,
Səs alar, səs verər guşu dağların.

Qüdrətdən yetibdir uca barata,
Sinəsi açıqdır elə, elata,
Mən Cüda Miskinəm, başımda xata,
Kəsib yollarımı qışı dağların.

# A YAZ AYLARI

Zimistan qəhridir, maldan ötəri,
Həsrət çəkir gələ, a yaz ayları,
Yay, payız dolandı, dağlar ağardı,
Yenə də yetişdi, ayaz ayları.

Səndə olar dağ, dərələr, göy çəmən,
Baş verər qərənfil, nərgiz, yasəmən,
Gəzərəm həvəslə, alsam əsa mən,
Könül coşa gələr, a yaz ayları.

Miskin Abdal, ömür keçdi heyinən,
Bu mətləbi ”Qocadağ”a deyinən,
Öləndə məzarım gül-çiçəyinən,
Üstümü bəzərlər, a yaz ayları.

# YAR DEYƏ-DEYƏ

Aləmi-röyada bir bağça saldım,
Gülündən qoxladım yar deyə-deyə.
Çəkdim hasarını alovdan, oddan,
Dolanıb, yoxladım yar deyə-deyə.

Nakam Sənubərim birdən necoldu?!
Bəxtin üzü döndü, niyə kəc oldu?
Bu eşq bay olmadı, axır heç odu,
Canda can saxladım yar deyə-deyə.

Bir də görünmədi bulaq başında,
Öldü qar-boranlı ilin qışında.
Axtardım mən onu çeşmim yaşında,
Sellər tək çağladım yar deyə-deyə.

Sazım qara geydi, çala bilmədim,
Dərdim canda yandı, gülə bilmədim,
Ölmək istəsəm də, ölə bilmədim,
Könüllər dağladım yar deyə-deyə.

Sənubərin dərdi əydi qəddimi,
Çağırdım köməyə, çatsın, cəddimi,
Ağladım, sızladım, aşdım həddimi,
Qaralar bağladım yar deyə-deyə.

Abdalam, itirdim din-imanımı.
Dərbədər eylədim var gümanımı,
Göylərə yetirdim ah-amanımı,
Hər yanda ağladım yar deyə-deyə.

# GEDƏR

Guşə-guşə yanıb, nara yaxıldım,
Cismim od-atəşə qalanıb gedər,
İmtahan eyləyər könlüm şəhrini,
Eşqi-Haqqdan qeyri talanıb gedər.

Dərviş olan getməz fitnə-feliynən,
Yandırar şamını o, öz əliynən,
Yalan peymanıynan, haça diliynən,
Könül yar yolunda allanıb gedər.

Qeylü-qaldır səhər-axşam əhvalım,
Tor görür gözlərim, qarışır halım,
Qanlı çeşmi yazıq Miskin Abdalın,
Coşğun çaya nisbət sellənib gedər.

# MƏNİ

Gecə yuxum yoxdur, gündüz qərarım,
Rüzgarım qoyubdur adada məni.
Tərəqqi dağından uçubdur tarım,
Fələk niyə saldı bu dada məni?!

Doğru söz deməyə çox utanıram,
Çünki, zəmanəni bir az qanıram,
Elə alovlanıb, elə yanıram,
Söndürə bilməzlər suda da məni.

Mən Miskin Abdalam – dustaği-dərdəm,
Görmədim baharı ömrümdə bir dəm.
Ədalət yolunda elə bir mərdəm,
Qorxmaram əjdaha uda da məni.

# QALDI

İnsan oğlu, qeybət etdin yoldaşdan,
Kəsdin haqq-salamı, harası qaldı?
Söz yetişdi sahibinə, utandın,
Axır, sənə üzün qarası qaldı.

Pislikdən nə çıxar, söylə, ay insan,
Çıxmaz yaddan, yüz il keçsə aradan.
Tutaq ki, bir insan çıxdı sıradan,
Kimə zər-zibası, xarası qaldı?

Miskin Abdal, bəsdir daha bu qədər,
Bülbül nəğmə deyər, bayquşlar ötər.
Xəncərdən, bıçaqdan, qılıncdan betər,
Sinəmdə pis sözün yarası qaldı.

# PİR İDİ

Asta gedən bu gözəllər sultanı,
Yerişindən məlum olur huridi.
Deyin, bəsdir, mənim xəstə canımı,
Siyah zülfün zəncirində sürüdü.

Şah hüsnünün sütunundan asıldım,
Çıldır-çıldır dörd məqama yazıldım,
Hicran ləşkərinə endim, basıldım,
Yan-yörəmi qurdlar-quşlar bürüdü.

Seyraquba yıxıldımı görən nər?
Aşıq sınsa sin axtarar, gor enər,
Belə dedi bu çağımı görənlər:
”Miskin Abdal bir zamanlar pir idi”.

# AĞLARAM

Dostu-mehribanım, yetiş dadıma,
Səndən qeyri yox imdadım, ağlaram.
Ah çəkib, dağlara salaram səda,
Qohum gəlməz, gülər yadım, ağlaram.

Dəstində Zülfüqar, Düldülə süvar,
Məhsəril-əcayib, bir adı Kərrar,
Müşкülə düşmüşəm, könlüm intizar,
Sən gəlməsən, ey ustadım, ağlaram.

Salma nəzərindən, salma ilahim,
Dar gündə köməyim, püştü-pənahım,
Ərşə bülənd olub fəryadı-ahım,
Abdaldır, Miskindir adım, ağlaram.

# ƏLİF-LAM

Təmiz əkilmişəm, pak doğulmuşam,
Atadan-anadan lütfi-halalam.
Dərsimi Haqq verib, ağdan almışam,
Dilimdə əzbərdir doxsan min kəlam.

Qafdan qərar tapmış, kafdan kainat,
İsmi feyli-hərfi olmuş əsli-zat,
Veydən bəna tutub, kaf-nundan nicat,
Yeydən bişərikdi, bişərikdi lam.

Əlifdən əladır, alidən ali,
Çimdən dücahandır, böyük cəlalı,
Mimdən mehribandır məddi-məalı,
Nun – hər vaxt zəmini xəlq edib tamam.

Sin şükrü sənalar, vov vahid ismə,
Hey həlim, rey rəhmi acı yel əsmə,
Zey zəlil bəndədən, sin nəzər kəsmə,
Sat sahib ixtiyar, mən həqir qulam.

Ocaqzadə bir təb əhli nökərəm,
Küyində qələndər, sinə dəftərəm,
Mimnən Məhəmmədəm, cimnən Cəfərəm,
Ləqəbi çox olan Miskin Abdalam.

# QOCALIQ

Hardan gəldi-getdi ömür bilmədim,
Baxdım ki, qapını döydü qocalıq.
Bir kərə ürəkdən deyib-gülmədim,
Qəddimi kaman tək əydi qocalıq.

Ümidim, pənahım qadir Allahım,
Dar gündə hoy edən var qibləgahım,
Pakam, Tanrım bilir yoxdur günahım,
Ağlayan, sızlayan neydi qocalıq.

Şaha baş əyməzdim, şeşpər atardım,
Sultanlar yurdunda at oynadardım,
Namərdi bazarda qul tək satardım,
Bilməm, niyə gəldi, nəydi qocalıq?

Ötübdür hay-hayım, qalıb vay-vayım,
Sananır dillərdə hər günüm, ayım,
Oxum əldən çıxıb, sökülüb yayım,
Deməz, Miskin Abdal, yeydi qocalıq.

# DÖNƏRMİ

Qadir Allah, əlim əldən uzaqdır,
Yazıq könlüm, görən, indi dinərmi?
Vaxt yetişib, ömürdə qış-sazaqdır,
Şahin könlüm yuvasına enərmi?

Elim qalıb neçə dağlar dalında,
Qismətim var, yazılıbsa alında,
Gedəcəyəm, ayaq qalsa yalın da,
Pir igidin çırağı da sönərmi?

Miskin Abdal hanı zərdən libasın?
İnsan olan unudarmı obasın?
Yada salıb ulu-ulu babasın,
Axır günü Göyçəsinə dönərmi?

# DOLANAR

”Şişpilləkən” dağların şah dağıdır,
Maralları neçə başı dolanar,
Quldur-qaçaq bu yerlərə yağıdır,
Fürsət güdər, dağı-daşı dolanar.

Ətəyində durna gözlü gölü var,
Zirvəsində dərilməmiş gülü var,
Yağılara basılmayan eli var,
Yazda yazı, qışda qışı dolanar.

Torpaqları zər yükünə yüklənib,
Könül sazı ”Şahsevən”ə köklənib,
Karvanları uzaq səmtə diklənib,
Nagah-nagah burda naşı dolanar.

Basılmazdır hər igidi, ərəni,
Biri saxlar neçə bəndi, bərəni,
Baxıb, görsə dağda çiçək dərəni,
Ürəyində can ataşı dolanar.

Doğmaları bu torpağa yad olmaz,
Qəriblərin dəhanında dad olmaz,
Qürbət eldə Miskin Abdal şad olmaz,
Gözlərində kədər yaşı dolanar.

# QOCALDIM

Yaman yerdə yaxalayıb vaxt məni,
Hey desəm də qocalmaram, qocaldım,
Yüzü keçib, silkələyir baxt məni,
Nə olsun ki, pirəm, nuram, qocaldım.

Seyyid mənəm, pay paylayan dərvişəm,
Namərdlərin xətasını görmüşəm,
İsmətimdən bir məbədgah hörmüşəm,
Sızıldayır qanlı yaram, qocaldım.

Miskin Abdal yolu Haqqın yoludur,
Ömrüm Tanrı dərgahının quludur,
Adım, sanım, halallığım uludur,
Etməmişəm bircə haram, qocaldım.

# NÖKƏRƏM

Qadir Allah qismət etdi cəfanı,
Gecə-gündüz qəm kotanı çəkərəm,
Elə bildim, qopdu Nuhun tufanı,
Bəxt şumuna dərd-sərimi əkərəm.

Kəsilməzdi əllərimin səxası,
Zərdən idi köynəyimin yaxası,
Sınaqlıdır abidlərin çuxası,
Başım ilə daş qalalar sökərəm.

Qürbət eldə yanar ömür sürənlər,
Yasa batdı bu halımı görənlər,
Yada düşsə igid ərlər, ərənlər,
Göz yaşımı sel yerinə tökərəm.

Həsrət qaldım Göyçə kimi elimə,
Əl uzatdım, əl çatmadı əlimə,
Əslim, zatım manşır olub aləmə,
Evlər yıxmaz, müdam evlər tikərəm.

Miskin Abdal, çox ağlayıb sıxtama,
Başa vurdum, nə düşübsə baxtıma,
Ömür keçib, nə qalıb ki, vaxtıma,
Haqq yolunda mən bir qulam, nökərəm.

# AĞLARAM

İki sultan əyləşdi nərgiz taxtında,
Aralığa şəmşir endi, ağlaram.
Məkas fəqan etdi dərya üzündə,
Yelkənin tərsinə döndü, ağlaram.

Nökər olan qulluq edər xanına,
Məşuqlar susadı aşiq qanına,
Cəbrayıl yetişdi Haqq məqamına,
Alışdı şahpəri, yandı, ağlaram.

Ya Rəbb, görən, kimlər yetər dadıma,
Həsrət qaldım ocağıma, oduma.
Miskinəm, ərənlər düşdü yadıma,
Didəm yaşı selə döndü, ağlaram.

# AYAQ ÜSTƏDİR

Bu gün bir bağçanın seyrinə vardım,
Bu bağın bağbanı ayaq üstədir.
Könül pərvazlandı şahı görməyə,
Seyraqub yatmayıb, ayaq üstədir.

Salam verdim, əleyk aldım dərindən,
Səda gəldi dəryalardan dərindən,
Əlim üzməm ərənlərin dərindən,
Ağam Şahi-Mərdan ayaq üstədir.

Miskinəm, qılginən inayət mənə,
Dəruləl məqamnan şəfayət mənə,
İnşallah, yetişər bəraət mənə,
Haqq özü yatmayıb, ayaq üstədir.

*(Bu şerin digər iki variantı kitabın
"Qeydlər və izahlar" bölməsində verilmişdir.)*

## OLMAZ

Sultanın fərmanı, paşa qəzəbi,
Paşam, mürvət eylə, belə kar olmaz.
Üzdü məni bu yolların əzabı,
Paşam, mürvət eylə, belə kar olmaz.

Canım qoydum mürşidimin yolunda,
Sərgərdan qalmışam Urum elində,
İslam bada gedir cəllad əlində,
Paşam, mürvət eylə, belə kar olmaz.

Cüda Miskin çəkər qəmi-möhnəti,
On iki imamdır peyğəmbərin züryəti,
Sünni, şiə – Məhəmmədin hümməti,
Paşam, mürvət eylə, belə kar olmaz.

# YETİŞ DADIMA

Əshabu-Kəhfdəki ya İmamzada,
Sən yetiş dadıma, yetiş dadıma.
Yolunda, qalmışam qövri-qəzada,
Sən yetiş dadıma, yetiş dadıma.

Kəsir yollarımı boran, qar mənim,
Qırır taqətimi ahu-zar mənim,
Ümidim, inamım Haqqa var mənim,
Sən yetiş, dadıma, yetiş dadıma.

Dolubdur ürəyim kədərlə, qəmlə,
Gəlmişəm baş-başa, dərdi-sitəmlə,
Kəbkəb itim ilə, dolu heybəmlə,
Sən yetiş dadıma, yetiş dadıma.

Abdal pak bəndədir, yoxdur günahı,
Doğma Göyçəsində çəkməsin ahı.
Çağırır sidq ilə qadir Allahı:
Sən yetiş dadıma, yetiş dadıma.

# BİRİ NƏ?

Yol gedərkən üç gözələ tuş oldum,
Ovçu könül mayıl oldu birinə.
Hər gözəldə üç nişanə gərəkdir:
Biri camal, biri kamal, biri nə?

Ay ağalar yaralıyam, yaralı,
Yar dərdindən yaralıyam, yaralı,
Üç şey var ki, bu dünyada yaralı –
Biri Aydır, biri Gündür, biri nə?

Deyər təxəbbürlər, mənim nəyimdir,
Qadir Mövlan yoxsullara kərimdir,
Miskin Abdal üç şeyində qayıldır,
Biri ilqar, biri iman, biri nə?

# BUNDAN SƏNƏ NƏ?

Aləmi palçıqdan yaradıb, yapdın,
Yapıb da neylərsən, bundan sənə nə?
Xəlq edib insanı, cahana saldın,
Salıb da neylərsən, bundan sənə nə?

Baqqalmısan, tərəzini neylərsən?
İşin, gücün yoxdur, könül teylərsən,
Qulun günahını kitab eylərsən,
Lap çıxdın sonuna, bundan sənə nə?

Bu Miskin Abdalın haqqdır sözləri,
Soldu gözəllərin gül bənizləri,
Od-alova düçar etdin bizləri,
Yıxdın qullarını, bundan sənə nə?

# AĞRI DAĞI

Qüdrətdən yaradıb yaradan səni,
Məğrur dayanıbsan sən, Ağrı dağı.
Şöhrətin tutubdur cümlə cahanı,
Məftunam hüsnünə mən, Ağrı dağı.

Başında qış olar, ətəyində yay,
Təksən bu dünyada, yoxdur sənə tay.
Qartallı qoynundan kəsməz hay-haray,
Çəkilməz başından çən, Ağrı dağı.

Başında dincəlir Nuhun gəmisi,
Tanrıya bəllidir sirrin kəlməsi.
Səni tərpədirmi eşqimin səsi,
Bir Miskin Abdala dön, Ağrı dağı.

# DEDİ

Bu gecə vayğamda gördüm Əlini,
“Səni pir sahibi görürəm”, – dedi.
Gülüb, kürəyimə vurdu əlini,
“Ömrünə bir çələng hörürəm”, – dedi.

“Allahın şiriyəm, bir bax didəmə,
Qoru din-məzhəbi, olmaz sədəmə,
Dolan bu dünyanı, yoruldum demə,
Dalında dağ kimi dururam”, – dedi.

“Sərində ağıl var, qüvvət qolunda;
Mələklər qoruyur sağı-solunda,
Seyyidsən, dərvişsən Haqqın yolunda,
Abdala Haqq payı verirəm”, – dedi.

# İSMAYIL

Sən getdin hünərlə, gəldin zəfərlə,
Qurtardın elləri yasdan, İsmayıl.
Yolların bəzənsin xalıyla, zərlə,
Adına yazılsın dastan, İsmayıl.

Sən ki getməmişdin nişana, toya,
Nərənə hay verdi hər dağ, hər qaya,
Səni qeyrətinlə bu qoca dünya,
Çəkirdi sınağa qəsdən, İsmayıl.

Demə ki, Abdalın meydanı dardır,
Qəlbinə Allahın sevgisi yardır,
Qolunda pələngin qüvvəti vardır,
Tülkü meydanında aslan İsmayıl.

# YA BİR ALLAH, YA MƏHƏMMƏD, YA ƏLİ

Bir kəlam var Yaradandan pay alıb:
”Ya bir Allah, ya Məhəmməd, ya Əli”.
Bu üç kəlmə yerdən göyə yol salıb,
Ya bir Allah, ya Məhəmməd, ya Əli.

Yerin-göyün uzaqlığı yeddi qat,
Halallıqdan yaranıbdır bu həyat.
Yaxşıların imdadına yetiş, çat,
Ya bir Allah, ya Məhəmməd, ya Əli.

Bu dünyanın dərdi çoxdur, dözülməz,
Bu dünyanın dərdi çoxdur, düzəlməz.
Nə yaxşı ki, haqq incələr üzülməz,
Ya bir Allah, ya Məhəmməd, ya Əli.

Adəm oğlu acgöz deyil, toxdu-tox,
Bu dünyanın şeytanları çoxdu-çox,
Sizdən başqa köməyimiz yoxdu-yox
Ya bir Allah, ya Məhəmməd, ya Əli.

Haqq üstündə bərqərardır asiman,
Haqq yolunun yolçusudur müsəlman.
Miskin Abdal çağırıbdır hər zaman
– Ya bir Allah, ya Məhəmməd, ya Əli.

# ŞAH DAĞLAR

Gedənləri, gələnləri əskilməz,
Mehmanları eyləməyib nəh dağlar.
Bəzirganı, sövdəgəri kəsilməz,
Bir kimsədən ummayıbdır beh dağlar.

Sinəsində yer eyləyər qonağa,
Məhəl qoymaz hər möhnətə, qınağa,
Karvanları çəkər çətin sınağa,
Yolu kəsər gah dumanlar, gah dağlar.

Buz bulağı abu-Kövsər dadlıdır,
Çal-çağırlı, doğmalıdır, yadlıdır.
Bir çeşməsi şahdan ’’Kəşkül” adlıdır.
Cənnət qoxur səhər-səhər şeh dağlar.

Şiş pilləkən, Vers dağları qoşadı,
’’Çətin dərə” çox xoş bir tamaşadı.
Qoca pir, de, görən, niyə yaşadı,
Sinəsində yuva qurar ah dağlar.

Miskin könlüm yana-yana hey coşar.
Saz götürər, nəğmə deyər, söz qoşar.
Bir gün olar Abdal Haqqa qovuşar,
Siz yaşayın, allı-güllü şah dağlar.

# GETDİ

Adəm oğlu, xəbdən oyan, bir eşit,
Neçə milyon canlar var idi, getdi.
Kim sürdü dünyada zövqü-səfanı,
Kimlər ’’oxxay” deyib, yarıdı getdi.

Gəl sənə söyləyim Əjdəri-Sandan,
Babası Carcavar, o Nərimandan,
Keykavus, İsgəndər, o Süleymandan,
Onlar da bir iqlimdar idi, getdi.

İqlimin şahıydı Həzrət Süleyman,
Ədalətə pənah idi Nuşirəvan,
Şıx oğlu İsmayıl – o, cənnət məkan
Düşməz ələ o, bir yadigardı getdi.

Abdal, bu sözləri qanana söylə,
Tapsan bir ədalət divana söylə.
Səxalılar yetər imana söylə,
Əmsaxa dünyadan xar idi, getdi.

# VERƏSƏN

Bahar olcaq dağlar olar gülüzar,
İnsafdırmı gülü xara verəsən?!
Bülbül kimi həmdin zaya getməsin,
Şah könlünü ahu-zara verəsən.

Hər kim əgər şərdə şərri bilməsə,
Göydə əfsəl qəzənfəri bilməsə,
Hər kim ki, Əlini Vəli bilməsə,
Onun başın zülfüqara verəsən.

Qaraquş nanəcib heç gəlmir saya,
Qızılquş laçındı payə və payə,
Ruzimi verəsən o qarışqaya,
Nə ki, laçın ovun sara verəsən.

Qadir Mövlan nəzər salıb hər yana
Fərq qoymayıb bəyə, xana, sultana.
Abdal da sığınıb qadir Sübhana.
Sən də meylin belə yara verəsən.

## YAŞILDIR, YAŞIL

Səhərin şöləsin buldum, bələndim,
Yer üzünə gələn yaşıldır, yaşıl.
Məhəmməd Nəbiyə gəldi bir xələt,
Xələtin kəndisi yaşıldır, yaşıl.

Həzrət Musa dedi, inanmadılar,
Peyğəmbər söylədi inanmadılar,
Haqqa, həqiqətə inanmadılar,
Haqqın dörd bir yanı yaşıldır, yaşıl.

Abdalın gözündən tökdürürsən yaş,
Əhl-dil yolunda qurbandır bu baş,
Cəbrayıl dəryadan gətirdi bir daş,
Daşın içində bir qurd;
Ağzında yarpağı yaşıldır, yaşıl.

# TAP

Könül, peykar olma hər yar-yoldaşa,
Cəhd elə, hər mərdin sən əlindən qap.
Mərdi mənzur edib, tutma namərdi,
Unut bivəfanı, sən vəfalı tap.

Ay ilə Gün gərdiş eylər, atışar,
Yey rəfiqlər bir-biriylə tapışar.
Ruzi haradasa, gələr, yetişər.
Həzəran ölkə gəz, həzər ölkə çap.

Abdal, gəl səcdə qıl, sığın Xudaya,
Verdiyin əməklər getməsin zaya,
Güvənmə varına, gülmə gədaya,
Yenə sığın Haqqa, Haqq tərəfin tap.

# GEN GƏZ

Həqiqət yolunda budur nəsyətim,
Sözünü bilməyib, deyəndən gen gəz.
Bilməz zərin, zər-zibanın qiymətin,
Sonradan tapıban, geyəndən gen gəz.

Bir əyri, bir oğru olmaya eldə,
Söylənər dastandan, deyərlər dildə.
Xain əmanəti saxlamaz əldə,
Başını töhmətdə qoyandan gen gəz.

Abdal deyir bu sözləri ədəbdə,
Gözüm qaldı gərdən bağı sədəfdə.
Mən də gedəm, qalam Şahi-Nəcəfdə,
Xörəyin bilməyib, yeyəndən gen gəz.

# T Ə C N İ S L Ə R

## EL ATA

Yaz olanda büsatıdır dağların,
Ətəyində yer eyləyər elata.
Qarı düşmən qovğa salsa üstünə,
Bata bilməz süvar olsa el ata.

Bir Allahdır ərşi-gürşü yaradan,
Adı çoxdur; bir adı da Yaradan,
Nə yaratsan Yaradana yarat, an,
Qorx ki, sənə qara daşı el ata.

Miskin Abdal, şeytan anma, nər div an,
Müxənnəsə tutacaqdır nər divan,
Haqqa doğru sən qoyubsan nərdivan,
Ona görə deyir sənə el: ”Ata”.

# MƏNİ

Əhədən, səmədən, həyyi-layəmud,
Tut dəstimdən, yetir dür üstə məni,
Görsən nadürüstəm, vermə dürüstə,
Dürüstəmsə, yetir dürüstə məni.

Şəmimizə yetişməyir Haqq səda,
Bir gün olar bükdürərlər ağ səda,
Günbəz əl-Xizrədə, Məscid-Əqsada,
Onlar da tanıyır dür usta məni.

Əbcəd hesabilə dərs aldım ağdan,
Baxmadım qarayə, dər saldım ağdan,
Heyvatək soyuldum, dərs aldım ağdan,
Yetirdim dərsimi-dürüst aməni.

Mən Miskinə Haqqdan gəldi ”sin” ayə ,
Xətm olundu İrəsulə Sinayə.
Gör necə çuğlaşıb sinə-sinayə,
Tiflin tək görmədim dürüst əməni.

# B A Y A T I L A R

Ağ sular axar gedər,
Dağları yıxar gedər.
Dünya bir pəncərədir,
Hər gələn baxar gedər.

Əzizim, göycə dənəm,
Kim görüb Göyçədə nəm?!
Hər kəsin öz eli var,
Mən ulu Göyçədənəm.

Teymurləng susar keçər,
Qan tökməz, basar keçər
Toy-bayramdır Göyçədə,
Ad qalar: ”Basarkeçər”.

Mən aşıq, saza neylim?
Nəs gələn yaza neylim?
Öldü, qaldım zuluma,
Bu gəlin-qıza neylim.

Ağlaram, ağım ağlar,
Sol yanım, sağım ağlar,
Bülbüləm dar qəfəsdə,
Bağbansız bağım ağlar.

Təmizləyin axırı,
Tez qaytarın naxırı,
Bəlkə, gəlib çatıbdı
Bu dünyanın axırı.

Ağ suları sonalım,
Otağı zər xanalım,
Kimə dedi sözünü,
Barmaqları xınalım?

Teyim-teyim teylədim,
Bu qışı yaz eylədim.
Ayırdı yardan məni,
Bu fələyə neylədim?

Təbrizdən gələn gəlin,
Danışıb-gülən gəlin,
Əhdinə xilaf çıxdın,
Vədəsiz ölən gəlin.

Ovçular çıxır ova,
Gədikdə tapır yuva,
Maralından ayırar,
Ceyranı qova-qova.

Saza qara bağlaram,
Sinələri dağlaram,
Gecə-gündüz ah çəkib,
Zulum-zulum ağlaram.

Bu dağlar – zulum dağlar,
Kəsilib yolum, dağlar,
Hanı o bir cüt balam:
Həsənim, Əlim, dağlar?!

Bu bələni dağ kəsər,
Ürəyim tel-tel əsər,
Ana ’’balam, vay!” – deyib,
Dörd yanı mələr, gəzər.

Bu dağlarda dağım var,
Ölənim var, sağım var,
Ağla gözlərim, ağla,
Dil deməyə ağım var.

# D E Y İ Ş M Ə L Ə R

***(iki aşiq-məşuqun dilindən)***

Qız:
Ayrılıq yamandır, yaman,
Ağlaram, oğlan ağlaram.
Yer-göy dumandır, duman,
Ağlaram, oğlan, ağlaram.

Oğlan:
Əlac dözümdür, dözüm,
Ağlama, yarım, ağlama.
Haqq yolu bizimdir, bizim,
Ağlama, yarım, ağlama.

Qız:
Qovuşmaq iraqdır, iraq,
Ürəyim varaqdır, varaq,
Gəlməyən soraqdır, soraq,
Ağlaram, oğlan, ağlaram.

Oğlan:
Yollarım naçardır, naçar,
Bəxt quşum uçardır, uçar,
Haqq özü açardır, açar,
Ağlama, yarım, ağlama.

Qız:
Namərdlər dəstədir, dəstə,
Seyraqub qəsddədir, qəsddə,
Ürəyim xəstədir, xəstə,
Ağlaram, oğlan, ağlaram.

Oğlan:
Qaşların qandadır, qanda,
Kirpiklər sandadır, sanda,
Hərə bir yandadır, yanda,
Ağlama, yarım, ağlama.

Qız:
Əzizim, tatar məni,
Qul edər satar məni,
Yarım vəfalı olsa,
Axtarıb, tapar məni.

Oğlan:
Əzizim, tatar səni,
Kim qıyar satar səni.
Yarın ki, vəfalıdır,
Axtarar, tapar səni.

# D İ V A N İ L Ə R

## YA ƏLİ

Bey bismillah əzbərimdir, hey Xudadan, ya Əli,
Ən ibtida gəldi səda ərş-əladan, ya Əli.
Badi sər-sər, lohu qələm oldu dünya olmamış,
Bir Cəbrayıl qalxdı göyə tək dəryadan, ya Əli.

Səlli-aləm, mahi-aşkar, zülmətdən var pərdəsi,
Sey-Sirrdən səda gəldi, Cəbrayıl çəkdi bəhsi,
Həqiqəti düz bilmədi, tərsə döndü kəlməsi,
Alışıb yandı şahpəri, oldun fərman, ya Əli.

Yandı şahpər, endi suya, nələr gəldi yadına,
Xaki-kəlam verdi salam, yetişdi muradına,
Haqq-Təala özü dedi irəhmət ustadına,
Hər tərəfdən səda gəldi ’’Əhsən! Əhsən!”, ya Əli.

Hər kəlmədə tərif edir, Quranda ayət səni,
Cəmi aləm, övliyalar yazır əsli zat səni,
Həbib özü tərif edir külli vilayət səni,
Zahirdə təvəllüdsən, Sirri-Sübhan, ya Əli.

Göyçəlidir Miskin Abdal, yoxdur heç bir günahım,
Hər kəlmədə, hər ayədə sən ol mənim pənahım,
Puli-sirat, Haqq divandır, ol Xudadan köməyim,
Vəli sənsən, vəkil sənsən, Şiri-Yəzdən, ya Əli.

# QOYMARAM

Şeşpərlərə əgər nişan olsa yaxan, qoymaram,
Cəng olarsa bu meydanda, könül yıxan qoymaram.
Yaxşılıqda payım vardır, qismətimdir halallıq,
Bica yerə sitəmlərə qəlbi yaxan qoymaram.

Pak olmasan ulu Tanrı verər ağır cəzanı,
Qır qazanda qaynadar O düz yolundan azanı,
Sitəmlərə düçar edər mərdə quyu qazanı,
Mərdi-məzar deyiləni səmtə yaxın qoymaram.

Miskin Abdal göstərməyib heç zaman sərt üzünü,
Dərviş olub, əridərəm ürəklərin buzunu,
Yol gedərəm diyar-diyar neçə illər uzunu,
Düz ərkanı əyri gedə ya bəy, ya xan qoymaram.

# MƏNİ

Çərxi-fələk yarıtmadı dövlətdən, vardan məni,
Min bir dərdi-əzab verib, ayırdı yardan məni.
Səkrəqibin fitnə-feli çəkdi məni çarmıxa,
Yazıq Həzrət İsa kimi asdı divardan məni.

Türk əcəmə, əcəm türkə zülm eyləsə günahdır,
Hər ikisi bir kökdəndir, yaradan da Allahdır,
Öz elinə düşmən kəsin axır günü kütahdır,
Qadir Mövlam, uzaq eylə bayquşdan, sardan məni.

''Qırxlar piri'' özü verib dərsimi ümman mənim,
Çətin girə ürəyimə ləini-şeytan mənim.
Seyyid Miskin Abdal mənəm, söz mənim, meydan mənim,
Qoruyanım, özün qoru xain dostlardan məni.

## YOL VERMƏDİM

Xoşbəyanlıq virdim oldu, böhtana yol vermədim,
Şirin süxən əndəlibəm, hədyana yol vermədim.
Nifrin edib, lənət dedim xainə, iblislərə.
Qəlbimi ayna saxladım, nadana yol vermədim.

Bir bəşəri incitmədim, özümü şah saymadım,
Dostun sirrin söyləyib, dildən-dilə yaymadım,
Ömür qısa, dünya əzəl, çox yaşadım, doymadım,
Dür mətaha meydan açdım, tək cana yol vermədim.

Aşıq olub, dərs alanlar söz desin sözüm kimi.
Miskin Abdal, məğrur istə hamını özün kimi,
Arifi, mətləb qananı bilirəm gözüm kimi,
Sinəm üstən mərd yeridi, şeytana yol vermədim.

# NARIN ÜZƏ BİLMƏRƏM

Ey dost, sənin bağın cənnət, narın üzə bilmərəm,
Ha silkinsəm, dəryan dərin, narın üzə bilmərəm.
’’Qırxlar piri” özü düzüb ayağıma atəşi,
Alışaram Səməndər tək, narın üzə bilmərəm.

Dərviş gərək bu meydanda qurban olsun baş-başa,
Mürşidimdən üzüm dönməz, dünya gəlsə baş-başa.
Ayıq olan uzaq olsun, yetsin gərək baş-başa,
Fələk nə vaxt sökər üzüm, narın üzə bilmərəm.

Miskin Abdal, eşq əhlisən, ömrü vermə bada hey,
Özün haqqsan, Haqq əlindən götür nuş et, badə hey.
Məhşər günü tab etməzsən solxum-solxum bada hey,
Nə tutmusan özün dərviş, narın üzə bilmərəm.

# ZAY OLMUSAN

Yazıq könlüm, nə sızlarsan, bülbülə tay olmusan,
Haçan yardan yarımısan, sevilib bay olmusan?
Sən dərvişsən Haqq yolunda, Haqqı istə, Haqqı sev,
Nə olsun ki, bel bükülüb, kamana tay olmusan.

Yar olsan da incimə, gəl, ulu Tanrı bağışlar,
Dərgahında apaydındır bu cizgilər, naxışlar.
Qoy didəndən sel-sel olub, axsın qara yağışlar,
Axır məhşər görərsən ki, köpüklü çay olmusan.

Çay olmağın paklığındır, durma, yuyun, paka çıx,
Doğru-düzə yol açıqdır, nə qar-boran, nə palçıq,
Miskin Abdal, dolansan da ayaqyalın, başacıq,
Zər qədrini zərgər bilər, zaylara say olmusan.

# YARIMÇIQ DİVANİ

Qoymaynan, Miskin Abdal qəzada həlak olacaq,
Ey könül, gəl düş havadan, axırın xak olacaq.



**Təbrizli Sənubər**
**(Miskin Abdalın ilk həyat yoldaşı)**

# «MİSKİN ABDAL VƏ SƏNUBƏR» DASTANI

## USTADNAMƏ

Aşıq olub diyar-diyar gəzənin,
Əzəl başda pürkamalı gərəkdi.
Oturub-durmaqda ədəbin bilə,
Mərifət elmində dolu gərəkdi.

Xalqa həqiqətdən mətləb qandıra,
Şeytanı öldürə, nəfsin yandıra,
El içində pak otura, pak dura.
Dalısınca xoş sədalı gərəkdi.

Danışdığı sözün qiymətin bilə,
Kəlməsindən ləlü-gövhər süzülə,
Məcazi danışa, məcazi gülə,
Tamam sözü müəmmalı gərəkdi.

Arif ola, eyham ilə söz qana,
Naməhrəmdən şərm eyləyə, utana.
Saat kimi meyli haqqa dolana,
Doğru qəlbi, doğru yolu gərəkdi.

Ələsgər, haqq sözün isbatın verə,
Əməlin mələklər yaza dəftərə.
Hər yanı istəsə, baxanda görə,
Təriqətdə bu sevdalı gərəkdi.

Ustadlar ustadnaməni bir deməz, iki deyər. Biz də deyək, iki olsun, dostların qəlbi şad olsun:

Varlıyla dost olub, yoxsula gülmə,
Çox da havalanıb coşma, dünyada.
El səni istəyib, qabağa çəksə,
Ağır ol, alçağa düşmə dünyada!

Dərdini bölüşdür qədir bilənnən,
Vəfalı dost olmaz üzə gülənnən.
Bir adam ki, "sən öl" desə yalannan,
Onun körpüsündən keçmə dünyada.

Bu sözü bəyənər bir arif, əyyar,
Bədəsil kimsəyə yapış, nə yalvar,
Qonşuya söyləyib, aləmə yayar,
Sirrin seyraquba açma dünyada.

Yaxşı oğul əkər bir yaxşın ata,
Ölüncə heç kəsə yetirməz xata.
Yeri gəlsə, xeyir verər elata,
Onun arxasından qaçma dünyada.

Ələsgər, söylənir sözün adınan,
Arif məclisində hər isbatınan.
Bir dost sənlə olsa, sirri yadınan,
Onu düşmənindən seçmə dünyada.

Ustadlar ustadnaməni iki deməz, üç deyər. Biz də deyək, üç olsun, mərdlərin könlü açılsın:

“Can” deməklə, candan can əskik olmaz,
Məhəbbət artırar, mehriban eylər.
“Çor” deməyin nəfi nədir dünyada,
Abad könülləri pərişan eylər.

Nakəs adam danışıqda saz olar,
Kərəmdən kəm, səxavətdən az olar.
Nütfədən qarışan şeyitbaz olar,
Mərd də sığışdırmaz, nahaq qan eylər.

Bir gün Mansır qalxar, gəli toxmaq-yay,
Dağlara atmağa eylər haqq-say,
Seçilməz məhşərdə nə şah, nə gəday,
Xaliqi-ləmyazəl haqq divan eylər.

Məzəmmət eyləmə mən binəvanı,
Sahibi-səltənət, ey gövhər kanı,
Mənim sözüm yoldan azan mollanı,
İnşallah, qaytarar, müsəlman eylər.

Mən istərəm alim, mömin yüz ola,
Meyli haqqa doğru, yolu düz ola.
Diliynən zəbanı üzbəüz ola,
Ələsgər yolunda can qurban eylər.

Sizə haradan deyim, kimdən xəbər verim, Göyçə mahalının Zərgərli kəndindən olan Məhəmməd kişidən. Bu tayfanın adlı-sanlı adamlarının sorağı hər yana yayılıbmış. Hər yerdə onların varından, dövlətindən, cah-cəlalından, bir-birindən gözəl zərgərlik işlərindən ağız dolusu danışılardı. Qızılın bolluğundan hamı zərgərliklə məşğul olardı.

Məhəmməd kişi kəndin hörmətli adamlarından sayılırdı. Sürüsü su bulandırar, ilxısına yer tapılmazdı. Qızılının, gümüşünün, pulunun sayı-hesabı yox idi. Nə qədər var-dövlət, cahi-calal sahibi idisə, bir o qədər də səxavətli idi. Atası pullu Cəfər, oğlu Məhəmmədi molla yanında oxutdurmuşdu, kənddə-kəsəkdə elə bir toy-nişan olmazdı ki, Məhəmməd Cəfər oğlu orada başda olmasın. Kasıbların, yetim-yesirlərin dayağı, mərdi-məzarların, nanəciblərin qənimi idi.

Çoxları bilmirdi ki, adı, şöhrəti hər tərəfə yayılan Məhəmməd Cəfər oğlunun böyük bir dərdi var. Onun övladı yox idi. Nə vaxt idi ki, əmisi qızı Növrəstə ilə evlənmiş, lakin züriyyətləri olmamışdı. Vaxt ötsə, zaman keçsə də Məhəmməd ilə Növrəstə Allahın ətəyindən əllərini çəkməmişdilər.

Bir gün sabah-sabah, o başdan qapı döyüldü. Məhəmməd qapını açdı. Qapıda üzündən, gözündən nur tökülən bir dərviş dayanmışdı. Salam-əleykdən sonra Məhəmməd dərvişə «xoş gəldin» deyib, onu evə dəvət elədi. Dərviş dedi:

– Oğul, bil və agah ol. Sabah-sabah sənə qismət gətirmişəm. Al, bu almanı, yarıya böl, arvadınla ye. Doqquz aydan sonra bir oğlunuz olacaq. Adını Hüseyn qoyarsınız. O biri adını özü qazanacaq.

Məhəmməd qocadan almanı alıb, dedi:

– Baba dərviş, dayan, nəzirini gətirim.

Dərvişin bu gəlişindən çox sevinən Məhəmmədin evə girməsi ilə çıxmağı bir oldu. Onun bir əlində qocanın verdiyi alma, o biri əlində xeyli qızıl pul var idi. Dərviş qapıda yox idi. Elə bil, dərviş bir tikə əppək olub, göyə çəkilmişdi. Məhəmməd nə qədər axtardı, nə qədər soraqladısa, dərvişdən xəbər verən olmadı. Məhəmməd kor-peşman evə qayıtdı. Başına gələnləri arvadına danışdı. Sonra da dərvişin dediyi kimi, almanı ortadan ikiyə

böldü. Yarısını arvadına verdi, yarısını da özü yedi.

Vaxt gəlib, zaman yetişdi. Növrəstə doqquz ay, doqquz gün, doqquz saat, doqquz dəqiqədən sonra bari-hamiləni yerə qoydu. Məhəmmədin bir oğlu oldu.

Nəzirlər paylandı, qurbanlar kəsildi, toy-düyün başlandı. Hamı gözaydınlığına gəldi. Yedilər, içdilər, Allaha şükürlər oxudular. Uşağın adını, dərviş dediyi kimi, Hüseyn qoydular. Hamı bir ağızdan: – Adı ilə böyüsün, adlı-sanlı bir oğul olsun, ata-anasının, tayfasının, elinin-gününün adını ucaltsın!!! – dedi.

El ağzı fal olar, deyiblər. Hüseyn gündə bir buğda boyu yekəlib, yeddi yaşına çatdı. Üzündən-gözündən ağıl-kamal yağırdı. Hüseyni atası molla yanına qoydu. O, tez bir zamanda bütün elmləri sinədəftər eləyib, açarını cibinə qoydu.

Bundan sonra atası oğluna qılınc vurmağı, qalxan tutmağı, at çapmağı, kəmənd atmağı, xülasə, cəngdə lazım olan fənd-feilləri öyrətdirməyə başladı.

Vaxt ötdü, illər keşdi. Hüseyn gəlib həddi-buluğa çatdı. Bu yaşında o, çox şeyləri bilirdi. Mərifətinə, ağlına, kamalına, qanacağına görə hamı onun başına and içirdi. O, boylu-buxunlu, cüssəli bir igid olmuşdu. Atası tez-tez onu özü ilə səfərlərə aparır, onun daha çox görüb-götürməsinə çalışırdı.

Bir axşam Məhəmməd kişi yenə də yol tədarükü gördü. Arvadı Növrəstə yola hazırlıq gördü. Bu dəfə onlar İsfahana səfər eləməli idilər. Yeyib-içəndən sonra tez yatdılar ki, sabah ala-qaranlıqda oyansınlar, karvana gecikməsinlər. Atalar yaxşı deyib: «sən saydığını say, gör, fələk nə sayır».

Sabah o başdan, hamı qalxdı. Amma Hüseyn hələ şirin yuxuda idi. Dedilər:

– Yəqin, yuxusuzdur. Bir azdan qalxar.

Bir az da gözlədilər, qalxmadı. Silkələdilər, çağırdılar, qışqır-

dılar, qalxmadı ki, qalxmadı. Karvanbaşı ismarıc göndərdi ki, gecikirik, gəlsinlər.

Nə başınızı ağrıdım. Karvan öz yolu ilə gedəsi oldu. Məhəmmədin səfər də, ticarət də yadından çıxdı. Başları qarışdı Hüseynə. Heç kim bir şey anlaya bilmirdi. Hamı mat-məəttəl qalmışdı. Hüseyn illər yorğunu kimi şirin-şirin yatırdı.

Bütün günü gözlədilər, gecə də gəlib keçdi. İkinci gün də axşama çatdı, ancaq Hüseyn qalxmadı ki, qalxmadı. Bu xəbəri eşidib-bilən qohum-əqraba bir ucdan axışıb gəlirdi. Axırda bunların arasından dünyagörmüş bir qoca irəli yeriyib, dedi:

– Ay camaat, narahat olmayın! Ona yuxusunda Haqqdan buta verilir. O, haqq aşığı olacaq. Üç günün tamamında ayılacaq...

Qərəz, hamı üç günün tamamını gözləməyə başlasın, görək, Hüseynin başına nələr gəldi. Hüseyn baş yastığa atan kimi aləmi-röyada gördü ki, onun otağında qəflətən bir nurani dərviş peyda oldu. Onu İsfahana aparmaq istəyən atası Məhəmməd kişiyə üz tutub, dedi:

– Sən, hələlik, heç yerə getmə. Hüseyni mən özüm Təbrizə aparacağam. Təbrizdən qayıdana qədər gözlə.

Bunu deyib, qoca Hüseyni yanına alıb, onunla neçə-neçə dərələr keçdi, dağlar aşdı, ormanlar dolaşdı. Kəndlərdə, şəhərlərdə oldu. Onlar yollarda qara-borana düşdülər, quldur-qaçaqlardan sağ-salamat qurtarıb, çox çətinliklə gəlib, uca bir dağın başına çıxdılar. Olandan, qalandan yeyib, dağların dupduru sularından içib, dincəldilər. Buradan baxanda hər tərəf aydın görünürdü. Buradakı gözəllikləri seyr etdikcə, az qalırdı, Hüseynin ürəyi qopub, düşsün.

Bir az dincələndən sonra baba dərviş dedi:

– Eşit, oğul. Diqqətlə qulaq as. Bizə lazım olan yerə gəlib çıxmışıq. Bir azdan Təbrizi də görəcəksən. Sənin gələcək taleyin

bu torpaqla bağlıdır.

O, qəflətən əlindəki badəni Hüseynə uzadıb, dedi:

– İç, oğlum, iç bu badəni!

Hüseyn bir addım geri çəkilib, dili dolaşa-dolaşa dedi:

– Baba dərviş, mən müsəlmanam, şərab bizə haramdır!

Dərviş dedi:

– İç, oğlum! Bu, şərab deyil, eşq badəsidir. Sən çox-çox çətinliklərdən keçəcəksən, çox əzablarla qarşılaşacaqsan. Eşqin yolunda sənə «miskin» də deyəcəklər, «abdal» da. Sən hər bir çətinlikdən keçib, ucalara qalxacaqsan. Mənim kimi bir kəramət sahibi, övliya olacaqsan. Bu gündən Miskin Abdal adı ilə tanınıb, bu adla dolaşacaqsan bütün dünyanı. Bu, Haqqın əmri, Tanrının istəyidir.

Hüseyn nurani qocanın əlindəki badəni istər-istəməz alıb, başına çəkdi. Dünya gözündə nura boyandı. Halı dəyişdi. Ürəyi həsrətlə döyünməyə başladı. İndi, elə bil, başqa bir aləmdə idi.

Baba dərviş sağ əlini irəli uzadıb, şəhadət və orta barmağını haçalayıb, dedi:

– Bala, bax gör, barmaqlarımın arxasından nə görünür?

– Baba dərviş, gözəl bir şəhər. Şəhərdə gözəl bir saray, onun içində gözəl bir qız.

Bu sözləri deyib qurtaran kimi o, bihuş olub, yerə yıxıldı. Dərviş onun üzünə su töküb, ayıltdı. Əlini başına çəkib, dedi:

– Eşit, oğul. Həmin gördüyün şəhər Təbrizdir. O saray Sövdəgər Mahmudun evidir. Ona qəddarlığına görə «İlan Mahmud» da deyirlər. Orada gördüyün o gözəl İlan Mahmudun qızı Sənubər xanımdır. Səni ona, onu da sənə buta verdim. Gözlərini yum, aç.

Hüseyn gözlərini baba dərvişin dediyi kimi yumdu. Açanda evlərini, bir də yuxuda olduğu bu üç günü onun ayılmasını

həsrətlə gözləyən ata-anasını, qohum-qonşularını, dost-tanışlarını gördü.

Sabahlar üzünüzə xeyirliklə açılsın. Hüseynin ayılmağına hamı şad oldu. O saat qurbanlar kəsildi. Kasıblara, yetimlərə, dullara, kimsəsizlərə nəzir-niyaz paylandı. Xülasə, bir şadyanalıq oldu ki, gəl görəsən. Anası Növrəstənin şadlığından göz yaşı selə dönmüşdü. Ancaq Hüseyn dinib-danışmırdı. Qara bulud kimi tutulmuşdu. Əvvəlcə elə bildilər ki, nitqi tutulub. Nə qədər dilə tutdularsa, bircə kəlmə də ala bilmədilər. Anası fəryad qopardı. Atası Məhəmmədin gözləri yaşla doldu. Hamı donub qalmışdı.

Hüseyn handan-hana özünə gəldi. Əlini divara uzadıb, sazını istədi. Divarda üç saz var idi. Biri babasının, biri atasının, biri də özünün. Adamlar karıxdıqlarından o biri sazları vermək istədilər. Hüseyn əli ilə ilə işarə edib, öz sazını istədi. O, sazını alan kimi köynəyindən çıxarıb, sinəsinə basdı. Aldı, görək, nə dedi:

Eşidin, həzarat, ərzi-halımı,
Salıb kəməndinə bir dilbər məni.
Divanə eyləyib, alıb canımı,
Oxlayıb sinəmdən bixəbər məni.

İsmi Sənubərdir, xəbərdar olun,
Qızıdır Təbrizli İlan Mahmudun.
Allaha şükr edin, bu dərdi udun,
Bəlkə, eyləməyə birtəhər məni.

Dərviş babam verdi eşqin camını.
İçib, atəşlərə saldım canımı,
Uçurdum könlümün xanimanını,
Gördünüz eşqi-hal bu səhər məni.

Gedirəm, bu yoldan dönən deyiləm,
Od tutub yananam, sönən deyiləm,
Bir comərd igidəm, zənən deyiləm,
Doğubdur anadan anam ər məni.

Hamıya könüldən yetirrəm salam,
Daha Hüseyn yox, Miskin Abdalam.
Sənubər eşqində Rüstəmi-Zalam,
Eyləyir vətəndən dərbədər məni.

Hamının yavaş-yavaş qırışığı açılmağa başladı. Onlar indi anladılar ki, Hüseynə, doğrudan da, Haqq vergisi verilib. Hüseyn yuxuda gördüklərini sazla olduğu kimi, sözlə də başına toplaşanlara anlatdı. Sözünü bitirəndən sonra bildirdi ki, Sənubərə qovuşmaq üçün tezliklə yola çıxmalıdır. Bunu eşidən anası Növrəstə xanım qulac hörüklərini sinəsinə sıxıb, ağlaya-ağlaya aldı, görək, nə dedi:

Başına döndüyüm gül üzlü oğul,
Getmə, oğul, getmə, aman günüdür.
Getməsən, olaram mən hamıya qul,
Getmə, oğul, getmə, aman günüdür.

Aldı Miskin Abdal:
Başına döndüyüm gül üzlü ana,
Butamın dalınca gedəsiyəm mən.
Ağlayıb qəlbimi döndərmə qana,
Butamın dalınca gedəsiyəm mən.

Aldı Növrəstə:
Yazığam, anana yazığın gəlsin,
Qoyma ahı-ünü göyə yüksəlsin,
Dərdliyəm, dərdimi el-aləm bilsin,
Getmə, oğul, getmə, aman günüdür.

Aldı Miskin Abdal:
Dua et Tanrıya, ağlama daha,
Getməsəm, bataram böyük günaha.
Bağla ümidini qadir Allaha,
Butamın dalınca gedəsiyəm mən.

Aldı Növrəstə:
Ağlayıb, dad çəkib, deyər Növrəstə,
Düzülüb sinəmə qəm dəstə-dəstə.
Sən getsən, illərlə olaram xəstə,
Getmə, oğul, getmə, aman günüdür.

Aldı Miskin Abdal:
Yanmış ürəyimin qalmayıb halı,
Zarıncı eyləmə Miskin Abdalı.
Eşitsin, qoy bütün Göyçə mahalı,
Butamın dalınca gedəsiyəm mən.

Söz tamama yetdi. Ana-bala bir-birinə sarmaşıq kimi sarılıb, ağladılar. Anası nə qədər yalvardı, nə qədər dil tökdüsə, oğlunu dediyindən döndərə bilmədi. Axırda, əlacsız qalıb, qəmgin halda bir tərəfə çəkildi. Dedi: "Bəlkə, bir neçə gün keçər, anasının göz yaşlarına rəhm eləyib, bu yoldan qayıdar".

Adamlar arasında xısın-xısın söz-söhbət gəzdi, pıçhapıç düşdü. Biri dedi: gəlin, murdarlayaq. Biri dedi: zorla başqa bir qızla evləndirsinlər. Biri belə dedi, biri elə dedi. Əlqərəz, ağlabatan bir fikrə gələ bilmədilər. Axırda, atası irəli yeriyib, dedi:

Onu murdarlamaq çox böyük günah olar. Hüseynə Haqq vergisi verilib. Bu, Tanrının qismətidir. O ki qaldı, başqa qız təklif olunmasına, onu eləyək. Razı qalar, lap yaxşı. Razı olmaz, Allah yaxşı yol versin. Özgə neyləyə bilərik?!

Xülasə, Miskin Abdalı nə qədər dilə tııtdular, nə qədər bəy, xan, paşa qızının adını dedilər, bır nəticə hasil olmadı.

Adamların ondan əl çəkmədiyini görən Miskin Abdal sazını sinəsinə basıb, aldı, görək, nə dedi:

Tanrım yazıb yazımızı,
Mən butamdan ayrılmaram.
Fələk versin payımızı,
Mən butamdan ayrılmaram!

Göy gurlasa, şimşək çaxsa,
Başımıza odlar yağsa.
Mən də yoxam, o qız yoxsa,
Mən butamdan ayrılmaram.

Miskin Abdal divanədir,
Dedikləri, görün, nədir?
Ayrı qızlar əfsanədir,
Mən butamdan ayrılmaram.

Hamı gördü ki, Hüseyni bu yoldan döndərmək mümkün deyil. Ona görə, əlacsız qalıb, razılıq verdilər. Dedilər ki, get,

Tanrı köməyində olsun. Doğma ocağımıza sağ-salamat qayıdasan. Sevdiyinə qovuşasan. Miskin Abdalın qəlbi cuşa gəldi. Sazı sinəsinə basıb, aldı, görək, nə dedi:

Ay ata, ay ana, halallıq verin,
Uzaq bir səfərdə, yol üstəyəm mən.
Sirri bəlli deyil sonsuz göylərin,
Tükənməz bir eşqdə, həvəsdəyəm mən.

Hayana baxıram, hər yan gülüstan,
Şamama tağ atıb, dəyməyib bostan.
Hələ yazılmamış bir böyük dastan,
Hələ oxunmamış şikəstəyəm mən.

Bu yolda tufan da, çən də olacaq,
Açılan güllər də, bir gün solacaq.
Bilin, Miskin Abdal yarı bulacaq,
Nə çolaq, nə şikəst, nə xəstəyəm mən.

Növrəstə xanım oğlunun tel-tel olan qəlbinin sızıltılarını eşidib, biruzə verməsə də, için-için ağladı, əllərini qoşa hörüklərinə apardı, onları sinəsinə sıxıb, aldı, görək, nə dedi:

Sənə halallığı özüm verirəm,
Get, oğul, üstündə Allah yar olsun.
Dеməm sevinc əkib, kədər dərirəm,
Hər qışın əriyib, bir bahar olsun.

Gör nələr eylədi, gərdişi-dövran,
Nə zaman istəsən, ol yola rəvan.

Tanrıdan balama dilərəm aman,
Görüm, butasıyla bəxtiyar olsun.

Yazıq Növrəstənin məlul çağıdır,
Qəlbini yandıran hicran dağıdır.
Sənlə dünya mənə cənnət bağıdır,
Sənsiz hər nəyim var, tarimar olsun.

Bayaqdan ana-balaya diqqətlə qulaq asan Məhəmməd kişinin də sinəsi yaman dolmuşdu. Üzünü arvadına tutub, dedi:

– Ay arvad, sinəmə bir-neçə xanə söz gəlib. Qoy mən də deyim, bəlkə, sinəm boşala.

Arvadı dedi:

– Buyur, ay kişi:

Məhəmməd sədəfli sazını sinəsinə basıb, dedi:

Haqqın dərgahına tapşırram səni,
Sağ get, yara yetiş, salamat qayıt.
Elindən, obandan ayırdı səni,
Sağ get, yara yetiş, salamat qayıt.

Nə dövlətin olsun, nə malın olsun,
Gözəl bəxtin olsun, iqbalın olsun,
Çəkdiyim zəhmətlər halalın olsun,
Sağ get, yara yetiş, salamat qayıt.

Dünyada heç bir şey deyil əbədi,
Üzündə, gözündə bu məlal nədi?
Gözü yaşlı qoyma qul Məhəmmədi,
Sağ get, yara yetiş, salamat qayıt.

Elə ki, söz tamama yetişdi, hamı bir ağızdan “amin” dedi.

Ər-arvad Miskin Abdala yol tədarükü görməyə başladı. Hər şey hazır olandan sonra Uzun Qasımı da Miskin Abdalın yanına qatdılar. Dedilər: uzaq yoldur, Miskin Abdal da çox cavandır, yola-izə nabələddir. Demək olmaz, canlıdan qada əskik deyil. Bir şey-zad olsa, xəbər çatdırar. Bir də Uzun Qasım bərkə-boşa düşmüş adam idi. Həm də yazıb-oxumağı da bacarırdı. Elmlərdən hali idi. Yol xurcununa dəftər-qələm də qoydular ki, Miskin Abdal harada nə desə, başına nə gəlsə, yazarsan. Ayrılıq məqamı gələndə Miskin Abdal gördü ki, anası bahar buludu kimi dolub. Atasını dindirən olsa, zülüm-zülüm ağlayar. Qohum-qonşular da məlul-məlul ona baxırlar. Miskin Abdal buna dözməyib, aldı, görək, nə dedi:

Bir sevdaya düşmüşəm mən,
Allah, məni özün saxla!
Dərd içində bişmişəm mən,
Allah, məni özün saxla!

Anam qalır gözü yaşlı,
Atam qalır başı daşlı.
Qohum-qonşu qəm ataşlı,
Allah, məni özün saxla!

Miskin Abdal gedər, gələr,
Atam-anam qalmaz mələr.
Qəmli könlüm bir gün gülər,
Allah, məni özün saxla!

Söz tamama yetdi. Miskin Abdal ilə Uzun Qasım hamı ilə halallaşıb, yola düşməyin binasını qoydular. Onların arxasınca güzgü tutdular, su atdılar.

Bir az keçəndən sonra kəndin kənarındakı uca yerə gəlib çıxdılar. Doğma yurdundan-yuvasından, elindən-obasından ayrı düşən Hüseynin ürəyi qübar elədi, sıra dağlara, şırıl-şırıl axan bulaqlara, əli ilə saldığı bağ-bağçaya nəzər saldıqca, ötən günlərini xatırladı... Dözmədi. Sazını köynəyindən çıxarıb, üzünü kəndə tərəf tutdu. Qəmli-qəmli oxumağa başladı:

Mən gedirəm, sən qalırsan,
Ulu dağlar, salamat qal!
Yadıma nələr salırsan,
Gur bulaqlar, salamat qal!

İnlə, yazıq qəlbim, inlə,
Ay çöl, çəmən, məni dinlə.
Günüm keçdi toy-düyünlə
Ötən çağlar, salamat qal!

Bağça saldım, gül dərmədim,
Bağ becərdim bar görmədim.
Miskin Abdal, budur dərdim,
Barlı bağlar salamat qal!

İlin o vaxtı idi ki, gül gülü, bülbül bülbülü çağırırdı. Hər tərəf ala, yaşıla bürünmüşdü. Dan yeri təzəcə açıldığından hər yandan qoyun-quzu mələşməsi, at kişnərtisi, çoban tütəyinin yanıqlı səsi eşidilirdi. Bir yandan eldən, obadan ayrılmaq, bir yandan da bu gözəl mənzərələr Miskin Abdalın ürəyini parça-parça elədi, qəlbini cuşa gətirdi. Sazını sinəsinə sıxıb, aldı, görək, nə dedi:

Bahar vaxtı yol başladım Təbrizə,
Çəmən qaldı, çiçək qaldı, gül qaldı.
Öz elimdə vurulmadım bir qıza;
Yanaq qaldı, dodaq qaldı, tel qaldı.

Səhər-səhər yarpaqlara şeh düşür,
Gül bülbüllə, bülbül güllə öpüşür.
Asimanda ulduzları sayrışır,
Tufan qaldı, şimşək qaldı, sel qaldı.

Dərib-dərib, dəstələyib əlinə,
Bu güllərdən yar düzəydi telinə.
Miskin Abdal gedir yarın elinə,
Həftə qaldı, fəsil qaldı, il qaldı.

Bunu deyib, başladılar yerin damarını qıra-qıra yol getməyə. Gün çeşdə qalxanda gəlib, Alçalıya çatdılar. Hələ axşama xeyli var idi. Dost-tanışlar çox yalvar-yaxar elədilər ki, bu gecə qalıb, onların qonağı olsunlar. Miskin Abdal razı olmadı.

Alçalı camaatı ilə xudahafizləşib, yollarına davam elədilər. Qabaqda yol haçalanırdı. Yolun biri quru yol idi. Bu yol ilə getmək əlverişli deyildi. Çünki, neçə gün dağlardan-daşlardan keçib, uzun bir yol keçməli idilər. Ona görə, gəmi ilə getmək istəyirdilər. Amma inanmırdılar ki, bu vaxta gəmi qalsın. Ona görə, çarığın bağını bərkidib, piyada getmək istəyəndə, Miskin Abdal gölün sahilində bir gəminin dayandığını görüb, Qasıma dedi:

– Qasım, tələs. Bəxtimizdən bərədə gəmi qalıb.

Onlar gəmiyə yaxınlaşdılar. Bu vaxt külək başladı. Gəminin böyüyü də, gəmidəkilər də sevindilər. Gəminin böyüyü üzünü Miskin Abdalgilə tutub, dedi:

– Səmt küləyi olmadığından dünən axşamdan burada qalmışıq. Elə bil, bu küləyi siz gətirdiniz. Tez olun, gəmiyə minin!

Gəminin böyüyü biləndə ki, bu Haqq aşığıdır, Miskin Abdalın üzünə salavat çevirdi, onlara təzədən «xoş gəldin» elədi. Gəminin böyüyü qonaqlara olmazın hörmət elədi. Miskin Abdal da sazı köynəyindən çıxarıb, çalıb-oxumağa başladı.

Gəmidəkilərin başı aşığa elə qarışmışdı ki, vaxtın necə keçdiyini, hara getdiklərini yaddan çıxarmışdılar. Bir də o vaxt ayıldılar ki, gəmi sahilə xeyli qalmış bir adaya zərbə ilə dəydi. Hamı təlaş içində adaya atıldı. Tez lövbər saldılar. Tufanın yatmağını gözlədilər. Tufan da ki, kəsmək bilmirdi. Tufan düz üç gün gəmini yerindən tərpənməyə qoymadı. Buradakıların hamısı tezliklə suya qərq olub, məhv olacaqlarından qorxurdu. Vətəndən ayrı düşmək, bir yandan da yar həsrəti Miskin Abdalın bir dərdini min elədi. Dağ-daş başına fırlandı, için-için alovlanıb yandı. Heç nəyə gücü çatmayıb, sazını əlinə aldı. Zilini-zil, bəmini-bəm eləyib, aldı, görək, nə dedi:

Gecə yuxum yoxdur, gündüz qərarım.
Fələk niyə qoydu adada məni?
Bilməm, neyləmişəm, nəydi günahım?
Niyə saldı aha, fəryada məni?

Mən bir hal əhliyəm, mətləb qanıram,
Nələr düşünürəm, nələr anıram.
Elə alışmışam, elə yanıram,
Söndürə bilməzlər suda da məni.

Mən Miskin Abdalam, Haqqı seçmişəm,
Ərənlər əlindən badə içmişəm,

Bir canandan ötrü candan keçmişəm,
Qorxutmaz bəla da, qada da məni.

Miskin Abdal sözünü qurtarar-qurtarmaz tufan dayandı. Bayaqdan at kimi şahə qalxıb, əjdaha kimi nərə çəkən dalğalar sahil boyu sürünüb, gölə tərəf çəkildilər. Dağılan qara buludların arasından Günəş göründü. Gəmidəkilər Miskin Abdalın ayaqlarına döşəndi. İndi hamı onun Haqq aşığı olduğunun canlı şahidi olmuşdu.

Gəmi yenə yoluna davam elədi. Tezliklə sahilə çatdılar. Hamı sağ-salamat mənzil başına yetdiyinə, bu bəladan xilas olduğuna görə Allaha şükr eləyir, Miskin Abdalın ömrünə dualar oxuyurdular.

Axşama hələ xeyli var idi. Gəmidəkilər nə qədər minnət eləyib, yalvardılarsa, Miskin Abdal ilə Uzun Qasım qalmadı. Yollarına davam elədilər. Axşamüstü gedib, bir şenniyə çıxdılar. Camaat bunları çox mehribanlıqla qarşıladı, Meydanəli adlı bir kişi onları evlərinə dəvət elədi. Çaydan, çörəkdən yeyib-içib, bir az rahatlandılar. Eşidib-bilən qohum-qonşular buraya toplaşdı. Mətləbi qanan Miskin Abdal sazını köynəyindən çıxarıb, çalıb-oxudu. Axırda da kim olduğunu, haradan gəlib, haraya getdiyini, yolda başına gələnləri bunlara danışdı. Məclisə toplaşanlar bildilər ki, bu Haqq aşığıdır. Vergi verilib, butasının dalınca gedir. Hamı onlara xeyir-dua verib, evlərinə dağılışdı.

Sabah açıldı. Sabahlar üzünüzə xeyirliklə açılsın. Qonaqlar yuxudan durana kimi süfrə açılmışdı. Miskin Abdal ilə Qasım yeyib-içəndən sonra ev sahibinə öz razılıqlarını bildirib, yola düşməyə icazə istədilər.

Meydanəli kişi yola da bir xeyli tədarük görüb, bunları böyük hörmət, izzətlə yola saldı.

Miskin Abddalgil kəndə axşamüstü çatdıqlarından çox şeyi görə bilməmişdilər. Yol boyu hər tərəfin gül-çiçək içində olduğunu görüb, ürəyində dedi ki, əbəs yerə buraya Dərəçiçək deməyiblər. Dərə də, dağ da, çəmən də, çöl də, bostan da, bağ da, yamac da gülə-çiçəyə bürünmüşdü. Miskin Abdalın könlü bu yerlərin misilsiz gözəlliyindən cuşa gəldi, sazını sinəsinə basıb, aldı, görək, nə dedi:

Əcəb səfası var sizin ellərin,
Dərəsi çiçəkdir, dağı çiçəkdir.
Ətri bihuş edir qönçə güllərin,
Bağçası çiçəkdir, bağı çiçəkdir.

Bura dərə deyil, cənnət məkandır,
Mat-mətəl qalmışam xeyli zamandır.
Pis gözdən qoruyun, Allah, amandır,
Sol yanı gül açıb, sağı çiçəkdi.

Yaxşı ki, güzarım düşdü bu yerdən,
Baxanın ağlını aparır sərdən.
Hər yan xəbər verir bardan-bəhərdən,
Körpə şamamanın tağı çiçəkdir.

Yayılıb yamaca qoyun-quzular,
Burda ömr edənin yaşı yüz olar.
Çiçəkdən seçilmir gül dərən qızlar,
Daş, çınqıl, qayalıq, zağı çiçəkdir.

Miskin Abdal özü Haqqdan pay dilər,
Dəhandan dürr olan dediyin bilər.

Sizin gözəlləri belə vəsf elər:
Lalə yanaqları ağı çiçəkdi.

Qonaqları yola salmağa yığışanlar dönə-dönə rica etdilər ki, qayıdanbaş yenə bu elin qonağı olmamış Göyçəyə getməsinlər. Miskin Abdal söz verdi ki, muradına çatıb qayıdanda mütləq onlara baş çəkəcək.

Miskin Abdal ilə Qasım yol başladılar Təbrizə tərəf. Az getdilər, çox dayandılar. Çox getdilər, az dayandılar. Neçə oba, orman keçdilər, dağ, dərə aşdılar. Qabaqlarına çıxan hər kənddə, hər şennikdə onları böyük hörmətlə, izzətlə qarşıladılar, xeyir-dualarla yola saldılar. Dərələyəz ellərindən keçəndə, bir də gördülər ki, qarşıdakı çəmənlikdə bir dəstə qız çiçək dərir. Al-yaşıl geyinən, bir-birindən gözəl qızlar Miskin Abdalgili görüb, diksinən kimi oldular. Qızların içində Cəvahir adlı dilli-dilavər bir qız var idi. O dedi:

– Qorxmayın, qızlar. Bunlar quldur-qaçaq, yol kəsən deyillər. El aşığı, yol adamıdırlar. Özü də, lap cavandırlar.

O biri də zarafatyana qayıtdı ki:

– Özləri də subaydırlar.

Bu sözə qızların hamısı gülüşdü. Uzun Qasım bu gülüşdən pərt oldu. Miskin Abdal ona göz vurdu ki, sakit olsun. Burada başqa şey var.

Cəvahir bunların bərabərinə gəlib, salam verib, əleyk aldıqdan sonra dedi:

– Bizim ellərə xoş gəlibsiniz. Sizi bizə Allah yetirib. İndi bu güllü-çiçəkli çəməndə aşıqlar çalar, oxuyar, biz nərmənazik, nazlı-qəmzəli qızlar da qulaq asıb, feyziyab olarıq.

Uzun Qasım özünü saxlaya bilməyib, dedi:

– Xanım, mən aşıq deyiləm.

Cəvahir dedi:

– Yoxsa balabançısan?

Uzun Qasım dedi:

–Yox, xanım. Nə aşığam, nə də balabançı. O, başladı, olub-olanın hamısını qızlara danışdı. Qızlar bir ağızdan onlara Allahdan kömək dilədilər, alqış elədilər. Qonaqlara gül dəstələri bağışladılar.

Cəvahirin dili yenə dinc durmadı, dedi:

– Miskin Abdal, gedirsən, Allah işinə rəvac versin. Ancaq bir də səni görək, görməyək... Sənin kimi Haqq aşığına rast gələk, gəlməyək... Əgər, doğrudan da Haqq aşığısansa, biz qızlara da bir tərif de. Bir az da bizim üçün çal, oxu.

Miskin Abdal bir-birindən gözəl olan bu qızları gözaltı süzdü. Qəlbi riqqətə gəldi, dedi:

– Gözüm üstə, qızlar. Sizin tərifinizi Yaradan özü verib. Mən də Allahın sizə verdiyi o gözəlliyi vəsf eləyərəm. Uzaq yol gəlmişik. Susamışıq. Mənə bir içim su verin, sonra başlayım, tərifinizi deməyə.

Qızlardan biri cəld qaçıb, yaxınlıqdakı durna gözlü bulaqdan dolçasını doldurub, aşığa verdi. Buz kimi suyu içəndən sonra, görək, Miskin Abdal qızlara nə dedi:

Bir-birnizdən gözəlsiniz,
Qarşımıza çıxan qızlar.
De, bizlə var nə qəsdiniz?
Könül qurub, yıxan qızlar.

Şərbət bildim suyunuzu,
Mən öyərəm boyunuzu,
Kaş, görəydim toyunuzu,
Maral kimi baxan qızlar.

Cavansınız, qönçəsiniz,
Yol üstündə xonçasınız.
Pərvazlanıb, uçansınız,
Sultan qızlar, ay xan qızlar.

Olmayaydı kələkləri,
Olaydı xoş diləkləri,
Neçə-neçə ürəkləri,
Atəşlərə yaxan qızlar.

Mən Abdalı edib xəstə,
Bir qara göz, boyu bəstə,
Bənövşəni dəstə-dəstə,
Yaxasına taxan qızlar.

Qızlar bir ağızdan Miskin Abdala "Sağ ol!", "Əhsən!" dedilər.

Cəvahir bilirdi ki, aşıq "boyu bəstə" deyəndə dərdindən divanə olduğu Sənubərini nəzərdə tutur. Ancaq özünü o yerə qoymayıb, dedi:

– Aşıq, bizim aramızda o "qara göz, boyu bəstə" kimdir?

Miskin Abdal dedi:

– Xanım, mən öz sevgilimi nəzərdə tuturam. Axı, o da sizin kimi növcavan qızdır.

Cəvahir dedi:

– Yaxşı, onda sənin sözündən belə çıxır ki, dünyada sənin Sənubərindən başqa gözəl yoxdur. Nə olub? Allahın adına şükür. Tərifimizi özün dedin. Necə oldu ki, bizlərdən birimiz sənin Sənubərinə tay olmadıq?

Bu sözlərlə Cəvahir aşığı özü qəsdən bərkə-boşa çəkirdi.

Miskin Abdal dedi:
– Xanım, indi ki, belədir, onda qulaq as:

Sizə çirkin deməmişəm,
Dərələyəz gözəlləri.
Haqdan yanan bir atəşəm,
Dərələyəz gözəlləri.

Bir ocaq var hər binədə,
Bir sevgi var hər sinədə.
Eybiniz yox bir dənə də,
Dərələyəz gözəlləri.

Sənubərdir mənim tacım,
Ona qalıb bir əlacım,
Siz hamınız mənim bacım,
Dərələyəz gözəlləri.

Yarpaq düşər, xəzəl olar,
Könül sevən gözəl olar.
Sevgi Haqdan nazil olar,
Dərələyəz gözəlləri.

Miskin Abdal, budur sözüm,
Sizdə işvə, məndə dözüm.
Yolunuza güllər düzüm,
Dərələyəz gözəlləri.

Qızlar yenidən şadlandılar. Aşığa təzə-tər gül, çiçək dəstələri bağışladılar. Cəvahir üzünü Miskin Abdala tutub, dedi:

– Qalmaq istəsən, buyur, qal. Biz də elik, obayıq. Qonaq Allah qonağıdır. Neçə vaxtdır yollardasan, yorulub, əldən düşərsən. Bir neçə gün qonaq qal, çal-çağır. Sonra yenə Təbrizə, sevgilinin dalınca gedərsən.

Miskin Abdal:

– Sağ ol, xanım. Yolçu yolda gərək. Sənubər xanımın gözü yoldadır. Biz mütləq getməliyik.

Cəvahir dedi:

– Madam ki, belə oldu, onda qulaq as.

O, siyah zülfündən üç tel ayırıb, mərmər sinəsinin üstünə basıb, aldı, görək, nə dedi:

Cəvahir:

Sözüm budur, sənə, aşıq,
Səni yara yetişəsən.
Biz daha, bacı-qardaşıq,
Səni yara yetişəsən.

Miskin Abdal:

Rüsxət verin biz yolçuya,
Qalın Allah amanatı.
Yolumuz var neçə aya,
Qalın Allah amanatı.

Cəvahir:

Bas sinənə, çal sazını,
Allah yazıb bu yazını.
Xudam versin murazını,
Səni yara yetişəsən.

Miskin Abdal:
Sazım kökdə, sinəm dolu,
Bağladaram neçə qolu.
Göstərin Təbrizə yolu,
Qalın Allah amanatı.

Cavahir:
Cəvahiri sanma naşı,
Bilir nədir eşq ataşı,
Unutmaz bacı qardaşı,
Səni yara yetişəsən.

Miskin Abdal:
Bu yerlərdə gözüm qalar,
Söz-söhbətim, sözüm qalar.
Abdal deyər: izim qalar,
Qalın Allah amanatı.

Hər ikisi sözünü tamam eləyib, əhdi-peyman bağladılar, qardaş-bacı oldular. Cəvahir dedi:

– Qardaş, mən özüm səni bərkə-boşa çəkirdim. Halal olsun sənə. Sən, doğrudan da, Haqq aşığısan. Yarına da yetişəcəksən. Mən də bu görünən kənddə Məlik ağanın qızıyam. Nişanlım da öz əmim oğludur. Bu payız toyumuzdur. Sağ-salamat qayıdanda, bir, bacına da baş çək. Tez qayıtsan, toyumuzu özün eləyərsən. Sonra birlikdə gedərik sizin ellərə. Göyçənin tərifini çox eşitmişəm, amma indiyə kimi görməmişəm.

Miskin Abdal dedi:

– İnşallah, hər şey qaydasına düşər, bu murazına da çatarsan.

O, sazla olduğu kimi, sözlə də buradan Təbrizə sarı getməyin səmtini soruşub, öyrəndi. Qızlar görüşüb, hallalaşıb, onlara

yol göstərdilər. Yolçular yola düzəldi. Az getdilər, çox getdilər, gəlib, İrəvan səmtinə çıxdılar. Miskin Abdal məsləhət gördü ki, şəhərə girməsinlər. Çünki, böyük şəhərdir. Aşığı tutdular, həftələrlə, aylarla buraxmayacaqlar. Özü də ki, bilərlər Göyçədən gəlmişik, heç buraxmayacaqlar.

Qərəz, xeyli dərs-gors, məşvərətdən sonra Naxçıvana tərəf yollarını davam etdirdilər. Bir xeyli yol getdikdən sonra bir bulağın başında oturub, dincəldilər. Birdən Uzun Qasımın gözləri göylərə baş alıb ucalan "Ağrı dağı"na sataşdı. Dedi:

– Bilmirsən, bu hansı dağdır? Ətəyində istidən ilan mələşir, başında nə boyda qar var!

Bu yerlərə Miskin Abdal da birinci dəfə idi ki, gəlirdi. Ancaq dağın duruşundan, əzəmətindən bildi ki, bu "Ağrı dağı"dır.

O, bu dağın İrəvan şəhərinin yaxınlığında yerləşdiyini eşitmişdi. Kənd yığnaqlarında, məclislərdə aşıqlar, el ağsaqqalları Miskin Abdalın yanında dəfələrlə "Ağrı dağı"ndan çox söhbətlər eləmişdilər.

Miskin Abdal bunları unutmamışdı. O, öz-özünə dedi: "Bu, heç insafdan deyil ki, bu qədər yol gələsən, xəta-bəlalardan qurtarasan, hər yerdə qatar-qatar söz deyəsən, amma adı dillər əzbəri olan, Nuh Peyğəmbərin nişanəsi "Ağrı dağı"na bir qatar söz qoşub, oxumayasan". O, sazını köynəyindən çıxarıb, üzünü "Ağrı dağı"na tutub, oxumağa başladı:

Qüdrətdən yaradıb Yaradan səni,
Məğrur dayanıbsan sən, Ağrı dağı.
Şöhrətin tutubdur cümlə cahanı,
Məftunam hüsnünə mən, Ağrı dağı.

Başında qış olar, ətəyində yay,
Təksən bu dünyada, yoxdur sənə tay.
Qartallı qoynundan kəsməz hay-haray,
Çəkilməz başından çən, Ağrı dağı.

Nuhun gəmisindən bir xəbər söylə,
Karvana yetmirəm, sarvanı əylə.
Bu Miskin Abdala inayət eylə,
Danış bircə kəlmə, din, Ağrı dağı.

Söz qurtarandan sonra sazı köynəyinə qoyub, yol başladılar Naxçıvan şəhərinə tərəf. Neçə gün yol getdilər. Axır, bir gün gəlib, Naxçıvan şəhərinə varid oldular.

Qara zurnanın səsi şəhəri başına götürmüşdü. Sən demə, Naxçıvanın adlı-sanlı kişilərindən biri, səxavəti dillərdə dastan olan İsgəndər bəy oğluna toy eləyirmiş. Qırx günlük toya bir neçə aşıq da dəvət olunmuşdu. Bunlar bu yerlərin adlı-sanlı aşıqları sayılardı. Ancaq İsgəndər bəyin ürəyində bir tıqqıltı qalmışdı. Axı, o, Göyçədən aşıq gətirə bilməmişdi. Hər yerdə olduğu kimi, buralarda da Göyçə aşıqları adla söylənirdi.

Birdən İsgəndər bəyə xəbər gətirdilər ki, deməzsənmi, şəhərə Göyçədən bir aşıq gəlib. Özü də çox cavandır. İsgəndər bəy əmr elədi ki, onları tez onun yanına gətirsinlər. Bir göz qırpımında Miskin Abdal ilə Uzun Qasımı tapıb, İsgəndər bəyin yanına gətirdilər. Xoş-beş, on-beşdən sonra İsgəndər bəy başladı bunlarla əhval-pürsanlığa. Miskin Abdal başına gələnləri ona nağıl elədi. İsgəndər bəy xeyli fikrə gedəndən sonra dedi:

– Oğul, atanı tanıdım. Şeyx Heydərin dostudur. Mən də Şeyx Heydərlə çox yaxın dostam. Deməli, sən həm Haqq aşığı, həm də mənə dünyada hamıdan yaxın olan dostumun dostunun oğlu-

san. O ki qaldı, Təbrizli İlan Mahmuda, onu da tanıyıram. Çox nanəcib adamdır. İş işdən keçib. Bura qədər gəlibsən. Allahın ətəyindən tut. İnşallah, axırda hər şey yaxşı olar. Amma getməyə çox tələsmə. Bir neçə gün qal, oğlumun toyunda iştirak elə. Burada hamı Göyçə sazının-sözünün ölüsüdür.

Miskin Abdal onun sözünü yerə salmadı. Üç gün toyda-mağarda çalıb-çağırdı. Onun səsinə, avazına hamı heyran qalmışdı.

Üçüncü gecə paxıllıqdan özünü saxlaya bilməyən bir qoca aşıq irəli yeriyib, icazəsiz, filansız Miskin Abdala dedi:

– Görürəm, özünə çox güvənirsən. De görüm, aşıq necə olmalıdır?

İsgəndər bəy aşığa gözünü ağartdı. O, dərhal yerində oturdu. İsgəndər bəy üzünü Miskin Abdala tutub, dedi:

– Aşıq, öz işində ol. Onun dediyini saya salma!

Hamının qoca aşıqdan zəhləsi getdi. Elə bildilər ki, Miskin Abdal onun dediyinə cavab qaytara bilməyib, pisikəcək.

Miskin Abdal halını pozmadan dedi:

– Bəy, lütfkarlığına görə sağ ol. Aşığın sözünə cavab vermək mənim borcumdur:

Aşıq, kəşt eyləyib ağır elləri,
El içində namus, arı unutma.
Həyalı gəz, təmiz saxla adını,
Dost yanında etibarı unutma.

Halal mala haram qatmaq nə lazım?
Hədər yerə kaman atmaq nə lazım?
Hər yetənə yalan satmaq nə lazım?
Əhdi-peyman, düz ilqarı unutma.

Miskin Abdal bir qonaqsan dünyada,
Könlün bir dəryadır, ürəyin ada.
İstəsən ki, yetişəsən murada,
Yaş torpağı, dar məzarı unutma.

Hər yerdən alqış sədaları göyə ucaldı.Ariflər dedilər: “Di, al payını!” Baxdılar ki, elədiyi qələtə görə qoca aşıq əkilmək istəyir. Miskin Abdal üzünü aşığa tutub, dedi:

– Qulaq as, hələ sözümü qurtarmamışam:

İnsan oğlu, kələk qurma,
Kələyə, fəndə düşərsən.
Nahaq yerə üzə durma,
Zülmündən anda düşərsən.

Hər adamla olma tanış,
Yaz gününü eyləyər qış.
Fikir eylə, sonra danış,
Qəfil kəməndə düşərsən.

Miskin Abdal, xəbərdar ol,
Yoldaşınla düz ilqar ol.
Yaman günə şükürdar ol,
Dönüb, hasanda düşərsən.

Alqış alqışın, əhsən əhsənin dalınca sel kimi yağdı. İsgəndər bəy özünü saxlaya bilməyib, düz, meydana gəldi. Miskin Abdalı bərk-bərk qucaqlayıb, alnından öpdü, əlini kürəyinə vurub, dedi:

– Halal olsun sənə Göyçənin suyu, çörəyi. Halal olsun sənə süd verən anaya, ərsəyə çatdıran ataya! Hanı qoca aşıq? Cavanı

bir də sınamaq istəmirmi?!

Baxdılar, qoca aşıq nə gəzir? Bayaqdan əkilib. İsgəndər bəy keçib, bayaqkı yerində əyləşdi. Miskin Abdal üzünü İsgəndər bəyə tutub, dedi:

– Bəy, bəlkə, o biri aşıqlardan da məni sınamaq istəyənlər var. Buyursunlar. Kim istəyir, çıxsın meydana.

Daşdan, qayadan səs çıxdı, aşıqlardan səs çıxmadı. Miskin Abdal öz-özünə düşündü ki, bu da kişilikdən deyil, neçə gündür əziyyətini çəksinlər, başına firlansınlar, sən İsgəndər bəyə, onun oğlunun bu xeyir işinə bir neçə kəlmə söz deməyəsən. Miskin Abdal üzünü İsgəndər bəyə tutub, dedi:

– Bəy, ocağın həmişə toylu-düyünlü, sözlü-söhbətli, qonaqlı-qaralı olsun. Bilirsən ki, biz sabah yola düşürük. Neçə gündür, yeyib-içib, çalıb-oxuyuruq. İzn versəydin, bu toya mən də öz sözümü deyərdim.

İsgəndər bəyə də, elə bu lazım idi. Dedi:

– Buyur, Göyçəli balası! Buyur, görək, qulağımız səndədir.

Aldı Miskin Abdal:

Bu cəlalı, bu növrağı,
Sən qurubsan, İsgəndər bəy!
Xəmirini halallıqdan,
Yoğurubsan, İsgəndər bəy!

Sən Hatəmsən, öyün, öyün,
Yaddan çıxmaz bu toy, düyün.
Öz yurdunda dünən, bu gün
Mərd durubsan, İsgəndər bəy.

Abdal aldı sorağını,
Yazdı könül varağını,
Namərdlərin tifağını,
Uçurubsan, İsgəndər bəy.

Hər yandan "afərin" sədaları ərşə bülənd oldu. İsgəndər bəy meydana gəldi. Ortaya iri bir dəsmal sərdi. Əvvəlcə, özü dəsmala bir xışma onluq qızıl qoyub, dedi:

– Məni istəyən, aşığa nəmər!

Tezliklə dəsmala bir kəndin bir illik xərci yığıldı. Miskin Abdal dəsmalı İsgəndər bəyin qabağına qoyub, dedi:

– Bağışla, İsgəndər bəy. Mən o aşıqlardan deyiləm. Nə eləmişəm, sənin xətrin üçün eləmişəm. Mənə pul, mal, var-dövlət lazım deyil. Atamın varı-dövləti bir mahala sığışmır. Özün bilirsən ki, mən öz murazımın dalınca gedirəm. Ən böyük nəmərim sizin xeyir-duanızdır.

Hamı Miskin Abdalın ağlına, mərifətinə heyran qaldı. Ona murazına çatmaq üçün uğurlar deyib, el xeyir-duası verdilər.

Gecə keçmişdi. Hamı evə dağılışdı. İsgəndər bəy də qonaqları rahatladı.

Sabahlar üzünüzə xeyirliyə açılsın. Elə ki, sabah açıldı, yığışdılar ki, Miskin Abdalgili yola salsınlar. Yəhərli-yüyənli iki at, bir də atların tərkində yol azuqəsi hazır oldu.

Miskin Abdal yol azuqəsindən bir az götürüb, atlardan imtina elədi. Dedi:

– Xətrin xoş olsun, İsgəndər bəy. Niyyətim var, butamın dalınca piyada getməliyəm.

Bu sözdən sonra İsgəndər bəy heç nə demədi. Yola düşmə məqamında o, Miskin Abdalı bağrına basıb, dedi:

– Get, yaxşı yol. Nə çətinliyin olsa, mən hazıram. Ancaq bir

şeyi yadında saxla. Butana nə zaman qovuşub, geriyə dönsən, mütləq bizə gəl. Sənin toyunu burada özüm edəcəyəm. Göyçəyə sizi mən özüm yola salacağam.

Onlar bu əhd-peymanla ayrıldılar. Üzü Təbrizə doğru yol başladılar. Bir neçə gün yol gedəndən sonra bir düzə çatdılar. Hava bərk isti idi. Ətrafda bulaqdan, çaydan əsər-əlamət yox idi. Dağlar da uzaqda idi. Peşman oldular ki, nahaq, yola su götürməyiblər. Daha iş işdən keşmişdi. Dözməkdən başqa çarə yox idi. Miskin Abdal Uzun Qasımın halını görüb, dedi:

– Darıxma, Allah bizi darda qoymaz, köməyimizə çatar.

Bunu deyər-deməz, birdən-birə göyün üzünü qara buludlar aldı, göy guruldadı, şimşək çaxdı. Qar, dolu, çovğun başladı. Göz-gözü görmürdü. Bir neyzənbillah başladı ki, elə bil, dünyanın axırı idi. Elə bil, yer-göy bir-birinə qarışmışdı. Sel, su dünyanı başına aldı. Dağlardan qopan selin nərəsi yeri-göyü silkələyirdi. Miskin Abdalgil yekə bir daşın başına çıxdılar. Az qaldı sel daşı da, onları da süpürüb, aparsın. Uzun Qasım fikirləşdi ki, daha bizimki də buraya qədər imiş. Miskin Abdal ümidini Haqqdan üzməmişdi. Baxdı ki, bu xına o xınadan deyil. Sazını sinəsinə basdı, üzünü göylərə tutub, aldı, görək, nə dedi:

Bu nə dərddi, nə bəladı,
İmdada çat, qadir Allah!
Yollarımı sellər aldı,
İmdada çat, qadir Allah!

Gözü yolda qalanım var,
Dərdə, qəmə dolanım var.
Çiçək kimi solanım var,
İmdada çat, qadir Allah!

Atam-anam yoxdur burda,
Gecə-gündüz ahu-zarda.
Abdal qaldı yaman darda,
İmdada çat, qadir Allah!

Söz tamama yetməmiş, buludlar yarıldı. Güclü küləklər buludları qovub, uzaqlara apardı. Göyün üzü açıldı. Sellər-sular get-gedə azaldı. Bir azdan onlardan heç bir əsər-əlamət qalmadı. Miskin Abdal ilə Uzun Qasım qayanın üstündən düşüb, paltarlarını sıxıb, sərdilər, qurutdular, yenə də yola rəvan oldular. Axşamüstü bir şenniyə gəlib çatdılar. Obanın adamları qonaqları hərarətlə qarşıladı. Yeyib-içəndən sonra bir az da çalıb-oxudular. Gecəni orada yatıb, dincəldilər. Sabah yenə "Ya mədəd" deyib, yola düşdülər. Yolda bir çobana rast gəldilər. Ondan Təbrizin yolunu soruşdular. Çoban da zırlamanın, qanmazın biri idi. İki ayağını bir başmağa dirəyib, dedi:

–Aşıq bir-iki ağız çalıb-oxumasa, yolu göstərən deyiləm.

Miskin Abdal bir özünə baxdı, bir çobana baxdı. Kimə möhtac olduğunu görüb, dərin fikrə getdi, ürəyi qübar elədi. Sözlər sinəsinə düzüldü. Sazını zilə kökləyib, aldı, görək, nə dedi:

Təbriz yolu bir nadana tuş oldum,
Nə anladı, nə qandırdı, nə qandı.
Bir söz sordum, çənə vurdum, yoruldum,
Gördüm, vallah, qəflətlərdə yatandı.

Çoban dedi:

–Sağ ol aşıq, yaman oxuyursan, lap ürəyimdən xəbər verirsən. Ay belə oxusan, nə demişəm. Əgər axıra kimi belə oxusan, işin düzəldi, getdin Təbrizə. O birini de, gəlsin.

Miskin Abdal dedi:

Od üstündə korğun qızan bir sacam,
Gör nə gündə, gör kimlərə möhtacam?!
Adı bəlli, istəmirəm sirr açam,
Bərələrdə keçi başı tutandı.

Bayaqdan bir az aralıda çomağına söykənib, aşığa qulaq asan çoban bu bəndi eşidəndən sonra bir az da irəli gəlib, dedi:

– Dədəm sənə qurban olsun, aşıq! Məni yaman kövrəltdin. İndiyə qədər nə qədər aşıq eşitmişəm, sənin sözlərin kimisi yoxdur. Hamısı, elə bil, ustadnamədir. Sənə mən də, o dediyin keçilər də qurban olsun. De görüm, o birini necə deyirsən?

Aldı Miskin Abdal tapşırmada nə dedi:

Miskin Abdal hər gədaya kiçilməz,
Şah oğluna bezdən xələt biçilməz.
Qanacağı davarlardan seçilməz,
Heç nə üstə aralığı qatandı.

Elə ki, söz tamama yetdi, Miskin Abdal sazını köynəyinə qoydu, yolu tutub, getməyə başladı. Çoban ha çağırdı, ha bağırdı, xeyri olmadı. Dallarınca qaçıb, yalvardı, yaxardı... Gördü, yox, bunlar heç dala dönüb, baxmırlar.

Çoban kor-peşman öz sürüsünün yanına qayıtdı. Öz-özünə dedi:

– Yazıq aşığı bir elə oxutdum, məni, keçimi, qoyunumu bir elə tərifl ədi, heç olmasa, ona bir loxma çörək, bir badya süd də vermədim.

Çobanı burada deyinə-deyinə qoyaq, görək, yolçular neylə-

dilər? Miskin Abdalgil, özləri də bilmədən yolu düz gedirdilər. Belə-belə neçə gün yol getdilər. Soruşa-soruşa Təbrizə yaxınlaşdılar.

Bir xeyli gedəndən sonra öyrəndilər ki, Təbrizə az qalıb. Yorulduqlarından bir çəmənlikdə dincəlməyi qərara aldılar. Bir az oturmuşdular ki, gördülər, başlarının üstündə bir dəstə atlı dayanıb. Ancaq atlılardan biri, lap pəhləvana oxşayır. Miskin Abdal ilə Qasım ayağa qalxdılar. Qasım ürəyində dedi: “bizimki də bura qədər imiş. Bunlar yəqin, yol kəsənlərdir“. Bir də öz-özünə təskinlik verdi ki, axı, biz yol adamıyıq, talanası nəyimiz var?

Atlılardan böyüyünün adı Qaçaq Mehdi idi. O dedi:

– Aşıq, de görüm, kimsiniz, haradan gəlib, haraya gedirsiniz?

Miskin Abdal dedi:

– Göyçədənik. Təbrizə gedirik. Adım da Miskin Abdaldır.

Qaçaq Mehdi dedi:

– Təbrizdə nə işiniz var?

Miskin Abdal bir istədi, Təbrizə nə məqsədlə getdiklərini deməsin. Sonra düşündü ki, ey dili-qafil, birdən yalan danışdığımızı öyrənər, pis olar. Yaxşısı budur, gəl, elə düzünü de. Axırı da nə olacaq, olsun. Dedi:

– Sövdəgər Mahmudun qızı Sənubərin dalınca gedirəm. Ağam onu mənə buta verib.

Qaçaq Mehdi:

– Deməli, sənə vergi verilib, haqq aşığısan?

Miskin Abdal dedi:

– Bəli.

Qaçaq Mehdi Miskin Abdalı çox bərkə-boşa çəkdi. Gördü, yox, aşıq qorxu nə olduğunu bilmir. Özü də, çox ağıllı oğlandır. Haqq aşığı olduğuna söz ola bilməz. Axırda tanışlıq verib,

Miskin Abdal ilə dostlaşdı.

Qaçaq Mehdi mehriban-mehriban dedi:

– Miskin Abdal, olmazmı, gəlişinin məqsədini sazla-sözlə də deyəsən?

Miskin Abdal dedi:

– Niyə olmur, Mehdi qağa. İndi mən çalım-çağırım, sən də, o biri uşaqlar da qulaq asın. Görün ki, mən kiməm, nəçiyəm, məramım, məqsədim nədir:

Yatmış idim, bir sevdaya tuş oldum,
Oyanandan düşdü dilə qismətim.
Asimana pərvazlanan quş oldum,
Şüdd olubdu eldən-elə qismətim.

Yol-ərkanım, təriqətim bəllidir,
Dar günümdə ol pənahım Əlidir,
Deməyin ki, yoldan ötən dəlidir,
Səpələnib çəmən, çölə qismətim.

Harayımı Yaradanım eşitsin,
Xəta varsa, məndən uzaq ötüşsün,
Məqamında muradına yetişsin,
Heç görməsin nə ah, nalə qismətim.

Urcah olsun alma kimi yanağa,
Canlar alan al qırmızı buxağa,
Xoş zəbana, baldan şirin dodağa,
Şux yerişə, qara telə qismətim.

Dəhanımda əzbər olub Əlif-Lam,
Məndən olsun Xudamıza min salam,
Mən Abdalam, doğulandan halalam,
Yaradandan gəlib belə qismətim.

– Aşıq, mənim adım Mehdidir. Bu tərəflərdə mənə Qaçaq Mehdi deyirlər. Özüm də sənin kimi adamların, kasıbların, yetim-yesirin dostuyam. Pis adamlara qan uddururam. Sevgilinin atası çox qəddar adamdır. Ona İlan Mahmud deyirlər. Xoşluqla qızı sənə verməsə, yanıma gələrsən, zorla da olsa, butanı sənə yetirəcəyəm.

Sonra Uzun Qasımı göstərib, zarafatla soruşdu:

– Bu kişi kimdir bəs? Yoxsa, buna da buta veriblər?

Miskin Abdaldan qabaq Qasım dilləndi:

– Yox, Mehdi qağa, həyançıyam. Özü də kişi yox, cavan oğlanam.

Onlar gülüşdülər.

Qaçaq Mehdi baxdı ki, uşaqlar yol gəlib, yorulublar. Ona görə də zarafatını davam etdirdi:

– Deyirsən ki, cavan oğlansan, yəni subaysan, eləmi?

– Bəli.

– Söz altında qalana oxşamırsan ha. De görüm, indiyədək nə əcəb evlənməmisən?

– Vaxtım olmayıb.

Hamı gülüşdü. Qaçaq Mehdi zarafatını davam etdirdi:

– Ayə, evlənməyə nə vaxt? Nə olub vaxtına?

– Nə bilim? Gecələr göydə ulduzları sayıram, gündüzlər çəməndə otları.

– Deyə bilərsənmi, nə qədər ot, nə qədər ulduz var?

– Hələ, sayıb qurtarmamışam. Özü də, say tez-tez yadımdan

çıxır. Hər gün təzədən başlayıram.

–Yaxşı, sənin adın nədir?

– Qasım. Özü də Uzun Qasım deyirlər.

Yenə də hamı ucadan güldü. Qaçaq Mehdi dedi:

– Yaxşı, evlənməyin barədə dədənə niyə bir söz demirsən?

– Dədəmdən utanıram.

– Anana de.

– Demişəm. Anam deyir, hələ bir az da uzanmalısan.

– Axı, niyə?

– Nə bilim, deyir ki, başqalarının oğlu çoxdur, mənimki bircədir. Qoy lap uzun olsun.

– Onda sənə bir adam qız verməz.

– Bir adam qız verməz, bir neçəsinin qızını birdən alaram.

Bu söhbəti eşidənlər uğunub getdilər. Xülasə, çox sözdən, zarafatdan sonra Qaçaq Mehdi uşaqlara Təbrizin yolunu göstərdi. Özü də tapşırdı:

– Harada dara düşsəniz, mənə xəbər çatdırarsınız. Sağlıq olsun, Allahın köməkliyi ilə iki aşiq-məşuq bir-birinə qovuşacaq. Aşığı burada oxutmuram. Əhd eyləyirəm ki, yarına yetişəndən sonra ona doyunca qulaq asacağam.

Hamı bir ağızdan dedi:

– O gündən Allah pay versin.

Sonra Qaçaq Mehdi üzünü yenə Qasıma tutub, dedi:

– Ayə, gödək Qasım, çalış Təbrizdən bir qız da sən tap. Çox əziyyətlər çəkibsən. Göyçəyə əliboş qayıtma. İkinizin də toyunuzu bir eyləyərik. Bu uzunluqda adama Göyçədə heç kəs qız verməz.

Yenə də hamı gülüşdü.

Qasım dedi:

– Sözündən çıxmaram, Mehdi qağa!

Ayrılanda Qaçaq Mehdi gördü ki, Miskin Abdalın, deyəsən, yenə də deməyə sözü var. Dedi:

– Miskin Abdal, olmaya, bizə demədiyin bir söz yadından çıxıb, qalıb?

Miskin Abdal dedi:

– Mehdi qağa, sinəmə bir qatar da söz gəlib, izn versən...

Qaçaq Mehdi tez dedi:

– Buyur, bizdən ötrü çox xoşdur, eşidirik, de gəlsin.

Bunu eşidəndə, aldı Miskin Abdal, görək, nə dedi:

Nə müddətdir eldən iraq düşmüşəm,
Bu dağlarda, bu düzlərdə izim var.
Sinəm dolu, kürələrdə bişmişəm,
Məclis qurub, söyləməyə sözüm var.

Buta aldım bir qaragöz dilbəri,
Öz yolumdan dönəmmərəm mən geri,
Addım-addım, qarış-qarış hər yeri,
Axtarmağa ürəyimdə dözüm var.

Bu sevdada ömrüm viran, talandı,
Məhəbbətsiz ötən ömür yalandı,
Atasının ayaması “İlan“dı,
Mahmud qızı Sənubərdə gözüm var.

Şimşək olub, Alosmanda çaxaram,
Bir sel olub, kükrəyərəm, axaram,
Başdan-başa geyinməyə zər-xaram,
Ayağıma dolamağa bezim var.

Sanmayın ki, Miskin Abdal fağırdı,
Yarın dərdi hər cəfadan ağırdı,
Ağam məni bu sevdaya çağırdı,
Dastan açıb, oxumağa sazım var.

Qaçaq Mehdi ilə, yoldaşları ilə Miskin Abdalgil görüşüb-öpüşüb, mehribanlıqla ayrıldılar.

Təbrizə cəmi üç günlük yol qalmışdı. Miskin Abdalgil Təbrizə üz tutmaqda olsun, görək, Sənubər xanım neylədi?

Baba dərviş eşqin camını Hüseynə içirəndə həmin badədən birini də Sənubər xanıma vermişdi. O gündən Sənubər xanım da eşqə düşüb, Miskin Abdala qovuşmaq həsrəti ilə alışıb-yanırdı. Sənubər xanımın Gülçöhrə adında bir xidmətçisi var idı. Gülçöhrə sözə, sirrə çox möhkəm qız idı. Sənubərin nə sirri var idisə, bircə onunla bölüşürdü. Bir gün o sübh tezdən gördü ki, Sənubər xanımın halı hal deyil. Yanaqları lalə kimi qızarıb, rəngi allanıb. Bir haldadır ki, gəl görəsən. Özündə-sözündə deyil. Nə qədər elədi, Sənubərdən bir cavab ala bilmədi. Qorxdu, dedi, yəqin qız naxoşlayıb. İstədi, qaçıb, atasına, anasına xəbər eləsin. Bunu hiss eləyən Sənubər xanım əlinin işarəsi ilə onu saxladı, qara hörüklərinin birini qar kimi ağ sinəsinin üstünə endirdi. Aldı, görək, nə dedi:

Ağam mənə buta verib,
Bir oğlana vurulmuşam.
Uzaq elli bir igidə,
Bir oğlana vurulmuşam.

Ərənlərlə qoşa gəzən,
Eşqin dəryasında üzən,

Bağrımın başını əzən,
Bir oğlana vurulmuşam.

Sənubərə oldu olan,
Könlüm şəhri viran, talan.
Çox gözəli dərdə salan,
Bir oğlana vurulmuşam.

Sözünü tamama yetirəndən sonra Sənubər nurani bir dərvişin yuxuda ona eşq piyaləsi içirdiyini, Göyçə mahalının Zərgərli kəndindən olan Məhəmməd oğlu Hüseyni ona buta verdiyini söylədi. Sənubər bir az sözdən-söhbətdən sonra Gülçöhrəyə dedi:

– Gülçöhrə, bu söhbəti ikimizdən başqa kimsə bilməməlidir. Bu sirri anama da deməmişəm. Bircə sənə deyirəm. Əgər mənə kömək eləmək istəyirsənsə, bu gündən gözdə-qulaqda ol, öyrən, gör Təbrizə qərib adam, aşıq gəlirmi? Şəhərimizə Göyçə ellərindən Hüseyn adında cavan aşığın gəldiyini öyrənən kimi mənə xəbər elə. Ürəyimə damıb, bu günlərdə o, Təbrizə gəlməlidir.

Gülçöhrə dedi:

– O nə sözdür, xanım?. Sənin yolunda ölümə də getməyə hazıram.

O gündən Gülçöhrə Hüseynin sorağında oldu. Günlər ötdü, həftələr keçdi. Hüseyn gəlmədi ki, gəlmədi, Sənubərin gözü yollarda qalmışdı. Ürəyinə min fikir gəlirdi. Sənubər qorxdu ki, Hüseyn çox gecikə. Dədəsi onu başqasına vermək istəyirdi. Bir də, Sənubər bilirdi ki, atası heç vaxt onun tanımadığı bir adama ərə getməsinə razı olmayacaqdır.

Elçilər İlan Mahmudun qapısını yağır eləmişdilər. Hamıya da "yox" deyirdi. Qızını Bəzirgan Qeysərin oğluna vermək

istəyirdi. Çünki, onun varı-halı dünyadan aşmışdı. Amma oğlu Cümşüd bir qara qəpiyə dəyəsi oğul deyildi. Bivecin, fərasətsizin biri idi. Bunu Sənubər xanım da eşitmişdi. Anası Səlbinaz da bilirdi. Amma hər ikisi İlan Mahmudun qorxusundan cınqırlarını belə, çıxara bilməzdilər. Ona əbəs yerə İlan Mahmud demirdilər. Qəddarlıqda, mərdimazarlıqda, tamahkarlıqda tayı-bərabəri yox idi. Evdə də, eşikdə də, hamının ondan zəhləsi gedirdi.

İlan Mahmud Bəzirgan Qeysərə söz vermişdi ki, «İsfahana sövdəgərliyə gedirəm, bir aya qayıdacağam. Qayıdandan sonra hər şeyi qurtararıq». Bəzirgan Qeysər də buna çox sevinmişdi. Sövdəgər Mahmud İsfahana təzəcə yola düşmüşdü. Gülçöhrə yenə məlul-məlul Sənubər xanımın yanına gəlirdi. Birdən qulağına yanıqlı bir səs gəldi. Qulağını qapıya verib, dinləyəndə baxdı ki, Sənubərin səsidir. O, butasının ayrılığına dözə bilməyib, oxuyurdu:

Ay həzərat, yandı canım,
Harda qaldı yarım mənim?
Gözüm yolda, könlüm səsdə,
Harda qaldı yarım mənim?

Həsrətindən qan ağlaram,
Sinəmi çarpaz dağlaram.
Ölüncə qara bağlaram,
Harda qaldı yarım mənim?

Sənubərəm, gözüm yaşlı,
Neyləyim mən başı daşlı?
Qəlb yanğılı, can ataşlı,
Harda qaldı yarım mənim?

Gülçöhrə dözə bilməyib, içəri girdi. Sənubərin boynundan qucaqlayıb, üzündən-gözündən öpdü, gözlərinin yaşını silib, dedi:

– Sənubər xanım, sən, lap mənim ürəyimi dağladın. Çox qəm eləmə, sizi bir-birinizə yazan, heç vaxt sizi darda qoymayacaq. Bu yaxınlarda sizi bir-birinizə qovuşduracaq. Sənubər dedi:

– Allah ağzından eşitsin, dediyin fal olsun. Məni qınama, ürəyimə damıb ki, Hüseyn hardadırsa, bu gün burada olacaq. Bu düz olsa, peşkəşin məndə.

Gülçöhrə Sənubərin qəlbini xoşhal etmək üçün dedi:

– Peşkəşin nə olacaq, xanım?

Sənubər:

– Səni də özümlə Göyçə ellərinə aparacağam.

Hər ikisi güldü. Sənubər dedi:

– Gülçöhrə, bu gündən mənə xanım demə. Səni özümə bacı seçmişəm. Allah bilir ki, sirrimi səndən başqa heş kəsə deməmişəm. İstəyirəm ki, axıracan belə olsun. Bu gün get şəhərin gündoğan səmtində dayan. Bəlkə, Hüseyn gəldi.

Gülçöhrəgilin evi şəhərin kənarında, özü də həmin yolun yaxınlığında idi. O, «Allah, Məhəmməd, ya Əli» eləyib, yola düzəldi. Deyilən yerə təzəcə çatmışdı ki, uzaqdan iki qaraltı göründü. O, Allahı çağırıb, gözləməyə başladı. Qaraltılar yaxınlaşanda Gülçöhrə gördü ki, iki kişi xeylağıdır. Lap yaxınlaşanda gördü ki, iki cavan oğlandır. Birinin də çiynində saz var. Gülçöhrə onların qabağını kəsib, dedi:

– Deyin görüm, kimsiniz, nə karəsiniz, haradan gəlib, haraya gedirsiniz?

Qızın belə yekə-yekə danışması Qasımın heç xoşuna gəlmədi. İstədi, desin: “Axı, sən kimsən ki, bizi sorğu-suala tutursan, buralarda kişi yoxdurmu?“. Miskin Abdal tez onun ayağından

basdı. Bildi ki, qız sözlü adamdır. Qız xeylağına yalan danışmağı da kişiliyinə sığışdırmadı. Fikirləşdi ki, islanmışın yağışdan nə qorxusu? Olacağa onsuz da çarə yoxdur. Düzünü deyəcəyəm:

– Xanım, niyə acığın tutur. Biz uzaq-uzaq ellərdən gəlmişik.

– Uzaq, yəni haradan?

– Göyçədən. Səfərimiz Təbriz şəhərinədir. Mənim adım Miskin Abdal, yoldaşımın adı Qasımdır. İkimiz də subayıq. Xanım, özgə nə soruşmaq istəyirsən?

Aşığın adı Gülçöhrəni çaşdırmışdı. Axı, Sənubərin dediyi oğlanın adı Hüseyn idi. Qalan nə deyirdisə, hamısı düz gəlirdi. Gülçöhrə soruşdu:

– Aşıq, sənin başqa adın yoxdur?

Miskin Abdala dərhal hər şey aydın oldu. Dedi:

– Xanım, əvvəlki adım Hüseyn idi. Sonralar Miskin Abdal oldu. Bunun da sirri var.

Gülçöhrə artıq bildi ki, bu həmin adamdır. O, sevincək axırıncı sualını verdi:

– Aşıq, Təbrizə nə məqsədlə gəlibsən?

– Butamın dalınca.

– Sənin yarın kimdir?

– Xanım, bunu dil ilə desəm, dilim yanar. İcazə ver, sazla deyim.

– Buyur, de.

Miskin Abdal sazı köynəyindən çıxarıb, zilini-zil, bəmini-bəm sinəsinə müstəkəm eləyib, görək, Təbrizə nə məqsədlə gəldiyini necə bəyan elədi:

Göyçəliyəm, Təbrizdədir,
Namus, qeyrət, arım mənim.
Bir sənəmə bənd olmuşam,
Sənubərdir yarım mənim.

Qurban ərənlər pirinə,
Kim yetər onun sirrinə?
Gəlmişəm yarın şəhrinə,
Sənubərdir yarım mənim.

Odur eşqimin əzəli,
Abdaldır dərdindən dəli.
Təbrizin türfə gözəli,
Sənubərdir yarım mənim.

Bunu eşidən Gülçöhrə çox sevindi. Buraya nə məqsədlə gəldiyini açıb danışdı. Miskin Abdal ilə Qasım çox şad oldular. Uzun Qasım biləndə ki, Gülçöhrə subay qızdır, bir gözucu ona baxdı. Onun alovlu-odlu baxışları Gülçöhrənin gözündən yayınmadı. Gülçöhrənin yanaqları Təbrizin tər laləri kimi allandı. Miskin Abdal bunu o saat duydu. O, üzünü Qasıma tutub, zarafatyana dedi:

– Qasım, deyəsən, sənin də işin düzələcək. Allah, deyəsən, sənə də bir qapı açacaq.

Bayaqdan dil-dil ötən Gülçöhrə utana-utana dedi:

– Yol gəlibsiniz, yorğunsunuz. Gedəyin, bizdə dincəlin. Mən Sənubər xanıma xəbərə qaçım.

O, qonaqları evə gətirdi. Atası İsmayıl kişi, anası Gülnisə, qardaşı Mədəd qonaqlara «xoş gəldin» elədilər. Süfrə açdılar, çay-çörək qoydular. Qonaqlar yeyib-içib, rahatlanandan sonra söhbətə başladılar. Hamı mətləbdən hali oldu.

Gülçöhrənin atası İsmayıl kişi dedi:

– Bala, vallah, indiyə kimi Gülçöhrə bu barədə bizə heç nə deməyib. Xoş gəlib, səfa gətiribsiniz. Allah qoysa, muradınıza da çatarsınız.

Bunlar burada söz-söhbətdə olsun. Görək, Gülçöhrə neylədi? O, vaxt itirmədən, dabanına tüpürüb, üz tutdu Sənubərgilə tərəf. Sənubər küləfirəngidə durub, həsrət-həsrət yollara baxırdı. Bir də gördü ki, budur, Gülçöhrə qan-tər içində onlara tərəf gəlir. Bildi ki, bir şad xəbər var. İstədi, qabağına çıxsın. Bu dəmdə Gülçöhrə qapını açıb, içəri girdi. Tövşəyə-tövşəyə dedi:

– Dinlə, Sənubər! İndi də mən deyim, sən eşit!

Bunu deyib, gərdənindən üç tel ayırıb, sinəsinə basdı, aldı, görək, nə dedi:

Eşit, deyim, ay Sənubər,
Bağçalardan barın gəldi.
Gül, ay bacım, bəxtin gülüb,
Muştuluq ver, yarın gəldi.

Aldı Sənubər:
O dillərə canım qurban,
Muştuluğun gözüm üstə.
Xəbərinə canım qurban,
Muştuluğun gözüm üstə.

Aldı Gülçöhrə:
Ona nüsrət verən Haqqdır,
Bu dünyada tayı yoxdur.
Qaşlar kaman, kirpik oxdur,
Muştuluq ver, yarın gəldi.

Aldı Sənubər:
Elə demə, nəzər dəyər,
Qürrələnər, özün öyər,

Dediklərin düzsə, əyər,
Muştuluğun gözüm üstə.

Aldı Gülçöhrə:
Gülçöhrənin halına bax,
Dur, boynuma hamayıl tax.
Daha dərdi, qəmi burax,
Muştuluq ver, yarın gəldi.

Aldı Sənubər:
Sənubərəm, haqdır yolum,
Bir qönçəyəm, necə solum!?.
Dillərinə qurban olum,
Muştuluğun gözüm üstə.

Söz tamama yetər-yetməz, sevindiklərindən hər ikisi bir-birinə sarmaşıq kimi sarılıb, göz yaşı axıtdılar. Gülçöhrə gördüklərinin, eşitdiklərinin hamısını bircə-bircə Sənubərə danışdı. Sənubərin rəngi gül kimi açıldı. Gülçöhrəni bir də bağrına basıb, üzündən-gözündən öpdü. Sonra da aparıb, onun boğazından bir həmayıl asdı. Gülçöhrə, əvvəlcə, götürmək istəmədi. Gördü ki, yox, Sənubərin xətrinə dəyir, həmayılı açmayıb, dedi:

– Xanım, Allah qoysa, sən tezliklə Göyçə ellərinə gəlin gedəcəksən. Bu həmayıl da səndən mənə əziz bir xatirə qalar. Qoxunu ondan alaram.

Sənubər zarafatyana dedi:

– Elə şey yoxdur, ay qız. Demişəm, yenə də deyirəm, səni də özümlə aparacağam. Özün demirsənmi, Miskin Abdal ilə gələn oğlan da yaxşı oğlandır? Ay qız, bəlkə, elə o da sənin qismətindir.

Gülçöhrə gülümsəyib, çiynini çəkdi. Sənubər bir az fikirləşib, dedi:

– Gülçöhrə, bilirəm, Miskin Abdal indi görüşmək üçün bərk darıxır. De ki, çox tələsməsin. Ehtiyat igidin yaraşığıdır. Bizi istəməyən çoxdur. Atamın da necə adam olduğunu yaxşı bilirsən. Əvvəlcə, Miskin Abdalgilə öz həndəvərinizdə bir ev kirayələ. Bilirəm, qabaqda bizi hələ çətin günlər gözləyir. Bu işi düzəltsə, Allah düzəldəcək. İstəmirəm ki, atam sizinlə düşmən ola. Atam İsfahana bu gün yola düşüb. Bir aya, ancaq, qayıdar. O gələnə kimi bildiyimizi eləyərik. Gələndən sonra, Allaha pənah, görək, nə məsləhət görür.

Gülçöhrə dedi:

– Baş üstə, xanım! Düz buyurursan. Ağıllı sözə nə deyə bilərəm. Elə bilirəm ki, bu tədbir Miskin Abdalın da xoşuna gələcək.

Sənubər dedi:

– Təki, sən deyən olsun!

Gülçöhrə gəlib, gördü ki, evlərində bir çal-çağır var ki, gəl görəsən. Eşidən qohum-qonşular aşığın başına toplaşıblar. Miskin Abdal da ki, Sənubərin eşqindən yorğunluğunu yadından çıxarıb, elə həvəslə çalıb-oxuyur ki, daha nə deyim. Gülçöhrə də çəkilib, bir tərəfdə dayanıb, aşığa qulaq asmağa başladı. Amma arabir gözü Qasımın gözünə sataşanda hiss eləyirdi ki, Miskin Abdalın dostu da, deyəsən, Təbrizdən əliboş qayıtmaq istəmir.

Məclisə yığışanların çoxusu cavan idi. Söhbətin şirin yerində bir ağsaqqal üzünü Miskin Abdala tutub, dedi:

– Aşıq, cavan olsan da, görürəm ağıllı, kamallı oğlansan. Sözlərinin hamısı nəsihətdir. Sazının, sözünün işığına yığılanların da çoxusu, görürsən ki, cavanlardır. Onlara deyiləsi bir sözün varmı?

Miskin Abdal dedi:

– Bacardığımdan bir-iki kəlmə deyərəm.

Aldı Miskin Abdal, görək, nə dedi:

Namərd ilə yoldaş olma,
Çox bəlalar çəkər başın.
Halal ilə ərsəyə çat,
Daş qalalar sökər başın.

Xain baxma Yaradana,
Qibləgahdır ata-ana.
Arxalanma bəyə, xana,
Qoy sağ olsun nökər başm.

Haqqdan istə bəxti-iqbal,
Yaradanı yadına sal.
Söz gövhərdir, Miskin Abdal,
Saxla dürrdür, tökər başın.

Söz Miskin Abdalın ağzından qurtarmamış hər yandan "Sağ ol, aşıq!" sədaları göyə ucaldı. Sabah tezdəndən çalmağa-çağırmağa başlayan aşıq, bir də baxdı ki, axşam düşüb, şər qarışıb.

İsmayıl kişi üzünü gələnlərə tutub, dedi:

– Aşıq çox uzaqdan yol gəlib. Səhərdən da oxuyur. Yorğundur. İmkan verək, dincəlsin. Oxuduğu daha bəsdir.

Hamı razılaşdı, hərə öz evinə dağılışdı. Evdə bir özləri qalanda, Gülçöhrə bu xoş xəbəri Sənubərə necə çatdırdığını, onun Miskin Abdala ismarıcını söylədi. Bu tədbir hamının xoşuna gəldi. Sabahdan Miskin Abdalgilin qalması üçün ev behlədilər. Həmin ev Gülçöhrəgilin evinin yaxınlığında yaşayan bir qadının evi idi.

Sabahdan Miskin Abdal ilə Qasım qarının evində yaşamağa başladı. Artıq bilirdilər ki, hələ nə az, nə çox, düz, bir ay buralıdırlar. Sonrasını da Allah bilir. İndi qalırdı, bir-birindən gizli odlara yanan iki aşiq-məşuqun görüşməsi. Bu görüşdən heç kim xəbər tutmamalı idi. Çünki, Sövdəgər Mahmud bunu bilsəydi, qan dizə çıxardı.

Miskin Abdal Sənubər xanımın həsrətindən alışıb-yanırdı. Çox götür-qoydan sonra bir namə yazıb, Gülçöhrə ilə göndərdi Sənubər xanıma.

Miskin Abdal namədə yazırdı:

Bir gözəlin sorağıyla,
Dağlar keçdim, düzə gəldim,
Neçə-neçə bələn aşdım,
Yar elinə, sizə gəldim.

Dərd azalıb, qəm azalıb,
Gözüm yollarında qalıb.
Yarmı nəzərindən salıb,
Yoxsa, ay qız, gözə gəldim?

Dərd ağlatdı, qəmə güldüm,
Çeşmimin yaşını sildim.
Abdalam, vəfadar bildim,
Gəldim yar, Təbrizə gəldim.

Sənubər naməni oxuyub, çox qübarlandı. Dərdi artıb, bir ümmana döndü. Həsrətlə yolunu gözlədiyi yarının görüşünə gedə bilməməsi qəlbinə dağ üstündən dağlar çəkdi. Yar dərdinə çarə, məlhəm olmaq istəyərkən, yar tənəsinə tuş olmaq qəlbini göynətdi,

ruhunu sızım-sızım sızıldatdı. Öz-özünə dedi: "Axı, mən yarımın həsrətinə ondan az yanmamışam. Niyə o, mənim çəkdiklərimi duya bilmir? Gəl, kim olduğunu ona bir nişan ver". Qələmi əlinə alıb, yara yazdığı namədə, görək, öz dərdini söz ilə necə izhar elədi. Biz deyək, siz də şad olasınız:

Qəm üstündə köklənmişəm,
Çalınmamış bir sazam mən.
Yar həsrəti qəddim əyib,
Nalə dolu avazam mən.

Dərd sinəmdə düzüm-düzüm,
Bu sitəmə necə dözüm?
Yar yolunda qalıb gözüm,
Gözü yaşlı bir qızam mən.

Baxma günün üç-beşinə,
Sazını da sıx döşünə,
Tez gəl yarın görüşünə,
Gül ətirli bir yazam mən.

Bağça-bağdan yol keçəndə,
Azmamışam duman-çəndə,
Adım bəlli el içində,
Nurlu Ayam, ulduzam mən.

Sənubərəm, bu çağıma,
Özünü çatdır bağıma.
Gəl, qədəm bas otağıma,
Burda sənsiz yalqızam mən.

Miskin Abdal bu naməni oxuyub, çox şad oldu. Gülçöhrə də Sənubər xanımın dediyinin hamısını bircə-bircə Miskin Abdala danışdı.

Miskin Abdal səhəri diri gözlü açdı. Durub, yollara baxanda gördü ki, Sənubər bir bölük qızla sallana-sallana onlara tərəf gəlir. Onu görəndə, elə bil, Miskin Abdalın ürəyi qopub, ayağının altına düşdü. Onun sevgilisi bu qızların arasında on dörd günlük bir Ay parçasına oxşayırdı. Ya Rəbb, belə gözəllikmi olar, Sən buna veribsən?! Huri də, pəri də, mələk də bunun yanında olsaydı, utandığından qaçıb, gizlənməzdimi?!

Miskin Abdalın eşqi cuşa gəldi. Sazı sinəsinə basıb, görək, öz sevgilisinin boyunu necə öydü:

Asta yeri, a gözəllər sultanı,
Həsrətindən cavan canım çürüdü.
Qara gözlər saldı məni bəndinə,
Siyah zülfün zəncirində sürüdü.

O qamətə, o camala vuruldum,
Bir bulağam, bulanmışdım, duruldum,
Ah çəkməkdən, axır, bezdim, yoruldum.
Qəm dalğası dörd yanımı bürüdü.

Utanmazmı görən mənə gülənlər?
Bu eşqimi, bu dərdimi bilənlər.
Belə deyər, bir vaxt məni görənlər:
Miskin Abdal bir zamanlar pir idi.

Sənubər onun yanıqlı-yanıqlı oxumağına dözə bilməyib, uzaqdan-uzağa ona bir qıyğacı nəzər salıb, gülümsədi. Sonra

Gülçöhrənin boynunu qucaqlayıb, qulağına dedi:

– Bu gün axşamdan bir az keçmiş gələrsiniz. Yolunuzu səbirsizliklə gözləyirəm.

Gülçöhrə dedi:

– Xanım, Miskin Abdalın yanındakı oğlan da gəlsinmi?

Sənubər zarafatla dedi:

– Ay qız, o oğlan gündə sənin yanında deyilmi? Bu qaçaqaçda onu neyləyirsən? Siz də bizim kimi bir-birinizə tamarzı ha deyilsiniz?

Gülçöhrə nəsə demək istədi. Sənubər onun sözünü ağzında qoydu:

– Zarafat öz yerində. Qasım mütləq gəlməlidir. Çünki, onu Miskin Abdalın yanına elə-belə qatmayıblar. Onlar hər yerdə bir olmalıdır. Demək olmaz, gecə itə, qurda rast gələrsiniz. Kömək yaxşı şeydir.

Axırda da, – Ay qız, deyəsən, ikimizin də toyumuz bir olacaq! – deyib, Gülçöhrədən yüngül bir burma götürdü.

Vədə vaxtında görüşə gələndə Miskin Abdal gördü ki, ay Allah, elə bil, otaqda Gün doğub. Sənubər də baxıb, gördü ki, doğrudan da, Miskin Abdal canlara dəyən oğlandır. Boy onda, buxun onda. Üzündən-gözündən də ağıl, kamal yağır. Hörüklərini saz eləyib, görək, yarına necə «xoş gəldin» elədi:

Qədəm qoyub yar yanına,
Oğlan, xoş gəldin, xoş gəldin,
Eşq oduna yana-yana,
Oğlan, xoş gəldin, xoş gəldin.

Aldı Miskin Abdal:
Tək Allahdan arzum buydu,
Ay qız, xoş gördük, xoş gördük.
Yar həsrəti qəlbim oydu,
Ay qız, xoş gördük, xoş gördük.

Aldı Sənubər:
Sənsiz qara keçdi günüm,
Ərşə qalxdı ahım, ünüm.
Duruban, başına dönüm.
Oğlan, xoş gəldin, xoş gəldin.

Aldı Miskin Abdal:
Yollar yorub, əzginəm mən,
Əhd-peymana düzgünəm mən.
Yar yolunda üzgünəm mən,
Ay qız, xoş gördük, xoş gördük

Aldı Sənubər:
Gül-çiçəkli yar bağına,
Bər-bəzəkli otağına,
Sənubərin bu çağına,
Oğlan xoş gəldin, xoş gəldin.

Aldı Miskin Abdal:
O ləblərdən süzüldü bal,
Dur, qolunu boynuma sal.
Qıyma, ölsün Miskin Abdal,
Ay qız, xoş gördük, xoş gördük.

Bu çal-çağıra yuxudan ayılan Səlbinaz xanım bayaqdan qızı ilə oğlanın deyişməsinə qulaq asırdı. Elə ki, söz tamama yetdi, Sənubər qolunu Miskin Abdalın boynuna salmaq istəyəndə, otağın qapısı açıldı, anası içəri girdi. Hamı donub, yerində qaldı. Ancaq Səlbinaz xanım qızının taleyini pozmaq fikrində deyildi. Baxdı ki, doğrudan da, qızının butası canlara dəyən oğlandır. Ağzından da dürr tökülür. Lakin özünü o yerə qoymadı. Oğlanı bərkə-boşa çəkib, sınamaq üçün əlini sinəsinə qoyub, görək, nə dedi:

Ağır daşdan yapışıbsan,
Bu sevdadan əl çək, oğlan.
Yaman həddini aşıbsan,
Bu sevdadan əl çək, oğlan.

Aldı Miskin Abdal:
Tanrı verib bu qisməti,
Bu sevdadan əl çəkmərəm.
Satmaq olmaz məhəbbəti,
Bu sevdadan əl çəkmərəm.

Aldı Səlbinaz xanım:
Mahmud bilsə, dara çəkər,
Anan-bacın qan-yaş tökər,
Yurdunuzda, bil, turp əkər,
Bu sevdadan əl çək, oğlan.

Aldı Miskin Abdal:
Qorxutmayır məni inan,
Nə ölümlər, nə də zindan.

Butamı verib Yaradan,
Bu sevdadan əl çəkmərəm.

Aldı Səlbinaz xanım:
Səlbinazı salma cəngə,
Əlindən gələrsən təngə.
Neyləyərsən ac pələngə?
Bu sevdadan əl çək, oğlan.

Aldı Miskin Abdal:
Abdal deyər, bir ac şirəm,
Alov saçan bir şəmşirəm.
Dünyamızı dəyişərəm,
Bu sevdadan əl çəkmərəm.

Səlbinaz xanım gördü ki, yox, Miskin Abdal sözünə bütöv oğlandır. Üzünü Haqqa tutub, onlara xeyir-dua verdi:

– Ümidinizi Haqqa bağlayın, Haqqın ətəyindən tutun. Mahmud çətin adamdır. İnanmıram ki, bu işə razı olsun. Amma Tanrı nə yazıbsa, o da qismət olacaq, balalarım!

“Allaha pənah!“ – deyib, öz otağına keçdi. Aşiq-məşuqlar da gecənin yarısınacan öz çalıb-çağırmaqlarında, kef-damaqlarında oldular.

Xülasə, Miskin Abdal, Qasım və Gülçöhrə hər gecə bura gəlir, yeyir, içir, deyib-gülür, çalıb-oxuyur, səhərə yaxın evlərinə qayıdırdılar. Miskin Abdal bir az çimir alandan sonra Uzun Qasımı da yanına alıb, şəhərə gəzməyə çıxırdı. Hər yerdə onu hörmətlə qarşılayırdılar. Miskin Abdal da gücü çatan qədər saz çalar, söz çağırar, adamların könlünü şadlandırardı. Hər nə qədər çalıb-oxusa da, heç kəsdən pul götürməzdi. Bir aya yaxın idi ki,

Miskin Abdal Təbrizdə idi. Bu müddətdə o özünə o qədər dost, tanış tapmışdı ki, gəl görəsən. Adamlar onu bir saat görməyəndə darıxırdılar. Miskin Abdalın Sənubərə olan məhəbbəti də dildə, ağızda gəzirdi. Hamı bu haqq aşığından danışırdı. Hamının əlləri göydə idi: "Allah bu iki aşiq-məşuqun bir-birinə qovuşması üçün İlan Mahmudun ürəyinə rəhm salsın".

Varına, dövlətinə görə İlan Mahmudla qohum olmağa can atanlar, bir də Sənubərin gözəlliyinə vurulanlar Miskin Abdala paxıllıq eləyirdilər. Onlar çalışırdılar ki, Miskin Abdalı aradan götürsünlər. Ancaq mümkün olmurdu. Çünki, Miskin Abdalın dostu, yarı, yoldaşı çox idi. İstəməyəni də cəmisi bir neçə nəfər idi.

Bəzirgan Qeysərin oğlu Cümşüd bu xəbərdən sonra vurnuxmağa başladı. Dedi: "Ayə, elə şey olar, yerli olam, dədəmin adını bir qatar dəvə çəkməyə, varımız-halımız dünyadan aşa, bir Göyçəli gədəsi gəlib, sənin istədiyin qızı əlindən ala". Bir gün o yaxşı bir xonça hazırladı. Yox olsun yoxsulluğu. Xonçada nələr yox idi... Xonça qızıldan, gümüşdən od tutub, yanırdı. Cümşüd qaranlıq qarışanda xonçasını da götürüb, Sənubərgilə adaxlıbazlığa getdi.

Baxdı, həyət-bacada heç kəs yoxdur. Amma Sənubər xanımın otağının pəncərələrindən işıq gəlirdi. Bir az da irəli gedəndə oxumaq səsi eşitdi. Öz-özünə sevindi. Dedi ki, yəqin, Sənubər xanım mənim dərdimdən belə yanıqlı-yanıqlı oxuyur. Tez ora-bura vurnuxub, bir nərdivan tapdı. Gecənin qaranlığında nərdivanın sınıq olduğunu görmədi. Nərdivanın başını divara dirəyib, xonça əlində, pəncərəyə qalxdı. Nə görsə, yaxşıdır?! Gözləri bərələ qaldı. Əlləri əsməyə, dizləri titrəməyə başladı. Şəhərdəki aşıq ilə Sənubər xanım bir kefdə idi, bir kefdə idi ki, gəl görəsən. Miskin Abdal başını qoyub Sənubərin dizinin

üstünə. Sənubər də onun saçını sığallayır. Həm də deyişirlər. Qeyri-ixtiyari: "Öl, ay Cümşüd, öl, gözlərin nələr görür!" – demişdi ki, nərdivan Cümşüdün ayağının altından çıxdı. Cümşüd tappatapla, səs-küylə yerə yıxıldı. Xonça da yerə düşüb, dağıldı. Səsə Sənubərgil eşiyə çıxdılar. Bir kişi xeylağının barını aşdığını gördülər. Gülçöhrə onu Cümşüdə oxşatdı.

Aşiqlərin kefinə soğan doğrandı. Əhvalları bir anda pozuldu. Onlar bu işdən çox pərişan oldular. Sənubər xanım dedi:

– Tez gedin, hələlik bu yerlərdə görünməyin. Görək, başımıza nələr gələcək.

Qonaqlar dərhal çıxıb, getdilər. Sənubər də yatağına uzandı. İlan vuran yatdı, ancaq o yatmadı. Səhər tezdən durub, pəncərənin altına dağılmış xonçanı də tər-təmiz yığışdırdı ki, qonşulardan görüb-eləyən olmasın. Miskin Abdal ilə Qasım da bu hadisədən çox narahat oldular. Səbirsizliklə bu işin sonunu gözləməyə başladılar.

Bunları burada qəm dəryasında qoyaq, görək, Cümşüd neylədi?.. O, gecə yıxılanda ayağının birini əzmişdi. Birtəhər sürünə-sürünə gecəyarı gəlib, evlərinə çıxdı. Canının ağrısından çox, gördükləri onu sabaha qədər yatmağa qoymadı. Sabah tezdən Bəzirgan Qeysər oğlunun ayağını çəkdiyini görüb, nə olduğunu soruşdu. Cümşüd də heç nəyi danmadı. Gördüklərinin də üstünə bir az artırıb, hamısını atasına danışdı. Atası bu işdən kədərlənsə də, özünü o yerə qoymayıb, dedi:

– Bala, eybi yoxdur. Cavanlıqda hər şey olar. Sənubər də cavandır. Bu işi heç harada açıb-ağartmaq lazım deyil. Sənubər Sövdəgərin yeganə züryətidir. Elə eləyək ki, onun bir elə varı, dövləti başqasına qismət olmasın. Qəlbini qaralama. Qız ağacı, qoz ağacı, yüzü atar, biri vurar, – deyiblər. Bu işi mən özüm yoluna qoyacağam.

Cümşüd də ki, biqeyrətin biri idi. Atasının dediklərinə canla, başla razı oldu.

Miskin Abdal gözlədi. Bir gün keçdi, iki gün keçdi, üç gün keçdi. Ancaq o gecəki əhvalatdan bir səs-soraq çıxmadı. Bir az rahatlandı. Sənubər də buna çox sevindi. Bilmədilər ki, onların dadına yetən hiyləgər Qeysərin tamahkarlığıdır.

Bəzirgan Qeysər öz-özünə çox götür-qoy elədi, çox düşündü. Axırda, belə qərara gəldi ki, Sövdəgər Mahmud gələn kimi bu işi qurtarsın. Elə, bu arada xəbər gəldi ki, Sövdəgər Mahmud gəlir. Qeysər oğlunu da götürüb, onun pişvazına çıxdı. Mahmud bundan çox xoşhal oldu. Evdə gecə yarıyacan oradan-buradan söhbət elədilər. İlan Mahmud uzaq yoldan gəlib, yorulmuşdu. Hamı dağılışdı. O da uzanıb, yatdı.

O biri axşam Bəzirgan yenə gəldi. Bir xeyli söhbətdən sonra mətləbi açdı. Dedi:

– Mahmud, Allahın adına şükür ki, səfərdən sağ-salamat qayıdıb, gəldin. Əhdimiz əhd, sözümüz sözdür. Qız Cümşüdündür.

Mahmud dedi:

– O nə sözdür, deyirsən. Kişidə söz bir olar. Toya hazırlaş.

Qeysər dedi:

– Dost, bir iş var, iki əməl. Sən gedəndən sonra Göyçə tərəflərdən buraya bir cavan aşıq gəlib çıxıb. Şəhərə yayılıb ki, onu buraya Sənubərin eşqi gətirib, haqq aşığıdır. Deyilənə görə, guya qoca bir dərviş yuxularında onlara eşq badəsi içirib, onları bir-birinə buta verib.

Bunu eşidən Mahmudu od götürdü, nə götürdü. Cin atına mindi. Ağzı köpüklənə-köpüklənə dedi:

– Mən gədə deyiləm ki, hər yoldan ötənə qız verəm. Onun başına bir oyun açaram ki, yarandığına peşman olar.

Qeysər dedi:

– Mahmud, hirsini boğ, səbrli ol. Bu hərəkət bizi el içində hörmətdən salar. Ehtiyatlı olmaq lazımdır. Birdən, doğrudan da, haqq aşığı olar. Bir şey eləyib, Allahın qəzəbinə gələrik. Əlimizdə də xeyir işimiz var. Demək olmaz, işin içindən iş çıxar.

Mahmud acıqlı-acıqlı:

– Nə deyirsən? Demək istəyirsən ki, çağırım bu yoldan ötəni, gədənin birini, deyim ki, ay haqq aşığı, gəl, Sövdəgər Mahmudun qızı, dünya gözəli Sənubəri al apar, get Göyçəyə? Yox, Qeysər, mən haqq aşığı-zad tanımıram. Onu yox eləyəcəyəm.

Qeysər əlini onun çiyninə qoyub, dedi:

– Mahmud, bir tədbir fikirləşmişəm. Gəl, elə eləyək ki, nə şiş yansın, nə kabab.

Mahmud dedi:

– De görüm, nə deyirsən?

Qeysər:

– Aşığı çağırtdır yanına. De ki, mənim sənə veriləsi qızım yoxdur. Eşitməsə, de ki, şəhərdən çıxıb getsin. Buna da razı olmasa, saldır zindana. Toydan sonra, iş-işdən keçəndən sonra buraxarsan, çıxıb gedər öz dağılmışına.

Mahmud bığının altından qımışıb, dedi:

– Bu, lap ağıllı məsləhət oldu.

Sövdəgər Mahmud tez qoldan zorlu, ağıldan kəm iki pəzəvəng tapıb, Miskin Abdalın dalınca göndərdi. Yolda gördülər ki, aşıq da, yoldaşı da Sövdəgər Mahmudgilə tərəf gedirlər. Mahmudun adamları bu işə mat-məəttəl qaldılar. Aşığı da, onun yoldaşını da götürüb, Sövdəgər Mahmudun yanına gətirdilər. Miskin Abdal salam verdi. Mahmud onun salamını almayıb, acıqlı-acıqlı dedi:

– Gədənin biri, gədə. Bilirsənmi, kimə sataşırsan? Səni qurda-quşa yem eləyərəm, ananı mələr qoyaram. Başın bədənindən üzülməmiş, rədd ol şəhərdən.

Miskin Abdal təmkinini pozmadan dedi:

– Sövdəgər Mahmud, mən ölümdən qorxsaydım, bu neçə ayda yollar yorğunu olub, anamı gözü yaşlı qoymazdım. Mən Sənubərin yolunda ölməyə gəlmişəm. İxtiyar sahibisən, sən bilərsən. İstəyirsən, məni, lap tikə-tikə doğra. Mən haqq aşığıyam.

İlan Mahmudun gözləri çıxdı kəlləsinə. Əlini atdı qılınca ki, durub, onun boynunu vursun. Qeysər onun ayağından basdı. Tez Qeysərin dediyi onun yadına düşdü. Qışqırdı:

– Aparın, bu yetim-yesirləri atın zindana!

Miskin Abdal baxıb, gördü ki, doğrudan da, İlan Mahmuddur ki, oturub yerində. Sənubəri də ona heç vaxt verməyəcək. Öz-özünə fıkirləşdi ki, ölmək-ölməkdir, xırıldamaq nə kişilikdir. Allah kərimdir, gəl ürəyini, dillə dediyin kimi, sazla-sözlə də boşalt, axırda nə olar-olar. Ona görə də dedi:

– Sövdəgər Mahmud, ixtiyar sahibisən, özün bilən yaxşıdır, ancaq ürəyimə bir qatar söz gəlib, onu deyim, sonra da nə bilirsən, onu da eləyərsən.

Miskin Abdal bunu deyib, icazəsiz-filansız sazı köynəyindən çıxarıb, basdı sinəsinə. Qeysər də bir yandan Mahmudun bir yanını yağır etmişdi ki, səbrli ol. Mahmud da onu eşidib, Miskin Abdalı rüsvay etmək istəmədi, işin hələ axırını gözlədi.

Aldı Miskin Abdal, görək, İlan Mahmuda nə dedi:

Eşq badəsin ol ağamdan alınca,
Leysan olub, yağa-yağa gəlmişəm.
Gecə-gündüz öz butamın dalınca,
Gəzə-gəzə bu torpağa gəlmişəm.

İlan Mahmud gördü ki, yox, yaman paza ilişib. Bu, elə, dediyindən dönmür ki, dönmür. Acıqlı-acıqlı dedi:

– Ayə, tez ol, sözünü qurtar, rədd ol gözümün qabağından. Hələ, bunun özünə bax, sözünə bax! Gör bir, adı hər yerdə bəlli olan Mahmuda bu göyçəli gədəsi qəzəl oxuyur.

Miskin Abdal dedi:

– Sövdəgər Mahmud, eşit sözümün o biri xanəsini:

Çox insafın qırılıbdır qaytanı,
Yerə-göyə sığışmayır böhtanı,
Mərdi-məzar, aravuran şeytanı,
Günah yoldan qaytarmağa gəlmişəm.

Mahmud ucadan istehza ilə gülüb, dedi:

– Paho, bilməmişdik, bir göyçəli gədəsi gəlibmiş ki, şeytanı yolundan qaytarsın. Amma heç özünü düşdüyü pis yoldan qaytarmaq istəmir. Dünyanın işinə bir bax, ha!

Miskin Abdal aldı sözün o biri xanəsini:

Dərd içimi oyur-oyur oyurdu,
Bu mətləbi Haqqın özü buyurdu,
Xoşluq ilə verməsələr bu yurdu,
Məhvərindən qoparmağa gəlmişəm.

Bunu eşidəndə İlan Mahmud cin atına minmədimi? Dedi:

– Adə, gədənin biri gədə, özün qərib ola-ola, buralarda nə örüş-örkən açıbsan. Sənin başına bir oyun açaram ki, gəldiyin yolu tərsinə gedərsən, sədanı heç quşlar da bilməz. Qanmaz-qanmaz az danış. Tez ol, sözünü qurtar. Rədd ol buralardan, bir də gözüm səni görməsin.

İlan Mahmudun "qanmaz" sözü Miskin Abdala yaman toxundu. Aldı, görək, Sövdəgərə cavabında nə dedi:

Bu dünyada Yaradanı anmazı,
Od içində buza dönüb, yanmazı,
Nanəcibi, yaramazı, qanmazı,
Davar bilib, otarmağa gəlmişəm.

Bunu eşidəndə İlan Mahmudu od götürdü, nə götürdü. Hirsindən dodağını çeynədi. İstədi, durub, Miskin Abdalın dərsini versin, Qeysər yenə də qoymadı. Əlacsız qalan Mahmud Miskin Abdalın üstünə bağırıb, dedi:

– Göyçəli gədəsi, sözünə sərhədd qoy və müxtəsər eylə. İndi səni yaxşı qandıracağam. Onda bilərsən ki, qanan kimdir, qanmaz kimdir.

Miskin Abdal aldı, görək, sözünün tapşırmasını necə dedi, biz də eşidək, şad olaq:

Miskin Abdal olsun yara sadağa,
Məhəbbətə Haqqdan yoxdur qadağa,
Göyçəmizdən Təbriz adlı torpağa,
Sənubəri aparmağa gəlmişəm.

Söz Miskin Abdalın ağzından çıxanda İlan Mahmud düz ərş evinə kimi cızım-cızım yanıb, cızmağı çıxdı. Bağıra-bağıra dedi:

– Aparın məlunları, salın zindana!

Şəhərə xəbər yayıldı ki, bəs, deməzsənmi, İlan Mahmud haqq aşığını da, onun yoldaşını da zindana saldırıb. Eşidənlərin hamısı məyus oldu. Nə eləmək olardı? Ümid Haqqa qalmışdı.

Bunu bilən Səlbinaz xanım getdi ki, görsün, qızının halı

necədir. Baxdı ki, qızı gözünün yeddi yerindən yaş tökür. Elə bil, leysan yağış yağırdı. Anasını görəndə Sənubər daha da kövrəldi. Səlbinaz xanımın boynuna sarılıb, hönkür-hönkür ağladı. Anası buna dözə bilməyib, hörüklərini sinəsinə basıb, görək, qızına necə təsəlli verdi, qızı öz dərdini anasına necə izhar elədi:

Bu nə haldır, bu nə ündür?
Ağlama, qızım, ağlama!
De, çəkdiyin bu nə gündür?
Ağlama, qızını, ağlama!

Aldı Sənubər:
Abdalım dustaq olubdu,
Ağlaram, ana, ağlaram!
Gülüm-çiçəyim solubdu,
Ağlaram, ana, ağlaram!

Aldı Səlbinaz:
Tanrı qoymaz səni naçar,
Bir bağlayan, bir də açar.
Günəş doğar, zülmət qaçar,
Ağlama, qızım, ağlama!

Aldı Sənubər:
Bu dərdimin yox çarası,
Getməz könlümün qarası.
Sızıldar eşqin yarası,
Ağlaram, ana, ağlaram!

Aldı Səlbinaz:
Səlbinaz da deyər belə,
Ərənlərdən imdad dilə,
Göz yaşın döndərmə selə,
Ağlama, qızım, ağlama!

Aldı Sənubər:
Sənubərin yox imdadı,
Dillərdə dolaşır adı.
Oda saldım dostu, yadı,
Ağlaram, ana, ağlaram!

Ana-bala ağlamaqda, İlan Mahmud ilə Bəzirgan Qeysər də toya tədarükdə olsunlar. Görək, zindanda Miskin Abdal ilə Qasımın başına nələr gəldi?

Onların hər ikisini gətirib, atdılar qaranlıq, kif basmış zirzəmiyə. Qərib yer, qaranlıq zindan. Bir yandan yarından ayrılması, bir yandan da bu zülmlər, bu sitəmlər qəlbini şan-şan elədi. Qəlbi kövrələn Miskin Abdal aldı, görək, ürəyindən keçənləri necə dilə gətirdi:

Neçə gündür dustağam mən,
Gedənim yox, gələnim yox.
Vətənsiz, elsiz qəribəm,
Göz yaşımı silənim yox.

Mərd ölsə, namərd gülərmiş,
Göz yaşın kimlər silərmiş.
Dərdi dərd çəkən bilərmiş,
Nə çəkirəm, bilənim yox.

Abdal eldən düşdü iraq,
Ömür oldu varaq-varaq.
Yardan mənə gəlməz soraq,
Ağlayanım, gülənim yox.

Miskin Abdal çox düşündü, daşındı. Ağlına çox şeylər gəldi. Birdən yadına düşdü ki, payız girib, qabaqdan qış gəlir. Hələ, əli nə yara yetişib, nə də bir yana çatıb. Bu sevdaya düşdüyündən az qala bir il keçir. Hələ, bu zindanda nə qədər qalacağı da məlum deyil. Kim bilir, hələ, hansı müsibətlərlə qarşılaşacaq. Bu fikirlər, bu çək-çevirlər içində dərdi tüğyan elədi. Telli sazı sinəsinə sıxıb, aldı, görək, nə dedi:

Tərs düşüb fələyin işi,
Lil basan arxdımı, nədi?
Bu nə dünya, bu nə gərdiş,
Dolanan çarxdımı, nədi?

Qalanıb küfrün kürəsi,
Yanırsan gözüm görəsi.
Tutulub yanı-yörəsi,
Bir bilən yoxdumu, nədi?

Miskin Abdal, işin xata,
Ünün gedib, ərşə çata.
Səbəb nəydi, – baxtım yata?
Bu, görən baxtdımı, nədi?

Miskin Abdal burada qəmli-qəmli çalıb-oxumaqda, Sənubər də orada dərddən saralıb-solmaqda olsun, görək, Bəzirgan

Qeysər neylədi? O, kələyinin baş tutduğunu görüb, tez-tələsik toya hazırlaşdı. Elçi getdi. Qızın atasından "hə"sini aldı. Nişan göndərdi. Sənubər atasının qorxusundan dinə bilmədi. Üzüyü götürdüsə, barmağına taxmadı. Ümidi Haqqda, Miskin Abdalın yolunu gözlədi.

Elə ki, toy tədarükü görüldü, toyun vaxtı müəyyənləşdirildi, Sənubərin dərdi birə-beş artdı. İstədi, özünü öldürsün, səbr gəldi. Anası bilib, qızını o ki var, danladı. "Hər saatın bir hökmü var"– dedi. Anası onu öz südünə and içdirdi ki, bu fikrindən əl çəksin. Sənubər anasına dedi:

– Ana, sənə qurban olum. Eybi yoxdur, səbr eləyərəm. Görək, hələ, nə olur. Gərdəyin dalına qədər gözləyəcəyəm. Cümşüd kimi biqeyrətə qismət ola bilmərəm. Mənim öz istəklim var, Ağam özü məni ona buta verib. Ondan qeyrisinin əli mənim əlimə dəyə bilməz.

Anası çar-naçar razı oldu.

Toya başlamağa hələ bir neçə gün var idi. Bir gecə İlan Mahmud yuxuda gördü ki, bir qoca dərviş ona yaxınlaşıb, dedi:

– Miskin Abdalı da, yoldaşını da dustaqlıqdan azad elə. Yoxsa, gözlərini oyaram.

O, əlini Mahmudun gözlərinə uzadanda, Mahmud qorxusundan yuxudan dik atıldı. Sübhə kimi ilan vuran yatdı, ancaq İlan Mahmud yatmadı. Qorxusundan arvadı da ondan nə olduğunu soruşmadı. O gün axşama kimi Mahmud qaşqabaqlı gəzdi. Ancaq qocanın dediyinə əməl eləmədi. İkinci gecə yenə həmin yuxu təkrar olundu. Mahmud yenə deyiləni eləmədi. Üçüncü gecə Mahmudun gözünə təzəcə yuxu getmişdi ki, birdən hövlank qışqırıb, yuxudan ayıldı. Elə bil, boğulurdu. Gözlərinin altında və boğazında barmaq izləri var idi. Bunları Səlbinaz xanım da gördü. Ərinə su verdi. İlan Mahmud bir az toxdadı.

Handan-hana özünə gəldi. Güclə ayağa qalxıb, eşiyə çıxdı. Adam göndərib, iri heyvərə pəhləvanları çağırtdırıb, dedi:

– Gedərsiniz, o zindandakı Göyçə yetim-yesirlərini çıxarıb, şəhərin kənarındakı meşəliyə apararsınız. İkisini də öldürüb, qanlı köynəklərini mənə gətirərsiniz. Sizi dünya malından qane eləyəcəyəm.

Cəlladların ikisi də bir ağızdan dedilər:

– Baş üstə, ağa. Onları, elə bu gün cəhənnəmə vasil eləyərik.

Cəlladlar zindana yaxınlaşanda gördülər ki, ağlamaq səsi gəlir. Qulaq asıb, gördülər ki, aşıq oxuyur:

Guşə-guşə yanıb, nara yaxıldım,
Cismim od-atəşə qalanıb, gedər.
İmtahan eyləyir könlüm şəhrini?
Eşqi-Haqqdan qeyri talanıb, gedər.

Dərviş olan getməz fitnə-feliynən,
Yandırar şamını o, öz əliynən,
Yalan peymanıynan, haça diliynən,
Könül yar yolunda allanıb, gedər.

Qeylü-qaldır səhər-axşam əhvalım,
Tor görər gözlərim, qarışar halım.
Qanlı çeşmi yazıq Miskin Abdalın,
Coşqun çaya nisbət sellənib, gedər.

Aşığın belə oxuması cəlladların qəlbini bir azca yumşaltdı. Ancaq deyiləni eləməliydilər. Qapını açanda gördülər ki, doğrudan da, ikisi də canlara dəyən oğlanlardır. Ancaq nə fayda? Gecə ikən hər ikisini götürüb, şəhərin qırağındakı meşəyə apardılar.

Miskin Abdala hər şey aydın oldu. Üzünü cəlladlara tutub, dedi:

– İcazə verin, bizi öldürməmişdən qabaq bir-neçə kəlmə deyim.

Onların qəlbi bir az da yumşaldı. Dedilər:

–Buyur, de.

Aldı Miskin Abdal:

Aman cəllad, zalım cəllad,
Mənə qıyın, Qasıma yox.
Qalmayıbdır halım, cəllad,
Mənə qıyın, Qasıma yox.

Qərib ölsəm, qəbrim itər,
Üstümdə ot, qanqal bitər!
Zülüm olmaz bundan betər,
Mənə qıyın, Qasıma yox!

Sızıldayır qanlı yaram,
Yar yanında günahkaram.
Onsuz mənə ömür haram,
Mənə qıyın, Qasıma yox!

Su içəni ilan çalmaz,
Belə zülüm, zillət olmaz.
Bu nahaq qan yerdə qalmaz,
Mənə qıyın, Qasıma yox!

Abdal deyər, yana-yana,
Haqq özü çəkər divana.
Nahaqdan düşməyin qana.
Mənə qıyın, Qasıma yox!

Söz tamama yetdi. Cəlladların bunları öldürməyə əlləri gəlmədi. Gördülər ki, bu yazıqların günahı yoxdur. Özü də, bu, doğrudan da, haqq aşığıdır. Tanrıdan onların qəlbinə rəhm gəldi. Cəlladların biri o birinə dedi:

– Gəl, bunları buraxaq. Köynəklərini alıb, meşədə dovşandan-zaddan vurub, qanına bulayaq, aparıb, verək İlan Mahmuda. Belə oğulları da öldürmək olarmı?! Bu qanı Allah heç kəsə bağışlamaz. İlan Mahmudun zatı-pakına, yeddi arxa dönəninə Allah lənət eləsin.

Dedilər:

– Soyunub, alt köynəklərinizi bizə verin. Sonra da kir-kirimişcə çıxıb, buralardan gedin. İlan Mahmudun bir də əlinə keçsəniz, tək sizin yox, bizim də dərimizə saman təpəcək.

Miskin Abdal ilə Qasım can köynəklərini çıxarıb, cəlladlara verdilər. Bir də gördülər ki, Miskin Abdalın yanında bir cüt dovşan dayanıb. Adamdan da pəsinib eləmir. Cəlladlar bu işə mat-məəttəl qaldılar. Bunları öldürmədiklərinə görə çox sevindilər. Anladılar ki, bu aşıq Allah-Təalanın pənahındadır.

Cəlladlar dovşanı öldürüb, qanını köynəklərə bulayıb, şəhərə yola düşməkdə olsunlar. Görək, Miskin Abdal ilə Qasımın başına nələr gəldi.

Miskin Abdal belə məsləhət gördü ki, bu gecə gedib, başlarına gələnləri Gülçöhrəyə danışsın. Onu da desin ki, biz Qaçaq Mehdinin yanına gedirik. Allah qoysa, yaxın vaxtlarda hər şey yaxşı olacaq.

Belə də elədilər. Gecə ikən ikisi də yola düşdülər. Bir neçə gündən sonra onlar gəlib, Qaçaq Mehdi ilə görüşdükləri yerə çatdılar. Xoşbəxtlikdən Qaçaq Mehdi də, yoldaşlarından bir neçəsi də burada idi. Xoş-beş, on-beşdən sonra Miskin Abdal başlarına gələnləri birər-birər uşaqlara danışdı. Gördülər ki, heç,

bunlarda hal qalmayıb.

Qaçaq Mehdi dedi:

– Eybi yoxdur, Allaha şükr ki, sağ-salamatsınız. Bundan sonra mən bilərəm, İlan Mahmud bilər. Ona bir toy tutacağam ki, dadı ömrü boyu damağından getməyəcək.

Sonra uşaqlara tapşırdı ki, Miskin Abdal ilə Qasımı aparıb, rahatlasınlar.

Qaçaq Mehdi adam göndərib, öyrəndi ki, İlan Mahmud qızının toyuna başlayıb. Toy qırx gün çəkəcək. Toyun qurtaracağı günü də öyrəndilər.

İlan Mahmudun da, Bəzirgan Qeysərin də əli vurub, ayağı oynayırdı. Elə bilirdilər ki, göyçəli aşıqdan canlarını qurtarıblar. Sənubərə də xəbər çatmışdı ki, darıxıb-eləməsin. Toyun qırxıncı günü yanında hazırıq.

Sənubərin kefinin ala buludda olması atasını yamanca sevindirirdi. O elə bilirdi ki, qızı Miskin Abdalı daha yadından çıxardıb. Axı, hardan biləydi ki, o Allahın qəzəbinə tuş gəlib. Qaçaq Mehdini onun hüzuruna göndərir.

Əlqərəz, toy başladı, nə başladı. Otuz doqquz gün yeyib-içib, çalıb-oynadılar. Qırxıncı gün gəcavə bəzəndi, atlar nəmərə durdu. Sənubər xanımı mindirdilər gəcavəyə. Bir azdan istədilər ki, gəcavəni bəy evinə tərəf sürsünlər. Sənubər xanımın gözləri yolda, qulağı səsdə idi. Gəcavə təzəcə yerindən tərpənmək istəyirdi ki, bir hay-küy qopdu ki, gəl görəsən. Əli siyirmə qılınclı oğlanlar toyu dövrəyə aldılar. Camaat çaş-baş qalmışdı. Toy adamları karıxmışdı. Sənubər gəcavənin bir tərəfindən baxıb, gələnlərin arasında Miskin Abdalı da, Qasımı da gördü. Ürəyi yerinə gəldi.

Sarı köhlənin belində boylu-buxunlu bir pəhləvan gəcavənin qabağını kəsib, dedi:

– Haradadır bəy? Çıxsın ortalığa. Bəylə güləşmək istəyən

var. El var, adəti var.

İlan Mahmud da, Bəzirgan Qeysər də çaş-baş qalmışdılar. Bu, nə idi başlarına gəldi? Bəy kimlə güləşməlidir?

Qaçaq Mehdi dedi:

– Bəy güləşə çıxmalıdır. Sənubərə çatmaq üçün qabiliyyətini göstərməlidir. Kim qalib gəlsə, Sənubər xanım onun olmalıdır.

Hövsələdən çıxmış İlan Mahmud üzünü pəhləvana tutub, dedi:

– Sən kimsən, nə karəsən? Haranın dələduzusan? Rədd ol buradan...

Qaçaq Mehdi təmkinini pozmadan dedi:

– İlan Mahmud, məni sonra tanıyarsan. Çox qalmayıb. Bəy meydana çıxsın.

Əlacsız qalan Cümşüd ortalığa çıxdı. Onsuz da onun güləşməyə halımı var idi? Cümşüdlə güləşə Miskin Abdal çıxdı. Qırx gün idi ki, Miskin Abdal yeyib-içib, dağlarda gəzirdi. Kökəlib, qüvvətlənmişdi. Ona görə də əlini atan kimi Cümşüdü başının üstünə qaldırıb, arxası üstə yerə vurdu. Yerdən toz qalxdı. Cümşüd qalxıb, üstü toz-torpaq aradan çıxdı. Rüsvay olan Mahmud acığından Qaçaq Mehdinin üstünə cumdu. İlan Mahmud hara, Qaçaq Mehdi hara. «Atalar yaxşı deyib ki, ilan ulduz görməsə ölməz! İndi tanı, mən kiməm. Qaçaq Mehdini tanımırsansa, indi tanıyarsan!» – deyib, bir əli ilə onun boğazından tutub, havaya qaldırdı, o biri əlindəki qılıncı endirmək istəyəndə, Sənubər xanım gəcavədən çıxıb, bərkdən qışqırdı və yalvardı ki, atasını öldürməsin.

Qızını görən İlan Mahmudun "Ləçər!!!" sözünü deməyi ilə qılıncın enməyi bir oldu. Qılınc onu ikiyə böldü.

Qaçaq Mehdi üzünü camaata tutub, dedi:

– Toy davam eləyir. Miskin Abdal ilə Sənubər xanımın,

Qasım ilə Gülçöhrənin toylarını burada eləyəcəyik. Kəbinləri Göyçədə kəsilər. Allah mübarək eləsin!

Təzədən burada yeddi gün, yeddi gecə toy oldu. Səkkizinci gecə gəcavə üz tutdu Qaçaq Mehdi bulağına tərəf. Sənubərin anası Səlbinazı da, Gülçöhrənin qardaşı Mədədi də götürdülər. Səlbinaz xanım öz ev-eşiyini Gülçöhrənin ata-anasına tapşırdı.

Qaçaq Mehdi gəcavəni öz obasına gətirdi. Burada da yeddi gün, yeddi gecə çal-çağır oldu. Səkkizinci gün ilk dəfə görüşdükləri bulağın başına gəldilər. Ayrılıq vaxtı idi. Qaçaq Mehdinin ürəyindən keçdi ki, Miskin Abdalı bu qədər xəta-bəladan qurtardım, butasına qovuşdurdum, neçə yerdə toy çaldırdım, hələ mənim haqqımda bir kəlmə də söz deməyib. Elə bil, Miskin Abdal Qaçaq Mehdinin ürəyindən keçənləri eşitdi. Sazını köynəyindən çıxara-çıxara dedi:

– Mehdi qağa, sən mənə atadan, anadan, doğma qardaşdan artıq hörmət elədin. Sənin qoçaqlığından, mərdliyindən, kişiliyindən söz açmasam, dilim alışar, ürəyim od tutub, yanar.

Aldı Miskin Abdal:

Düşmənlərə gözdağıdır,
Bir bəladır Qaçaq Mehdi.
Əl çatmayan bir zirvədir,
Bir qaladır Qaçaq Mehdi.

Haqsızlığa qılınc çalıb,
Çörək verib, süfrə salıb.
Dərsini pünhandan alıb,
Haqq ilədir Qaçaq Mehdi.

Uca olsun daim baxtı,
Yana çevrilməsin taxtı.
Coşub-daşan bir bulaqdı,
Dağ selidir Qaçaq Mehdi.

Əğyar qıranda belimi,
Naşı dərəndə gülümü,
Daşlı, kəsəkli yolumu
Gül elədi Qaçaq Mehdi.

Kişilikdə yoxdur tayı,
Mərd yaşamaq olub payı,
Abdala var haqqı-sayı,
Qoç dəlidir Qaçaq Mehdi.

Söz tamama yetişdi, qucaqlaşıb, öpüşdülər. Bir-biri ilə əhd-peyman bağladılar, bir-birilərinə baval yüklədilər.

Qaçaq Mehdi uşaqlardan bir neçəsini onlara qoşub, tapşırdı ki, gəcavəni Naxçıvan torpaqlarına qədər ötürüb, sonra qayıtsınlar.

Gəcavə dağlar aşıb, dərələrdən keçib, yarım aya Naxçıvana çatdı. İsgəndər bəy də burada bir toy başladı, gəl görəsən. Bir neçə gündən sonra Gülçöhrənin qardaşı Mədəd ilə İsgəndər bəyin qızı Yasəmənin bir-birinə aşiq olması xəbəri hər yerə yayıldı. İsgəndər bəy Miskin Abdalın elçiliyinə “yox“ demədi. Toy-toya qarışdı. Yeddi gün, yeddi gecə toy çalındı. Bir neçə gün də burada qalandan sonra gəcavələr yola düzəldi. İsgəndər bəyin oğlu Qəhrəman, gəlini Məsumə, Göyçə həsrətində olan neçə-neçə qohum-əqraba gedənlərə qoşuldu. Gethaget, gethaget, gəlib, Dərələyəz ellərinə yetişdilər. Soraqlaşıb, Cəvahiri

tapdılar. Ötən payız Cəvahirlə Lətifin də toyu olmuşdu. Öpüşüb, görüşdülər. Bir-biriləri ilə hal-əhval tutdular. Başlarına gələnləri danışdılar. Bir neçə gün də çal-çağır, şadyanalıq keçirildi. Sonra gəcavə yenə yola düzəldi. Cəvahir ilə Lətif də toy adamlarına qoşuldular. Yazın axırına gəlib, Dərəçiçəyə çatdılar. Miskin Abdal əhdinə xilaf çıxmadı. Gəcavəni sürdürdü Meydanəli kişinin qapısına. Meydanəli kişi tez gəmi ilə Göyçənin Zərgərli kəndinə, Miskin Abdalın atasına xəbər göndərdi ki, oğlu sağ-salamat qayıdıb, gəlir.

Şənliyin beşinci günü Məhəmməd kişi, başında da xeyli adam gəlib, çıxdılar. İki gün də çal-çağır davam elədi. Sonra gəcavə Zərgərliyə yola düşdü. Dərəçiçəkdən də xeyli adam toy gəcavəsinə qoşuldu.

Dərəçiçəkdən Zərgərliyə bir həftəyə getmək olardı. Ancaq Göyçə gölünün sol sahilindən uzanan yolun üstündə elə bir kənd, elə bir oba olmadı ki, gəcavəni, heç olmasa, bir gün saxlayıb, şadlıq keçirib, toy çaldırmasınlar. Qərəz, Dərəçiçəkdən çıxan gəcavə qırxbeş gündən sonra Zərgərliyə gəlib, çatdı. Növrəstə il yarım ayrılıqdan sonra oğlunun və gəlininin ayaqlarına süründü, torpaq yaladı. Allaha dualar elədi. Gəcavənin qabağında öyəclər, burmanclar, cöngələr kəsildi. Bir toy, bir şadlıq, bir şadyanalıq başladı ki, gəl görəsən. Düz qırx gün, qırx gecə qara zurnanın səsi dağı-daşı lərzəyə gətirdi. Aşıqların sinələrindəki sədəfli sazlar dil-dil ötdü. Miskin Abdal ilə Sənubər xanımın, Qasım ilə Gülçöhrənin kəbini kəsildi. Mədədlə Yasəmənin kəbini Təbrizə niyyət olundu.

Toyun axırıncı günü aşıq sədəfli sazını sinəsinə basıb, bu duvaqqapma ilə toya öz xeyir-duasını verdi:

Bir belə gözəl sənəmin,
Özünə qurban olasan.
Dindirib, danışdırıb,
Sözünə qurban olasan.

Camalı mahi-təban,
Üzünə qurban olasan.
Süzülüb, nə xoş baxır,
Gözünə qurban olasan.
Nə əcəb, goftarı xoş,
Avazına qurban olasan!

Qız, sənin qoynun içi
Mixək, darçın, hil kimidi,
Tökülüb dal gərdənə,
Saçların sünbül kimidi.
Dəhanın şəhdi-şəkər,
Dodaqların bal kimidi.
Sinən qar, buxaq bəyaz,
Yanaqların gül kimidi.
Bülbülü-şeyda oluban,
Yazına qurban olasan!

Bircə, baxın bu gözələ,
Nə əcəb türfə çağıdı.
Məclisi məst eləyən,
Əlində kövsər sağıdı.
Sinəsi mərmər kimi,
Savalanın yaylığıdı.
Sonası pərvaz olub,

Şux tərlanın növrağıdı.
Göllərində ördəyinə,
Qazına qurban olasan!

Məhəmməd kəşt eləyib,
Bu cümlə-cahanı gəzib.
Gəncəni, Qarabağı,
Şəkini, Şirvanı gəzib.
Xoy nədi, Salmas, Marağa,
Təbrizi, Tehranı gəzib.
Arayıb, axtarıban,
Mülki-Süleymanı gəzib.
Bir belə şux gözəlin,
Nazına qurban olasan!

# «MİSKİN ABDAL VƏ ŞAH İSMAYIL» DASTANI

## USTADNAMƏ

Nələr gördüm, kəşt elədim dünyanı;
Hər bir işin qeylü-qalı varıymış.
Yaxşı günün olurmuşsa yamanı,
Yaman günün yaxşı halı varıymış.

Haqq sözə gərəkdi düz qiymət olsun,
Qiyməti verməyə mərifət olsun.
İnsanda insanlıq, səxavət olsun,
Neylərəm ki, cah-calalı varıymış.

Qayım ağa, niyə fikrə dalırsan?
Yoxsa ki, özündən hesab alırsan,
Sayılmaz mehmana keçə salırsan,
Saydığın qonağa xalı varıymış.

Çox gəzmişəm, az görmüşəm danəndə,
Deməliyəm sözün yeri gələndə.
İnsan üzün görməyəsən dönəndə,
Açılanda xoş camalı varıymış.

Ataş alıb çox da yanma, Ələsgər,
Sənətində heç usanma, Ələsgər.
Öz-özünə qubarlanma, Ələsgər,
Dünyanın Urustam-Zalı varıymış.

Ustadlar ustadnaməni bir deməz, iki deyər. Biz də deyək, iki olsun, dostlarımız sevinsin, düşmənlərimiz paxıllıqdan çatlayıb, ölsünlər:

Qafil könül, bu nə yoldu, tutubsan,
Sərf edirsən nə kamaldı dünyada?!
Dövlətə qul olub, gül tək açılma,
Çox sənin tək güllər soldu dünyada.

Kibridən qəlbində bərkitmə barı,
Top dəyər, dağılar bürcü, hasarı.
Yüz sənin tək ahu gəzən şahmarı
Fələk kəməndinə saldı dünyada.

Guşumda sırğadı, sinəmdə dağdı;
Ağıllı unutmaz neçə ki, sağdı,
Dövlətdən qismətin beş arşın ağdı,
Çəkdiyin qovğadı, qaldı dünyada.

Fələk bərhəm edib çox nizamları,
Zülm ilə söndürüb yanan şamları,
Hayıf, cavanların gül əndamları,
Mara, mura qismət oldu dünyada!

Yığılar məxluqat, qurular məhşər,
Boyunlarda kəfən, əllərdə dəftər.
Onda vay halına, yazıq Ələsgər
Özün getdin, sözün qaldı dünyada!

Ustadlar ustadnaməni iki deməz, üç deyər. Biz də deyək, üç olsun, dostlarımız şad, düşmənlərimiz naşad olsunlar:

Arif məclisində bir söz söylərəm,
Nə hədyan, nə çaşqın, nə qələt olmaz.
Nütfədən pak olan, loxmadan halal,
Mərifət elminə nabələd olmaz.

Bir haqq söz söylərəm, ariflər qanar,
Müxənnətlər etdiyindən utanar.
Varlıqda dost olma, yoxluqda – kənar,
“İgidəm“ deyəndə bu adət olmaz.

O dünyanı, bu dünyanı gözləyən,
Həm sabahı, həm üsyanı gözləyən,
Namus qədri bilib, nanı gözləyən,
İnşallah, hər yerdə xəcalət olmaz.

Bu şəxsi sənəti istəmək ola,
Səxavət eyləməz, hatəm tey ola,
Dövlət tapa, gədalıqdan bəy ola,
Başı ərşə çıxsa, ədalət olmaz.

Ələsgər, mətləbin Xudadan istə,
Kərəm olmaz müxənnəsdə, nakəsdə.
Bəylik, göylük, səylik olan məclisdə,
Qaç ki, orda xeyir-bərəkət olmaz.

Hə, mənim əzizlərim, sizə haradan söyləyim, kimdən deyim, əyyami-qədimdən bu yana adı dillər əzbəri olan Göyçə mahalın-

da doğulub, boya-başa çatan, ağlının, kamalının böyüklüyü ilə ad-san qazanan, Allahın izni ilə, misilsiz kəraməti ilə müqəddəsliyə qovuşan, Ərənlərdən Haqq vergisini alıb, söz xəzinəsinin xiridarına çevrilən Miskin Abdaldan...

Elə ki, Miskin Abdal öz butasına yetişdi, sevgilisi Sənubər xanımı Təbrizdən Göyçə mahalına, doğma kəndi Zərgərliyə (Sarıyaquba) gətirib çıxartdı, başladı xoş ömür-gün sürməyə. Evlənəndən sonra da bir-birilərini elə sevirdilər ki, elə bil, əsl Leyli-Məcnun idilər. Bir-birilərindən bir gün də olsa ayrı dura bilmirdilər. Sənubər ev işləri, həyət-baca ilə məşğul olur, Miskin Abdal da əkin, biçin, mal-qaraya baxır, axşamlar öz telli sazını sinəsinin üstünə alıb, bir-birilərindən gözəl, şirin havalar çalardı. Çox vaxt bu axşamlara qohum-qonşular, tanış-bilişlər də toplaşardı. Hələ sazın sorağına uzaq ellərdən gəlib, qulaq kəsilənlər də var idi. Miskin Abdalın sazlı-sözlü gecələri elə maraqlı, elə şirin keçərdi ki, bəzən vaxtın necə keçib getdiyini bilmirdilər. Bir də görərdilər ki, xoruzlar banlayır, dan yeri sökülür. Miskin Abdalın oxuduğu sözlər ürəklərə məlhəm, çaldığı havalar könüllərə hərarət gətirərdi.

O, yavaş-yavaş başladı özündən saz havaları qoşmağa. İlk qoşduğu saz havasının adını "Sənubəri" qoydu. Az keçmədi "Abdalı" saz havasını da yaratdı, ona tay kimi. Bu saz havalarında təbii bir gözəllik, doğmalıq, şirinlik var idi ki... Sonralar o gün olmazdı ki, o, bu saz havalarını, heç olmazsa bir dəfə çalmamış olmasın. Gözəl saz çalmağı, söz qoşmağı onun adını mahaldan-mahala salmışdı. Hər yerdə onun bu hünərindən ağızdolusu danışırdılar. Heç yerdə buna bənzər bir sənətkarın olmadığını indi hamı təsdiq eləyirdi. Əlqərəz, Miskin Abdalın gününə gün, dövranına dövran, hörmətinə hörmət çatmazdı. Adı-sanı hər tərəfə səs salmışdı. Bunlardan lovğalanmayan Miskin Abdal rahatlıq

nə olduğunu bilmir, sazdan-sözdən, bir an da olsun, uzaqlaşmırdı. Sazın-sözün şöhrətini hər gün el-el, oba-oba yayırdı. Artıq telli sazın sədaları uzaq-uzaq yerlərdən gəlirdi.

O, bəzən Göyçədən çıxır, həftələrlə evə qayıtmırdı. Məqsədi, məramı təkcə sazın-sözün sirrini ellərə çatdırmaq deyildi. O, həm də ulu babası Yaqubdan üzü bu yana nəsil-nəsil təbliğ edilən dini məzhəbin böyüklüyünü, müqəddəsliyini dünyaya yaymaqla məşğul idi. Miskin Abdal elə şirin, elə gözəl danışırdı ki, eşidənlər onun bir sözünü iki eləmirdilər. Miskin Abdal nə danışırdısa, hamısından böyük bir hikmət, böyük bir məna süzülürdü.

Belə səfərlərdə Sənubər nə qədər darıxsa da, Miskin Abdala mane olmurdu. Çünki, o da Miskin Abdalın Haqqa doğru uzanan müqəddəs yolunun yolçusu olmuşdu. Bu yoldan onu döndərmək mümkün deyildi. Buna heç ehtiyac da yox idi. Axı, o öz ulularının müqəddəs yolunu yaşatmaq üçün bu dünyaya gəlmişdi.

Bir gün Miskin Abdal yenə də bir neçə günlüyə hara isə getməli oldu. O axşamdan yol tədarükü gördü. Telli sazını Sənubərin tikdiyi qırmızı köynəyə saldı. Toy gərdəyinin yanından asdı. O gecə, elə bil, yuxusu ərşə çəkilmişdi. Sənubərin halı onunkundan da betər idi. Həmişə axşamdan yuxuya gedən Miskin Abdal bu gecə çox gec yatdı. Bunu görən Sənubər soruşdu:

– Abdal, bu gecə sənə nə olub?

Miskin Abdal:

– Heç nə, Sənubər, bilmirəm, nədənsə yuxum qaçıb.

Sənubər:

– Abdal, naxoş-zad deyilsən ki?

Miskin Abdal:

– Yox, yox. Narahat olma. İndicə yuxuya gedəcəyəm.

Doğrudan da, bir azdan sonra ikisi də yuxuya getdi. Həmin gecə onlar yuxularını bərk qatdılar. Demə, bu onların son gecəsi imiş. Miskin Abdal aləmi-röyada gördü ki, gözəl bir çəmənlikdə bardaş qurub, oturub, nahar eləyir. Qəflətən havada qara bir bulud göründü. Buludun içindən qəflətən bir qara quş şığıyıb, Abdalın qabağındakı süfrəni caynağına alıb, havaya qalxdı. Uça-uça gedib, həmin buluda girdi. Bir anın içində buludların qoynunda gözdən itdi.

Bu işə mat-məəttəl qalan Abdal hövlnak yuxudan ayıldı. Gözlərini dolandırıb, Sənubərin üzünə baxdı. Gördü ki, Sənubərin üzündə müdhiş bir solğunluq, böyük bir təşviş, vahimə var.

Demə ki, Sənubər də yuxusunu qatıbmış. O da yuxuda görür ki, Abdal ilə səfərə çıxıb. Hər yan gül-gülüstandır. Quşların cəh-cəhi, bülbüllərin avazı aləmi başına götürüb. Dörd yanda bir gözəllik var ki, gəl görəsən. Birdən-birə göy üzündən qopan qara bir bulud hər tərəfi zil qaranlığa bürüdü. Sənubər bu qara dumanın içində qarıxdı. Nə qədər döyündüsə, Miskin Abdalı görə bilmədi. Ucadan bir neçə dəfə “Abdal! Abdal!” – deyə, qışqırdı. Özü öz səsinə yuxudan ayıldı.

Bu qəribə haraydan Miskin Abdal da diksindi. O, solğun yanan çırağın piltəsinə əl atdı. Çıraq evi işıqlandırdı. Sənubəri haraylayıb, nə baş verdiyini soruşdu. Sənubər Miskin Abdalı görən kimi özündən asılı olmayaraq, onu bərk-bərk qucaqladı. Miskin Abdal tez Sənubərə bir parç su verdi. O suyu içib, toxtadı. Miskin Abdal soruşdu:

– Sənubər, sənə nə oldu?

Sənubər:

– Heç nə.

Miskin Abdal:

– Niyə belə qışqırırdın?

Sənubər:

– Yuxuda səni itirmişdim...

O başladı, gördüyü yuxunu həyəcanla Miskin Abdala danışmağa. Danışdıqca bədəni titim-titim titrəyirdi. Miskin Abdal öz yuxusunu Sənubərə danışmadı. Onu dilə tutdu, toxtaqlıq verdi. Nə qədər dil tökdüsə, gördü ki, heç bir xeyri yoxdur. Sənubərin halı özündə deyil. Gözləri bahar buludu kimi dolub. Çırtıq vursan qanı tökülər...

Dan yeri təzəcə sökülürdü. Miskin Abdalın yadına sabahkı səfəri düşdü. Sənubəri belə görüb, heç bilmədi, neyləsin. Odla su arasında qalmışdı. Sənubəri bu vəziyyətdə görən Miskin Abdal sazını sinəsinə basıb, aldı, görək, Sənubərə nə dedi, biz də nə eşitdik:

Ahu gözlüm, niyə məlul baxırsan,
Bu sevdaya, bu səfərə gedimmi?
Ürəyimi yandırıban, yaxırsan,
Bu sevdaya, bu səfərə gedimmi?

Sənubər saçından üç tel ayırıb, basdı sinəsinin üstünə, aldı, görək, Miskin Abdala nə cavab verdi:

Yollarına həsrət ilə baxıram,
Mehribanım, din-imanım, yaxşı yol,
Həm yanıram, həm odlara yaxıram,
Mehribanım, din-imanım, yaxşı yol.

Aldı Miskin Abdal:
Yar sevmişəm, muradıma çatmışam,
Yaman günü yaxşı günə qatmışam.

Mən bu gecə bir qıl üstə yatmışam,
Bu sevdaya, bu səfərə gedimmi?

Aldı Sənubər:
Heç bilmirəm, hara yozum yuxumu,
Yoxsa, fələk daşa vurur oxumu?!
Çiçəklərdən sən alarsan qoxumu,
Mehribanım, din-imanım, yaxşı yol.

Aldı Miskin Abdal:
Abdal deyər, bu yuxudan almıram,
Saz götürüb, pərdə-pərdə çalmıram.
Qalma dedin, səfərimdən qalmıram,
Bu sevdaya, bu səfərə gedimmi?

Aldı Sənubər:
Sənubərdən, de, aldınmı barı sən?
Qəlb evində yaşat dostu, yarı sən.
Arzum budur, İlahidən yarı sən,
Mehribanım, din-imanım, yaxşı yol.

Söz tamama yetdi. Miskin Abdal istədi ki, səfərə getməsin. Ancaq Sənubər razı olmadı ki, olmadı. Bu vaxt həyətdən Məhəmməd kişinin səsi eşidildi:

– A bala, hələ yatırsanmı?

Miskin Abdal dedi:

– Yox, qalxmışam, ay ata.

Məhəmməd kişi:

–Onda bir az çəpik ol. Yolçu yolda gərək.

Miskin Abdal:

– Bu saat hazır olaram.

Bir az sonra Miskin Abdal, dalınca da Sənubər həyətə çıxdılar. Gördülər ki, Məhəmməd kişi atı yəhərləyib, yüyənləyib, nə lazımdırsa, bir xurcuna doldurub, atın belinə çatıb. Sənubər gördü ki, Miskin Abdalın sazı yadından çıxıb, evdə qalıb. O cəld qayıdıb, sazı gətirdi. Həmişə atın belinə quş kimi sıçrayan Abdal bu dəfə yəhərə ağır-ağır qalxdı. Nə qədər çalışırdısa, gözlərini Sənubərdən çəkə bilmirdi. Sənubərin də gözləri dolmuşdu. Bunu görən Növrəstə dedi:

– Qızım, səfərə çıxanın dalınca su atarlar, ağlamazlar.

Qaynanasının bıı sözündən Sənubər bir az toxtadı, özünü ələ aldı. Gördü ki, doğrudan da, düz eləmir. Gülümsündü ki, Abdal nigaran getməsin. Bunu qaynatası Məhəmməd kişi də hiss elədi. Mehriban bir baxışla gəlinini süzüb, dedi:

– Qızım, Allah-Təala həmişə sizi bir-birinizə istəkli eləsin. Bir-birinizə gözünüz dolusu baxasınız.

Qaynatasına başı ilə razılığını bildirən Sənubər utandığından evə keçib, pəncərənin ağzından Abdal gedən yollara baxdı. Miskin Abdal da "Ya mədəd" – deyib, atının başını gedəcəyi səmtə döndərdi. Miskin Abdal gözdən itənə kimi atası Məhəmməd kişi, anası Növrəstə, bir də nigarançılıq içində qalan sevimli xanımı Sənubər onun arxasınca boylandılar...

O gün beləcə keçdi. Sabah açılanda gördülər ki, Növrəstə arvad azarlayıb, yerindən qalxası deyil. Ona görə də qalaqdan kərmə, təzək gətirib, təndiri qalamaq Sənubərin boynunda qaldı. O, qalağın balaca ağzından bədəninin yarısını içəri salıb, əlini atdı kərmələrə. Birini çəkdi, ikisini çəkdi, elə birini də çəkmək istəyəndə, qalaqdakı iri-iri kərmələr yuxarıdan uçdu Sənubərin başına. Huşunu itirən Sənubər özünü güclə eşiyə çıxara bildi. Çıxan kimi də tir-tap yıxıldı yerə. Elə bu yıxılmaqla da canını

tapşırmağı bir oldu.

Evdə ha gözlədilər, gəlin gəlmədi. Növrəstə ərinə dedi:

– Ay kişi, bir çıx, gör gəlinə nə oldu, axı, o bu qədər ləngiməzdi.

Məhəmməd kişi gedib, nə görsə yaxşıdır?!. Qalaq uçub Sənubərin başına. Sənubər də bu ilmi ölübsən, bildirmi!.. Bir vay-şüvən başladı ki, gəl görəsən. Qohum-qonşu, tanış-biliş hamısı bir su içimində Məhəmməd kişinin qapısına toplaşdılar. Saçını yolub, üzünü cıran kim, dil deyib, ağlayan, ağılar söyləyən kim... Allah heç kəsə belə müsibət göstərməsin. Bir vay-şüvən başladı ki, heç demə.

Kənd ağsaqqalları yığışıb, məsləhət elədilər ki, Miskin Abdal gəlməmiş Sənubəri dəfn eləməsinlər. Ona görə dərhal Miskin Abdalın dalınca bir atlı göndərdilər. Özünə də tapşırdılar ki, nəbadə, Sənubərin öldüyünü Miskin Abdala söyləyəsən. De ki, anan xəstələnib, səni arzulayır.

Bunlar burada qalsın, görək, atlı neylədi. O, atını qan-tər içində çapıb, Miskin Abdal olan məkana çatdı. Bu vaxt Miskin Abdal eşikdə durub, Göyçəyə sarı baxırdı. Bir də gördü ki, bir atlı ley kimi çapa-çapa ona tərəf gəlir. Miskin Abdalın sümükləri üşəndi. Bədənindən bir sızıltı, üşütmə keçdi. Bildi ki, bu atlı xeyirxəbərə oxşamır. Bir azdan Miskin Abdala dedilər ki, Göyçədən sənin dalınca gələn var. Görüşdülər. Miskin Abdal Sənubərin başında bir iş olub-olmadığını nə qədər soruşdusa, gələn adam hey dedi: "Anan xəstələnib, səni arzulayır".

Miskin Abdal da onun bu sözünə inanıb, dərhal Göyçəyə qayıtdı. Hələ, kəndə girməmiş uzaqdan gördü ki, kənddə bir vay-şivən var ki, gəl görəsən. Göyçədə adam qalmayıb, hamısı onların qapısına yığışıb. Miskin Abdal elə düşündü ki, yəqin anası rəhmətə gedib. Gələndə, gördü ki, yox, anası dil deyib,

ağlayır. İndi başa düşdü ki, ölən Sənubər imiş. Hamı Miskin Abdalı görüb, ona yol verdi. Miskin Abdal içəri keçib, gördü ki, iki gün əvvəl salamat qoyub getdiyi Sənubərinin cəsədini evin ortasına uzadıblar. Sənubər də, elə bil, ölməyib, yuxu yatır. Özü də, elə bil, bədirlənmiş Aydır.

Dünya Miskin Abdalın başına dolandı. Sinəsi para-para oldu. Qaynanası Səlbinazı tanımaq olmurdu. Qızının dərdindən üz-gözündə tutar-islahat yox idi. Tez-tez də huşunu itirirdi. Halı heç özündə deyildi. Ağlını az qala itirmişdi. Camaat bilmirdi, ölünü ağlasın, yoxsa, Sənubərin anası Səlbinazı sakitləşdirsin. Hamı Miskin Abdalın bu müsibəti necə qarşılayacağını gözləyirdi. Onsuz da Miskin Abdal bu günün böyük müsibətlərini bir neçə gün əvvəl yuxuda görmüşdü. Bir də ki, axı olacağa çarə yoxdur. Odur ki, bu dərdinin Haqqdan gəldiyini duyduğu üçün özünü tox apardı. Belə gəlib, belə gedən dünyanın vəfasızlığına öz giley-güzarını təzəcə yaratdığı "Göyçə şikəstəsi" saz havası üstündə aldı, görək, öz yaxınlarına, doğmalarına necə bəyan elədi:

Ay həzərat, ay camaat, ay ellər,
Könlüm quşu bir dilbəri itirdim.
Yasa batıb bağçadakı bülbüllər,
Bəxtim yatdı, canda səri itirdim.

Silinməyib toy gününün xınası,
Yarımçıqdır naxış-naxış xanası,
Gecə-gündüz mələr qaldı anası,
Ləldən baha bir gövhəri itirdim.

Könlüm evi viran oldu, talandı,
Korun-korun atəşlərə qalandı,
Çoxdan billəm, qoca dünya yalandı,
Dan ulduzlu, al səhəri itirdim.

Ay camalı dağ qarından ağıydı,
Ötən günlər ələ keçməz çağıydı,
Xəzan yeli toxunmamış bağıydı,
Bağça-bağı, bar-bəhəri itirdim.

Zülüm deyil, bu, zülümdən betərdi,
Ölüm deyil, bu ölümdən betərdi,
Miskin Abdal kimə desin bu dərdi,
Ahu gözlü Sənubəri itirdim.

Miskin Abdalın belə yanıqlı-yanıqlı çalıb-çağırması hamının qəlbini para-para elədi. Göz yaşları axıb, selə döndü. Nalədən, ağıdan, qışqırtıdan qulaqlar tutulurdu. Sinəsi sözlə dolu olan Miskin Abdal sazını sinəsinə bərk-bərk sıxıb, ürək dağlayan bir fəryadla öz dərdini-dilini, görək, necə bəyan elədi:

Ay həzərat, görün nədi,
Bir tuti-dildən ayrıldım.
Könlüm bağı viranədi,
Bülbüləm, güldən ayrıldım.

Müşk-ənbər qoxuluydu,
Şirin-şirin yuxuluydu,
Sözü şəkər, noğuluydu,
Saçı sünbüldən ayrıldım.

Sənubərsiz qalmadı hal,
Mənə həmdəm oldu məlal.
Cüda düşdü Miskin Abdal,
Obadan, eldən ayrıldım.

Miskin Abdal elə yanıqlı-yanıqlı çalıb-oxuyurdu ki, hamı züy-züyə gedirdi. El ağsaqqalları Miskin Abdala ürək-dirək verdilər. Ancaq kimə deyirsən, Miskin Abdal sızım-sızım sızıldayır, özündən asılı olmayaraq gözlərindən qanlı yaşlar axıdırdı. Sinəsi də boşalmaq bilmirdi. Miskin Abdal üzünü ağsaqqallara tutub, dedi:

– Siz Allah, qoyun sinəmi boşaldım. Bunu deyib, sazı sinəsinə sıxdı. Dodaqlarından qopan yanıqlı nalələr hamının göz yaşını selə döndərdi:

Qəfil ölüm gəldi, keçdi araya,
Yaman yerdə ahu-zarda qalmışam,
Qəm karvanı düzülübdü sıraya,
Çox çətində, yaman darda qalmışam.

Bir doyunca baş yastığa qoymadım,
Yerişindən, duruşundan doymadım,
Buyurmağa, çağırmağa qıymadım,
Zimistanda, boran-qarda qalmışam.

Miskin Abdal, hanı ötən vaxtlarım?..
Çiçəyindən perik düşdü baxt arım.
Heç bilmirəm, gedim harda axtarım?
Dünya boyda dar məzarda qalmışam.

Camaat gördü ki, yox, Miskin Abdal heç sakitləşənə oxşamır. Çar-naçar qalıb, düşdülər onun əl-ayağına ki, amanın bir günüdür, bir az səbr elə, bu camaata da yazığın gəlsin. Qoy barı, onlar bir az dincəlsinlər. Ömrün boyu, nə qədər istəsən, ağlayarsan.

Kimə deyirsən?! Sənubərin qəfil ölümü, elə bil, Miskin Abdalı havalandırmışdı. Dünyada gözünə heç nə görünmürdü. Dərdini, ününü kədər dolu sazına, sözünə, bir də göz yaşlarına vermişdi. O, sazı yenə basdı sinəsinə. Yanıqlı-yanıqlı elə bir "Göyçə şikəstəsi" çaldı ki, gəl görəsən. Sazın bu sızıltısına otların başı qıvrıldı, adamların başındakı tüklər biz-biz oldu. Miskin Abdal özündə, sözündə deyildi. Çala-çala başladı bir-birinin ardınca bayatıları zilə çəkməyə:

Mən aşıq, saza neylim?
Nəs gələn yaza neylim?
Öldü, qaldım zülümə,
Bu gəlin-qıza neylim?

Ağlaram, ağım ağlar,
Sol yanım, sağım ağlar,
Bülbüləm dar qəfəsdə,
Bağbansız bağım ağlar.

Təmizləyin axırı,
Tez qaytarın naxırı,
Bəlkə, gəlib çatıbdı
Bu dünyanın axırı.

Ağ suları sonalım,
Otağı zər xanalım,

Kimə dedi sözünü,
Barmaqları xınalım?

Teyim-teyim teylədim,
Bu qışı yaz eylədim.
Ayırdı yardan məni,
Bu fələyə neylədim?

Təbrizdən gələn gəlin,
Danışıb-gülən gəlin,
Əhdinə xilaf çıxdın,
Vədəsiz ölən gəlin.

Yer-göy qara dumandı,
Haqqa qalan gümandı,
Təbrizə xəbər verin,
Göyçədə ah-amandı.

Ovçular çıxır ova,
Gədikdə tapır yuva,
Maralından ayırar,
Ceyranı qova-qova.

Saza qara bağlaram,
Sinələri dağlaram,
Gecə-gündüz ah çəkib,
Zülüm-zülüm ağlaram.

Miskin Abdalın bu naləsinə qulaq asanların hamısı suya döndü. Atası Məhəmməd kişi gördü ki, yox, oğlu heç özündə deyil.

Belə getsə, Miskin Abdaldan da əli üzüləcək. Odur ki, qabağa yeridi, əlini oğlunun boynuna salıb, nə qədər dil tökdüsə, heç bir xeyri olmadı. Miskin Abdalın dilindən "Sənubər" kəlməsi düşmürdü. Oğlunu belə görəndə, ata ürəyi paralandı, göyüm-göyüm göynədi... Baxdı ki, Abdala elə-belə söz keçmir. Ona görə də üzünü oğluna tutub, aldı, görək, nə dedi:

Sənsən mənim nuri-didəm,
Ağlama, oğul, ağlama.
Gəl eyləmə mənə sitəm,
Ağlama, oğul, ağlama.

Aldı Miskin Abdal:
Dağılıbdı xanimanım,
Ağlaram, ata, ağlaram,
Nə qalır, nə çıxır canım,
Ağlaram, ata, ağlaram.

Aldı Məhəmməd kişi:
Bu nə ahdı, bu nə ündü,
Yanar çırağımız söndü,
Yaradanın üzü döndü,
Ağlama, oğul, ağlama.

Aldı Miskin Abdal:
Yar oduna qalanmışam,
Dolmamışdan calanmışam,
Torpaqlarda yalanmışam,
Ağlaram, ata, ağlaram.

Aldı Məhəmməd kişi:
Məhəmmədə etmə zülüm,
Bağlanıbdı gedər yolum,
Özüm sənə qurban olum,
Ağlama, oğul, ağlama.

Aldı Miskin Abdal:
Abdal deyər: ölüm haqdı,
Sənubərsiz həyat yoxdu,
Nə qədər ki, canım sağdı,
Ağlaram, ata, ağlaram.

Elə bil, bu sözlər Miskin Abdala bir balaca təsir elədi. O, ah-naləsinə ara verdi. Camaat əl-ayağa düşüb, Sənubərin cənazəsini kənd qəbristanlığına apardılar. Burada dağ-daş, yer-göy yenə də Miskin Abdalın başına dolandı. Gözlərinə qaranlıq çökdü. Gördü ki, bayaq, heç olmasa, Sənubərin cəsədinə baxa bilirdi. İndi qara torpaqlar onu da udacaq. Götürdü, görək, "Abdalı" saz havası ilə öz dərdini necə dilə gətirdi:

Gördüm yarım bir quş olub, uçubdu,
Haray çəkən, qəm ağlayan elim vay.
Bu dünyadan din-imanım köçübdü,
Gülşənimdə bülbül ağlar, gülüm, vay.

Sular axıb, doldurubdu çuxuru,
Hara gedir bu dünyanın axırı?
Heç açılmır fəndi-feli, paxırı,
Həftəm ağlar, ayım inlər, ilim, vay.

Eynim yaşı çıldır-çıldır süzülər,
Bu sitəmdən yazıq canım üzülər,
Kədər köçü sinəm üstə düzülər,
Gecə-gündüz ağı deyən dilim, vay.

Sədaqəti Haqqdan gələn pay idi,
Gözəlliyi Züleyxaya tay idi,
Abdal deyər, on dörd günlük Ay idi,
Sənubər tək ölüb gedən gəlin, vay.

Sözlərini axıra çatdırıb, Miskin Abdal bir az rahat oldu. Adamlar cənazəni torpağa endirəndə Sənubərin anası Səlbinaz, elə bir şivən, elə bir haray qopardı ki, az qaldı qulaqlar tutulsun. Bu harayı eşidən göydə uçan quşlar da, az qala, qanad saldılar. Ağılar dil açıb, yerə-göyə meydan oxudu:

İtən biryolluq itdi,
Əli xınalım getdi,
Fələyə neyləmişdim,
Sinəmi dağ-dağ etdi?.

Dünya gedir ha yana,
Bu ölüm bir bəhanə,
Bir ah çəksəm, qorxuram,
Od tutub, aləm yana.

Qanadsız quşam indi,
Möhnətə tuşam indi,
Bu dərdi kimə deyim?!
Dil bilməz daşam indi.

Səlbinaz bu sözləri güclə tamamlaya bildi. Dərin bir qəşş eləyib, tir-tap yerə yıxılıb, huşunu itirdi. Adamlar onu salaca ilə evə gətirdilər. Xeyli gözlədilər, üz-gözünə su çilədilər, Səlbinaz ayılmadı ki, ayılmadı. Gördülər, yox, bu heç dirilənə oxşamır. Qaldılar əl-ayaqda. Tez-tələsik yaxınlıqdan loğman-təbib çağırdılar. Loğman əlini Səlbinazın nəbzinə qoyub, dedi:

– Balam, bu adam diridən çox, ölüyə oxşayır. Onun ürəyinin heyi qalmayıb. Bundan sağalıb, adam olmaz. O, ancaq və ancaq bir-iki saat yaşaya bilər. Çünki, ürəyi para-para olub. Buna mən heç bir çarə eləyə bilmərəm.

Miskin Abdal loğmana yalvar-yaxar eləyib, dedi:

– Əgər sən qaynanamı sağaltsan, səni dünya malından qane eləyəcəyəm. Nə bacarırsan, əsirgəmə.

Loğman dedi:

– Bala, bildiklərimin hamısını elədim. Onu sağaltmaq mümkün deyil. Ancaq belə bir şey eləyərəm. Məndə bir dərman var, onu burnuna tutaram, ayılar. Bəlkə, deyəsi bir sözü-sabı var, onu deyər.

– Eybi yoxdur, heç olmasa, qoy vəsiyyətini eləyə bilsin. Bəlkə də, doğrudan da, ürəyində demədiyi bir sözü qalıb. Sonra da nə olar, olar.

Loğman cibindən bir dəstə ot çıxardı. Onu həvəngdəstədə un kimi əzdi, sonra bir çimdik gətirib, Səibinazın burnuna tutdu. Səlbinaz gözlərini açdı. Hamı buna sevindi. Gözləri ilə axtarıb, Miskin Abdalı tapdı. Əli ilə işarə elədi ki, yaxın gəlsin. Miskin Abdal özünü tox tutub, onun bərabərinə gəldi. Səlbinaz dili tutar-tutmaz dedi:

– Oğul, Allah bilir, mən səni özümə kürəkən yox, oğul bilirdim. Neyləyək, bəlkə də, qismət beləymiş. Olacağa çarə yoxdur. Qəzadan qaçmaq olmaz. Alnımıza nə yazılıbsa, onu da görəcəyik. Ancaq mənim qızımı gorbagor dədəsi İlan Mahmudun qarğışı tutdu. Ona min təsbah lənət olsun. Mənim bu dünyamı da, o dünyamı da yandırdı. Bu yastıqdan qalxası deyiləm. Sənubərsiz yaşamaq istəmirəm. Mən öləndə Sənubərin yanında basdırarsan. Ancaq ölməmişdən qabaq sinəmdə bir neçə xanə sözüm var, onu demək istəyirəm. Mən deyim, sən də yaxşı-yaxşı qulaq as.

Aldı Səlbinaz:
Tərsinə dolandı fələyin işi,
Sinəmdə Sənubər dağı gedirəm.
Dəydi qayalara çərxin gərdişi,
Sinəmdə Sənubər dağı gedirəm.

Aldı Miskin Abdal:
Fələk dara çəkdi qara bəxtimi,
Sinəmdə Sənubər dağı qalıram.
Yerindən uçurtdu təxti-butamı,
Sinəmdə Sənubər dağı qalıram.

Aldı Səlbinaz:
Naz ilə böyütdüm, cana qıymadım,
Üstünə qonmağa qübar qoymadım,
Hüsnü-kamalından dadar doymadım,
Sinəmdə Sənubər dağı gedirəm.

Aldı Miskin Abdal:
Özüm də bilmirəm, nəydi günahım,
Eşqimdə olmuşdu yar qibləgahım,
Yerləri, göyləri yandırar ahım,
Sinəmdə Sənubər dağı qalıram.

Aldı Səlbinaz:
Bu da bir qismətdir, bu da bir yazı,
Döndü viranəyə ömrümün yazı,
Gəl görmə günahkar sən Səlbinazı,
Sinəmdə Sənubər dağı gedirəm.

Aldı Miskin Abdal:
Qalmayıb Abdalın səbri-qərarı,
Qəlbində yar dağı, yar intizarı,
Yalanmış dünyanın dövləti, varı,
Sinəmdə Sənubər dağı qalıram.

Söz tamama yetməmiş Səlbinaz gözlərini birdəfəlik yumdu. Ha çığırdılar, ha hayladılar, Səlbinaz bir daha gözlərini açmadı ki, açmadı. Səlbinaz ölüb, yüz ilin ölüsünə qarışmışdı. Miskin Abdalın dərdi bir idi, oldu min. El-oba yığışdı. Səlbinazı aparıb, qızının yanında dəfn elədilər.

Günlər ötüşdü. Hərə bir yana çəkilib, getdi. Çox vaxt Miskin Abdal evdə tək qalırdı. Fikirdən, xəyaldan ayrıla bilmirdi. Atası-anası onu güclə ovundururdu. Sazını qırmızı köynəyindən çıxarıb, qara köynəkdə saxladı. Ömrünün sonuna qədər sazını qara köynəyindən soyundurmayacağına söz verdi. Bunu bilən aşıqların, sazəndələrin hamısı öz sazlarının qırmızı köynəyini dəyişib, qara köynəyə saldılar.

Sənubərin dərdi Miskin Abdalı lap əldən-dildən salmışdı. Dörd divar içindən bir yana çıxmır, ağrısını-acısını saza-sözə söyləyirdi. Onun yanına təsəlli vermək üçün gələn tay-tuşları da Miskin Abdalın dərdini yüngülləşdirə bilmirdilər. Anası Növrəstə gördü ki, oğlu üzülüb, əldən gedir. Gəlib, ona nə qədər yalvar-yaxar elədisə, bir xeyri olmadı. Axırda əlacı kəsilib, qoşa hörüyünü sinəsinə basıb, aldı, görək, nə dedi:

Butanın dərdindən olub divanə,
Ah çəkib, dad edib, ağlama, oğul.
Bir sönən çırağa olub pərvanə,
Bu qədər yasını saxlama, oğul.

Miskin Abdal gördü ki, anası onu sakitləşdirməyə çalışır. Ancaq bunların xeyri yox idi. Miskin Abdalın dərdi özünə bəs idi. Ona görə də anasının cavabında aldı, görək, nə dedi:

Nə qədər canımda canım var mənim,
Sənubər – deyərək, ağlaram, ana.
Yıxıbdır evimi nakam yar mənim,
Ölüncə yasını saxlaram, ana.

Növrəstə gördü, yox, oğlu heç yola gələnə oxşamır. Başladı söhbətin səmtini bir az dəyişib, onun qəlbini ələ almağa. Aldı, görək, sözün o biri xanəsində nə dedi:

Yayılıb hər yana səsin, sorağın,
Şeyda bülbülüsən bağçanın, bağın,
Yazılsın, qalmasın bəyaz varağın,
Sazına qaralar bağlama, oğul.

Anasının son sözləri Miskin Abdalın qəlbinə yaman toxundu. Bu dəfə o, "Göyçə şikəstəsi" üstündə elə bir ah çəkib, elə bir nalə qopartdı ki, daha nə deyim:

Qalmayıb ürəkdə eşqim, həvəsim,
Kəsilib taqətim, titrəyir səsim,
Nə saz günahkardır, nə pərdə, nə sim,
Sazıma qaralar bağlaram, ana.

Miskin Abdalın belə yanıqlı-yanıqlı oxumağı Növrəstəni daha da kövrəltdi. Oğluna yazığı gəldi. Elə bil, sinəsinə çalın-çarpaz dağlar çəkildi. Aldı sözünün tapşırmasında, görək, oğluna nə dedi:

Çoxdur Növrəstənin cövri-məlalı,
Dərdini çəkməkdən qalmayıb halı,
Dedim ki, halımdan olasan halı,
Sinəmi çal-çarpaz dağlama, oğul.

Anasının qəlbini ovutmaq üçün Miskin Abdal özünü ələ alıb, görək, nə dedi:

Mən sənə söyləyim, sən də ol hali,
Qəmlər içindədir Göyçə mahalı,
Elə yazıq bilmə oğlun Abdalı,
Yağılar sinəsin dağlaram, ana.

Bundan sonra Miskin Abdal sazını köynəyinə qoydu. Düz bir il sazı köynəkdən çıxarmayıb, qurulu gərdəyin üstündən asdı. Nə atası Məhəmməd kişi, nə anası Növrəstə xanım, nə də bu evə

ayaq basanların heç biri boş qalmış qırmızı gərdəyin üstündəki qara köynəkli saza baxa bilmirdilər. Baxanların da gözləri yaşla dolurdu. Çoxu da özünü saxlaya bilməyib, göz yaşlarını leysan kimi axıdırdı.

Bir il beləcə keçdi. Bir ildən sonra Miskin Abdal çox götür-qoy elədi. Dünyanın əzəlini-axırını fikirləşdi. Baxdı ki, yox, dünya elə belə gəlib, belə də gedəcək. Oturub dərd-qəm çəkməklə, ah-uf eləməklə, nalə-fəryad qoparmaqla nə gələni əyləmək olur, nə də gedəni qaytarmaq. Ona görə də öz-özünə belə fikirləşdi ki, onsuz da, Sənubərin dərdi yaddan çıxası dərd deyil. Ancaq bununla bərabər evdə qapanıb qalmaq da olmaz. Atam, anam da yazıqdırlar. Onların da baxıb-baxacaqları bir odur. Bu, heç Allaha da xoş getməz. Bir də, axı o, nəsilbənəsil babalarından ona miras qalan dini məzhəbi yayıb, başa çatdırmalı idi. Axı, onun üstündə böyük bir yük, boynunda dünya boyda bir deyim var idi.

Bu xəyallar içində o, üzünü Allaha tutub, dedi: “Səndən qüdrətli, Səndən qüvvətli heç kim, heç bir qüvvə yoxdur. Hər şeyin yaradıcısı Sənsən. Hər şeyi yoxluqdan təkcə Sən yaradırsan. Nə qədər ömrüm var, yalnız sənə qovuşmaq üçün yaşayacağam. Ömrüm boyu din-məzhəb yolunun Miskini, Abdalı olacağam, Ya qadir Allah!“. Sonra əlini atıb, sazını köynəkdən çıxardı. Başladı yavaş-yavaş dınqıldatmağa. Gördü ki, sazın kökü pozulub. Baş pərdə üstündə sazını köklədi. İlk çaldığı hava “Sənubəri” oldu və başladı bunları oxumağa:

Yıxdın könlüm şəhrini,
Dad fələk, aman fələk!
İçdim hicran zəhrini,
Zülm etdin yaman, fələk!

Qara geyibdir sazım,
Nə oxuyum, nə yazım...
Nakam qaldı murazım,
Vermədin aman, fələk!

Zülm olmaz beyləsindən,
Qoru şər hiyləsindən,
Abdalın naləsindən
Bir diksin, oyan, fələk!

Sonra da “Miskini“ saz havasında bunları oxudu:

Aləmi-röyada bir bağça saldım,
Gülündən qoxladım yar deyə-deyə.
Çəkdim hasarını alovdan, oddan,
Dolanıb, yoxladım yar deyə-deyə.

Nakam Sənubərim birdən necoldu?!
Bəxtin üzü döndü, niyə kəc oldu?
Bu eşq bay olmadı, axır heç oldu.
Canda can saxladım yar deyə-deyə.

Bir də görünmədi bulaq başında,
Öldü qar-boranlı ilin qışında,
Axtardım mən onu çeşmim yaşında,
Sellər tək çağladım yar deyə-deyə.

Sazım qara geydi, çala bilmədim,
Dərdim canda yandı, gülə bilmədim.
Ölmək istəsəm də, ölə bilmədim,
Könüllər dağladım yar deyə-deyə.

Sənubərin dərdi əydi qəddimi,
Çağırdım köməyə, çatsın cəddimi.
Ağladım, sızladım, aşdım həddimi,
Qaralar bağladım yar deyə-deyə.

Abdalam, itirdim din-imanımı,
Dərbədər eylədim var gümanımı,
Göylərə yetirdim ah-amanımı,
Hər yanda ağladım yar deyə-deyə.

Bundan sonra “Abdalı”, “Göyçə şikəstəsi”, “Göyçə döndərməsi” və başqa yanıqlı saz havaları dil açdı. Çaldıqca, elə bil, dərdi bir az yüngülləşdi. Özündə, içində bir dinclik, rahatlıq hiss elədi. Onun sazının səsini ilk dəfə atası-anası eşitdi. Onlar inanmadılar. Elə bildilər, qulaqlarına səs düşüb. Səs gələn tərəfə yaxınlaşıb, gördülər ki, yox, bu xəyal deyil, Miskin Abdalın sazının səsidir. Özü də, sazı sinəsinə elə sıxıb ki, elə bil, uzun illər boyu həsrətlə balasını gözləyən ana öz övladını bağrına basıb. Elə bil, onun bu dünyadan xəbəri yoxdur. Heç kimə, heç nəyə baxmadan havalardan havalara keçir. Ata-ana əllərini göylərə qaldırıb, Allaha dualar elədilər, şükürlər oxudular. Bildilər ki, hamısını eləyən Allahdır. Hər şey bir onun əlindədir. Ulu Yaradan zavallı ata-ananın yalvarışlarını, dualarını yerdə qoymayıb. Miskin Abdalın niskilli könlündə bir ümid çırağı yandırıb. Sənubərin bir illik yasından sonra Miskin Abdal ilk dəfə idi ki, əlinə saz alırdı. Hamı Məhəmməd ilə Növrəstəyə gözaydınlığı verdi. Qurbanlar kəsildi, nəzir-niyazlar paylandı. Qohum-əqraba, istəyib-bilən Miskin Abdal olan otağa keçdi. Miskin Abdal onları görüb, ayağa qalxdı. Hamıya «xoş gəldin» elədi. Baxdı ki, sevincdən valideynlərinin, qohum-qonşularının gözləri yaşla

dolub. Miskin Abdal da kövrəldi. Ancaq özünü toxtatdı. Göz yaşlarını bir təhər gizlətdi. Anası irəli yeriyib, oğlunun boynuna sarıldı. Onu duz kimi yaladı. Sonra yazıq-yazıq Miskin Abdalın üzünə baxıb, dedi:

– Boyuna, buxununa, adına-sanına, sazına-sözünə qurban olum, ay oğul. Bu insafı, mürvəti sənin ürəyinə salan Allaha da qurban olum, ay bala. Nə yaxşı oldu, bizə yazığın gəldi. Dərddən, qəmdən silkinib, çıxdın.

– Ana, bunların hamısı qadir Mövlamın işidir, Onun qismətinə min şükr. Ürəyimdə bu ümid çırağını yandıran da Odur. Nə deyim vallah, Allah özü bilən yaxşıdır.

Növrəstə mənalı-mənalı oğlunun gözlərinin içinə baxıb, dedi:

– Oğul, dərdin alım, olarmı, bundan sonra sazını qırmızı köynəyinə geydirəsən? Mən istəmirəm ki, oğlumun sazı qara köynəkdə olsun.

Miskin Abdal dərindən bir köks ötürüb, dedi:

– Ay ana, sazı mən saz elədim. Sazın pərdələri mənim əlimdən cana gəldi. Məndən əvvəl heç kim sazda bircə hava da çalmayıb. Sazın köynəyini Sənubərin ölümü qara rəngə boyadı. Bu rəng həmişəlik saza Sənubər naləsindən, fəryadından, nakamlığından bir yadigar olaraq qalacaq.

Miskin Abdalın bu cavabından sonra Növrəstənin deməyə sözü qalmadı. O gündən başlayaraq Miskin Abdal yavaş-yavaş adam içinə, tay-tuş arasına çıxdı. Elin-obanın söz-söhbətinə, dərdinə-sərinə qarışdı. Ev işlərində atasının-anasının yaxın köməkçisi, həmdəmi oldu.

Aradan xeyli keçmişdi. Hər iş öz qaydasında gedirdi. Miskin Abdalın ata-anası gəlin, nəvə üçün darıxırdılar. Bilmirdilər, öz fikirlərini oğullarına necə çatdırsınlar. Bir gün xeyli düşünüb-daşınıb, belə qərara gəldilər ki, bir bəhanə ilə ürəklərini

Miskin Abdala açsınlar.

Anası dedi:

– A bala, biz nə qədər işləyəcəyik? Tək işləməkdən lap təngə gəlmişik. İşləməsək də, olmur. Mən evdə gəlinin də işini görürəm. Neyləyək, Allahın qisməti belə imiş. Tək sənin başında deyil, ha. Yüzü olub, biri də bu. Nə qədər yaslı qalmaq olar? Nə çoxdur elimizdə, obamızda qız. Birini özün sev, seç. Biz də el adəti ilə elçi gedib, toy eləyək. Biz də istəyirik ki, doyunca gəlin buyurub, çağıraq. Nəvə boyunu sevək, əzizləyək.

Daşdan səs çıxdı, Miskin Abdaldan səs çıxmadı. O, dərin fikir-xəyal içində ötən günlərini xatırlayır, içində aranı-dağa, dağı-arana aparırdı. Onun susduğunu, cavab vermədiyini görən atası xeyli ürəklənib, dedi:

– Anan düz deyir, ay bala, bir bizə də yazığın gəlsin. Yaş ötüb, keçir. Kimi, nəyi gözləyirsən? Neyləyək. Allahın buyurduğu belə imiş. Daşı tök ətəyindən, sözümüzü yerə salma. Bizim də murazımız, arzu kamımız var. Böyük bir nəslin ocağını kor qoymaq olmaz. Bizim ümidimiz, pənahımız, axı təkcə sənsən.

Miskin Abdal atası Məhəmməd kişini diqqətlə dinləyəndən sonra ağır-ağır dilləndi:

– Ay ata, ay ana, siz ikiniz də mənim əzizim, iki gözümüzsünüz. Sizin sözünüzdən çıxmağı Allah da mənə bağışlamaz. Hələ tezdir. Gözləyibsiniz, bir az da gözləyin. Fikirləşib, qəti sözümü deyərəm.

Məhəmməd ilə Növrəstə Miskin Abdalın bu sözündən bir az rahatlandılar, ürəklərində bir ümid çırağı yandı. Onlar otaqdan yarı xoşhal çıxdılar. Öz aralarında bu söhbəti yenə da götür-qoy elədilər. Məhəmməd kişi dedi:

– Arvad, deyəsən, oğlumuz bir az yumşalıb. Əvvəllər bu sözü eşidəndə daş atıb, başını tuturdu. Şükür olsun Tanrının

birli-birliyinə. Deyəsən, yavaş-yavaş yola gəlir.

Növrəstə dedi:

– Ay kişi, zarafat deyil, oğlumuz Sənubər kimi yarını, candan artıq sevdiyi butasını itirib. Bu yara soyumalıdır, ya yox? Halal süd əmmiş uşaqdır. Razılığa gəlməyib, neyləyəcək? Bir gün özü də başa düşəcək ki, dünya belə gəlib, belə də gedir. Onda hər şey düzələcək.

Məhəmməd kişi dedi:

– Təki, sən deyən olsun, ay arvad.

Hər ikisi yenə də əllərini Haqqın ətəyindən üzmədilər, ulu Tanrıya şükürlər eləyib, dualar oxudular. Miskin Abdala bu təklifi başqaları, tay-tuşları da tez-tez eləyirdilər. Miskin Abdal da qəlbində Sənubər nisgili, hamısına yarıkönül "hə" desə də, evlənmirdi ki, evlənmirdi... İşi, gücü telli sazını götürüb, yaxın-uzaq ellərə, obalara getmək, öz ürək sözlərini camaata çatdırmaq, onları Haqqın ulu dərgahına səsləmək idi. O, bu məqsədlə Göyçədən çox-çox uzaqlara da ayaq açmışdı. Günlər ötüşdükcə, o daha çox tanınır, daha çox sevilirdi. Bu yol artıq, onun həyatının mənasına çevrilmişdi. Onun bu əməlləri Allah-Təalanın da xoşuna gəldi. Öz sevimli bəndəsinə səxavətini əsirgəmədi.

Bir gecə Miskin Abdal yatıb, aləmi-röyada gördü ki, güllü-çiçəkli uca bir dağın başındadır. Oradan baxanda dünyanın hər yanı apaydın, ovuc içi kimi görünürdü. Birdən onun yanında gözəl bir köhlənin üstündə, nurani bir şəxs peyda oldu. Onun üzündəki nur dörd yana işıq saçırdı. Ədəblə salam verib, əleyk aldı. Sonra atdan düşüb, mehriban-mehriban Miskin Abdala baxıb, dedi:

– Oğul, məni tanıyırsanmı?

Miskin Abdal özündə güc tapıb, onun üzünə, Günəş ziyası qədər işıqlı gözlərinə baxıb, cəsarətlə dedi:

– Yox, baba.

Həmin şəxs dedi:

– Miskin Abdal, bil və agah ol, darda olanların dadına çatıb, onlara kömək eləyən Həzrəti Əli mənəm. Allahın şiri, on iki imamlarının əvvəlincisiyəm. Mən sənə böyük Yaradanın misilsiz payını, qismətini gətirmişəm. İndi mənə diqqətlə qulaq as. Dediklərimi yadından çıxarma.

Bundan belə Sənubərdən ötrü dad-fəryad eləyib, nə özünə, nə də valideynlərinə əziyyət vermə. Sənubərin ruhu sənin bu hərəkətlərindən incik düşür. Bu, heç qadir Mövlaya da xoş getmir. Sənin taleyində əlli yaşında ikinci dəfə evlənmək qismətin var. Dörd uşağın olacaq – üç oğlan, bir qız. Sonrakı iki oğlun boranda öləcək. Ağlınla, kamalınla şahlıq səltənətində yüksək mərtəbələrdən birinə çatacaqsan. Uzun ömür yaşayacaqsan. Min-bir xətadan, bəladan qurtaracaqsan. Sazınla-sözünlə ürəkləri ovsunlayacaqsan. Haqq dünyasına doğma ata-baba yurdunda qovuşacaqsan. Bunlar bir yana; Allah-Təala tərəfindən heç kəsə nəsib olmayan bir halal qismətin də var. Bu qismətin sənə əlçatmaz bir ucalıq gətirəcək, müqəddəs bir övliya məqamına yüksələcəksən. Sınaqlı adam kimi aləmdə məşhur olacaqsan. Nə qədər çətində, darda qalsan, ulu Tanrı səni hər cür bəladan hifz eləyəcək. Müqəddəs bir övliya kimi özündən sonra da zaman-zaman yaşayacaqsan. Sənin adın, şöhrətin özündən sonrakı nəsillərinin də başını uca, alınlarını açıq eləyəcək.

İndi isə dediklərimə yaxşı-yaxşı qulaq as. Sübh tezdən bazara gedərsən. Orada sənin qismətinə bir at var. Tutqun qırmızı rəngdə olan bu köhlən atası od, anası yel at olan dəniz ayğırından törəyib. Həmin atı axtarıb, tapmaq o qədər də çətin olmayacaq. Çünki, at səni bazarda görən kimi kişnəyib, üstünə gələcək. Atın sahibi səndən pul almaq istəməyəcək. Sən atın

pulunu artıqlaması ilə ver. Ata layiq yəhər, yüyən alarsan. Sonra ifçin nallatdırarsan. Belinə qalxıb, yüyənini buraxarsan. O, yel kimi səni bir su içimində evinizə gətirəcək. Atın ağzındakı dili haçadır. Ona görə də atının adını "Haçadil" qoyuram. Bu atın yerişinə, duruşuna hamı heyran qalacaq. Çox padşahların gözü onda olacaq. Ancaq o sənin qismətindir. Həmin gün gecə yarı hava qara buludlarla örtüləcək. Güclü göy gurultusundan az qala qulaqlar tutulacaq. Aramsız ildırım çaxacaq, gözqamaşdırıcı şimşəklər oynayacaq. Bu dəhşətli gecədə güclü bir ildırım sənin yaşadığın evin arxasındakı qayanın başına düşəcək. Onun zərbəsindən qaya parça-parça olub, ətrafa dağılacaq. Qayadan qopan iri daş parçalarından nə sizin, nə də yaxınlıqdakı qonşuların yaşadıqları evlərə heş bir xəta dəyməyəcək. Bundan sonra birdən-birə qara buludlar yox olacaq, hava tamamilə açılacaq. Sübh namazına az qalmış göydən, Allah-Təala tərəfindən sənə müqəddəs bir Ocaq nazil olacaq. Hiss eləyəcəksən ki, namaz otağında dördkünc kiçik taxta təknə var. Həmin təknəni əlinə götürməmişdən əvvəl üç dəfə salavat çevir. Bu sənin övliyaya çevrilməyinin ilk nişanəsidir. Sabah sübh açılanda gecə ildırım dağıdan qayanın yanına qalx. Buraya bütün kənd əhli toplaşacaq. Orada siz bir möcüzə görəcəksiniz. Dağılmış qayanın altındakı iri bir daşın arasından su axacaq. Bu, sənin adınla bağlı əbədi bir çeşmədir. Həmin çeşmənin yanında kiçik bir çinar ağacının zoğunu görəcəksiniz. O ildən-ilə böyüyüb, böyük bir ağaca çevriləcək. Hər adna axşamı şər qarışandan sonra burada qeybdən bir şam yanacaq. Adamlar dağılmış iri qaya parçalarından yaxınlıqdakı evlərə heç bir zərər toxunmadığını görüb, heyrət edəcəklər. Sən qeybdən yaranan bu dum-duru, durna gözü kimi təmiz bulaq suyundan hamıdan qabaq bir qab götürüb, evə gətir və qeybdən sənə nazil olmuş taxta çanağa tök. Soyuq su

burada öz-özünə qaynamağa başlayacaq. Bu möcüzə hamını heyrətə gətirəcək. Sonra sən hamının gözü qarşısında çanaqdakı çeşmə suyunu axıra qədər içib, qurtararsan. O gündən sən böyük Yaradanın yanında müqəddəs bəndə hesab ediləcəksən. O gündən sənin «cəddin» sınaqlı olacaq. Müqəddəs nəfəsin adamlara xeyirxahlıq gətirəcək. Adını çağıranlar darda qalmayacaq. Səsin-sorağın aləmi başına götürəcək. O gündən başlayaraq, hər yerdə səndən danışacaqlar. Ocağının qonaq-qarası kəsməyəcək. Hər gün bu ocaqda neçə-neçə qurbanlar kəsiləcək. Xoş niyyətlə bu ocağa təşrif gətirənlərin üzünə çanağa tökülmüş bulaq suyu qaynayacaq. Bəd əməlli adamlar ocağa gələndə su tərpənməyəcək, ləm duracaq. Bu ocaq könüllərin məlhəmi, insanların and yeri olacaq. Sən dünyadan köçəndən sonra da adın zaman-zaman yaşayacaq. Sənin dediyin sözlər, yaratdığın dastanlar, saz havaları, göstərdiyin möcüzələr səni əbədi yaşadacaq.

Bunları deyib, həmin nurani şəxs birdən-birə qeybə çəkildi. Miskin Abdal ayılıb, ha axtardısa, həmin adamı bir daha görə bilmədi. Bu vaxt onun gözlərini göydən təzəcə boylanan Günəşin zərrin şüaları işıqlandırdı. Elə bil, Günəş Allahın bu sevimli bəndəsinə özünün nur payını verirdi.

Hər gün o başdan oyanan Miskin Abdal bu gün Günəş çeşdə qalxana qədər yatdı. Bundan atası Məhəmməd də, anası Növrəstə də bərk narahat oldular. Bunu eşidən yaxın-uzaq qonşular da tökülüb, gəldilər. Ağsaqqal, ağbirçəklər, dünya yorub yola salanlar ata-anaya ürək-dirək, təskinlik verdilər. Bir də baxdılar ki, budur Miskin Abdal yuxudan ayıldı. O dörd yanını adamlarla dolu görüb, təəccübləndi. Sonra anladı ki, məsələ nə yerdədir. Miskin Abdal qalxıb, geyindi. Sonra gördüyü yuxunu hamıya söylədi. Bu yuxudan elə həyacanlanmışdı ki, fərəhindən bilmirdi, neyləsin. Əlini atıb, divardan asılmış sazı götürdü. Zilini zil, bəmini bəm eləyib, aldı, görək, öz dərdi-dilini necə izhar elədi:

Bu gecə vayğamda gördüm Əlini,
Səni pir sahibi görürəm, – dedi.
Gülüb, kürəyimə vurdu əlini,
Ömrünə bir çələng hörürəm, – dedi.

Allahın şiriyəm, bir bax didəmə,
Qoru din-məzhəbi, olmaz sədəmə,
Dolan bu dünyanı, yoruldum demə,
Dalında dağ kimi dururam, – dedi.

Sərində ağıl var, qüvvət qolunda;
Mələklər qoruyur sağı-solunda,
Seyyidsən, dərvişsən Haqqın yolunda,
Abdala Haqq payı verirəm, – dedi.

Eşidənlərin hamısı bu işə, lap mat-məəttəl qalmışdı. Gördülər ki, doğrudan da, elə bil, Miskin Abdalın üz-gözünə nur çilənib. Bunları görüb-eşidən valideynlərin sevincdən uçmağa bir qanadları yox idi. İndi anası Növrəstə yəqin elədi ki, oğlu gec də olsa evlənəcək. Atası Məhəmməd sevindi ki, Miskin Abdal Haqq yolunun yolçusu olacaq. Ona görə də atası tez Abdalın atını yəhərləyib, yüyənlədi. Özünə də xeyli pul verib, bazara yola saldı. Kənddən bir neçə tay-tuş da Abdala qoşulub, kənddən bir iki ağac uzaqlıqda olan Basarkeçər bazarına at sürdülər. Kənd adamları onları gözdən itənə qədər izlədi.

Bunlar bazara getməkdə olsunlar. Sizə kimdən xəbər verək, Göyçənin Qızılvəng kəndində olan Əhməddən. Əhməd kişi istiqanlı, qohumcanlı, öz tükünün üstündə dolanan adam idi. Var-dövlətdən də qisməti pis deyildi. Həmişə Allahın qoyduğu yol ilə getdiyindən, qadir Mövla onun ruzisini bol eləyirdi.

Əhməd kişinin cins at nəslindən bir madyanı var idi. Əhməd kişi də bu atını, lap çox istəyirdi. Madyanın yerişinə, duruşuna söz ola bilməzdi. Nəmərə də duranda bütün "mənəm-mənəm" deyən atları geridə qoyardı. Hamı bu atın dayçasını ələ keçirmək üçün əldən-dildən gedirdi.

Əhməd kişinin madyanının yenə də höyürə, dalafa gəlmək vaxtı çatmışdı. At bir həşirə qalxmışdı ki, gəl görəsən. Əhməd kişi nə qədər eləyirdi, atı axşamlar tövləyə sala bilmirdi. Madyan harada erkək at görürdüsə, kişnəyə-kişnəyə dördnala ora qaçırdı. Əhməd kişi razı deyildi ki, madyanın dalafını kənddəki ayğırlardan yığsın. Ona görə, öz-özünə götür-qoy eləyib, belə qərara gəldi ki, sabah madyanı Göyçə gölünün kənarındakı sıx meşəliyə – ormanlığa aparsın. Çünki, burada cins ayğırlar çox idi. Elə də elədi. Elə ki, Əhməd kişi madyanı Göyçə gölünün sahilindəki sıx meşəliyə – ormanlığa gətirdi, bir də gördü ki, burada nə qədər ayğır varsa, hamısı atın dörd yanındadır. Onlar hingilləşir, bir-birini gəmirir, hər biri özü madyanın belinə sıçramaq istəyirdi. Madyan da kişnəyə-kişnəyə sahil boyu o başa, bu başa qaçırdı, ayğırlar da dalınca.

Əhməd kişi bilmirdi, neyləsin. Elə bu vaxt gördü ki, uzaqdan meşəlikdən qonur rəngli bir ayğır çıxdı. Madyana aman verməyən erkək atlar bu ayğırı görən kimi qulaqlarını şəkləyib, yerlərində donub, qaldılar. Qonur ayğır madyana doğru sürətlə gəlirdi. Onu görəndə madyan da ayğıra tərəf qaçdı. Meşədən çıxan ayğır madyana çatıb, cəld onun belinə sıçrayıb, dalafını aldı və atın belindən düşüb, gəldiyi tərəfə yel kimi çapıb, bir anın içində meşədə görünməz oldu. Əhməd kişi, elə bil, yuxu görürdü. Madyan sakitləşdi. Bayaqkı erkək atlar daha madyana yaxın gəlmirdilər. Uzaqdan-uzağa peşman-peşman onu imsikləyirdilər.

Günlər keçdi, aylar ötdü, vaxt düzəldi. Əhməd kişinin madyanı bir kürük doğdu. Kürük elə gözəli idi ki, baxmaqdan doymaq olmurdu. Vaxt ötdükcə kürük yekəlib, dayça, qulan oldu. Eldə, obada hamının gözü bu qulanda idi. Qulana çox adam müştəri idi. Amma Əhməd kişi onu heç kəsə satmaq istəmirdi. Məqsədi onu özünə saxlamaq idi. Elə ki, qulan üç yaşar oldu, Əhməd kişi istədi ki, onu minməyə öyrətsin. Qulan artıq ürgə olmuşdu. Yorğa yerişinə, qaçışına hamı həsəd aparırdı.

Əhməd kişi nə qədər çalışdısa, ürgənin belinə sıçrıya bilmədi. Ürgə bir göz qırpımında onun əlindən çıxıb, uzaqlara qaçdı. Kəndin "mənəm-mənəm" deyən oğulları ürgənin nə belinə yəhər qoya bilir, nə də minə bilirdilər. Əhməd kişi çar-naçar qalıb, ürgəni satmağı qərara aldı. Bazar günü bir at minib, ürgəsini də yedəyinə alıb, gəlib çıxdı bazara. Bazarda nə qədər adam vardısa, töküldü ürgənin başına. Onu almaq istəyən də, istəməyən də ürgəyə həvəslə, maraqla baxmağa başladı. Qiymətini soruşdular. Almaq istəyənlər istədilər ki, ona əl vursunlar, ürgə göydə oynadı.

Əlqərəz, Əhməd kişi ürgəsini bazara gətirdiyinə də peşman oldu. Elə bu vaxt bazarın qiblə tərəfindən bir neçə atlı göründü. Bu Miskin Abdal və onun yoldaşları idi. Ürgə onları görən kimi ucadan kişnəyib, Əhməd kişinin əlindən çıxdı və bir göz qırpımında atlara çatdı. Miskin Abdal tez atdan düşdü. Ürgə ona yaxınlaşıb, başını Miskin Abdalın üzünə söykədi, onu qoxuladı. Bunu görənlər mat qaldılar. Miskin Abdal öz atının yüyənini yoldaşlarına verib, ürgənin ipək kimi yalmanından tutub, onun sahibinin durduğu yerə gəldi. Buradakı adamlardan çoxusu Miskin Abdalı yaxşı tanıyırdı. Qalanları isə onun kim olduğunu hələ bilmirdi. Bayaqdan ipə-sapa yatmayan, hamını zinhara gətirən ürgə quzuya dönmüşdü. Əhməd kişi də işləri belə görüb, yerin-

dəcə lal-dinməz qalmışdı. Bilmirdi ki, bu gördükləri yuxudur, yoxsa nədir?

Miskin Abdal Əhməd kişidən razılıq alıb, ürgəni nalbəndin yanına apardı. Nalbəndin balaca oğlu ürgənin ayaqlarını bir-bir qaldırdı. Nalbənd də onu nalladı. Miskin Abdal nalbəndin pulunu artıqlaması ilə verdi. Bunu görənlər deməyə söz tapa bilməyib, başlarını buladılar. Miskin Abdal getdikcə onların gözlərində böyüyürdü. Sonra Miskin Abdal pulunu verib, bazardan zər-ziba bəzəkli, gümüş üzəngili bir yəhər, bahalı məxmərdən tərlik, ipəkdən çul, zər-naxışlı yüyən aldı. Ürgəni yəhərlədi. Quşqununu, qayışını yerbəyer elədi. Xurcununu, sazını yəhərin qancırğasına bağladı. Ürgənin gözəlliyi birə beş artdı. Miskin Abdal Əhməd kişinin də pulunu artıqlaması ilə verdi. Elə istəyirdi ki, sıçrayıb, yəhərin üstünə qalxsın, bu vaxt yadına ürgənin dilinə baxmaq düşdü. O əlləri ilə ürgənin ağzını açanda Əhməd kişi elə düşündü ki, Miskin Abdal ürgəni yaşlı at bilib, dişinə baxmaq istəyir. Qorxdu ki, müştəri ürgəni qaytarar, onun zülmü ərşə dirənər. Ona görə tez-tələsik dedi:

– Oğul, a bala, dişinin nəyinə baxırsan? Üç yaşardı.

Miskin Abdal Əhməd kişinin fikrini başa düşüb, qımışaraq, dedi:

– Əmi, narahat olma, mən atın dişinə yox, dilinə baxıram.

Əhməd kişi dedi:

– A bala, bəlkə, mən yaşlaşmışam, qulaqlarım yaxşı eşitmir. Bir de görüm, nə deyirsən?

– Əmi, mən bilən bu ürgənin dilinin ucu haça olmalıdır. Deyirəm, görüm doğrudurmu?

Əhməd kişi dedi:

– Ay oğul, atın da dili haça olarmı? Mən bunu birinci dəfədir ki, eşidirəm.

Miskin Abdal atın ağzını açdı. Gördü ki, doğrudan da, onun dilinin ucu haçadır. Bunu hamıya göstərdi.

Əhməd kişi narazı halda astadan dedi:

– A bala, qaytarırsan qaytar, pis mal yiyəsinindir.

Miskin Abdal dedi:

– Əmi, at mənimdir. Bu ürgəni mənə bu gecə yuxumda qismət eləyiblər. Onun dilinin haça olmağını da yuxumda dedilər.

Əhməd kişinin üstündən, elə bil, ağır bir dağ götürüldü. Miskin Abdalın bu sözünü eşidənlər mattım-mattım onun üzünə baxmağa başladılar. O gördü ki, hamının gözü onun üzündədir. Ona görə də buradan sazsız-sözsüz getməyi heç özünə rəva görmədi. Əlini uzadıb, yəhərin qaşından asdığı sazını götürdü, basdı sinəsinin üstünə. Bu dəm "Haçadil" yanıqlı bir kişnərti qopardı. Elə bil, o da Miskin Abdalın sazının, sözünün həsrətində imiş. Miskin Abdal telli sazını "Göyçə qaytarması" ("Göyçə döndərməsi") üstündə kökləyib, aldı, görək, Haçadilinə nə dedi, biz nə eşitdik:

Dillərdə söylənər hünərin, adın,
Hər mənzil başına çatsan, Haçadil.
Bir gündə yetərsən abi-Kövsərə,
Gecəni gündüzə qatsan, Haçadil.

Od atsan, yel atsan, deyə bilmərəm,
Səndən özgəsini öyə bilmərəm,
Düşmənin qəddini əyə bilmərəm,
Sayıqlıq etməyib, yatsan, Haçadil.

Qoyma sən Abdalı yadlar içində,
Düşsən də yanmazsan odlar içində,

Köhlənlər, ayğırlar, atlar içində,
Adınla sən manşır atsan, Haçadil.

Miskin Abdal sözünü tamamlayıb, sazını köynəyinə qoydu və atın yəhərinin qancırğasına bağladı. Buradakılarla görüşüb, bir quş kimi sıçrayıb, qalxdı atın üstünə. Yoldaşlarına da dedi ki, mən getdim, siz də mənim atımı gətirib, dalımca gəlin. O, ürgənin yüyənini buraxdı. Ürgə, elə bil, quşdan qanad aldı. Qırxbulaq kəndinin altından, Qoşabulaq kəndinin üstündən bir nəfəsə keçib, Zərgərlinin qənşərindəki "Darama" deyilən çətin keçidi olan bir qayalığa çatdı. Buradan da quş kimi sıçrayıb, özünü Məhəmməd kişinin qapısına çatdırdı. Buraya toplaşıb, yol gözləyənlər görəndə ki, Miskin Abdalın yuxusu çindir, sevindiklərindən bilmədilər, nə eləsinlər. Doğrudan da, Haçadil atın gözəlliyinə baxmaqdan doymaq olmurdu. Elə bil, Allah-Təala bu atı Miskin Abdalın boyuna qismət eləmişdi.

Qərəz, bir xeyli keçəndən sonra Miskin Abdalın o biri dostları da gəlib çıxdılar. Miskin Abdalın yuxusu hər yerə şüdd oldu. Gecə heç kəs yatmadı. Gecənin bir vaxtı bir də gördülər ki, Miskin Abdal dediyi kimi, bir anda göyün üzünü qara buludlar aldı. Şiddətli göy gurultusu az qalırdı, qulaqları dağıtsın, aramsız şimşəklər göz qamaşdırırdı. Birdən elə bir ildırım şaqqıldayıb, qayaya düşdü ki, o boyda yekə qaya çilik-çilik olub, hər yana səpələndi. Nə başınızı ağrıdım, Miskin Abdal söylədiklərinin hamısı çin oldu. Atası sabah müqəddəs ocaq nişanəsi olan su çanağını eşiyə çıxardıb, onun qabağında bir cöngə, bir neçə öyəc, burma qoçdan qurban kəsdi, gələnə-gedənə payladı, bir tikəsini də özünə saxlamadı.

O gündən "Miskin Abdal ocağı" adamların sidq ürəklə çağırdıqları iman, güman yeri oldu. Nəzir-niyaz deyənlərin, qurban

gətirənlərin dilək diləyənlərin, sayı gündən-günə artmağa başladı. Miskin Abdal oldu din, məzhəb yolunun əsl «miskin»i və «abdal»ı. El-el, oba-oba, oymaq-oymaq gəzdi. Sazının, sözünün dili ilə niyyətini, ürəyindən keçənləri yaymaqda davam elədi. Qonşu mahallara üz tutdu. Hara getdisə də hörmətlə qarşılanıb, izzətlə də yola salındı.

Bir gün Miskin Abdal yolunu Dərəçiçək mahalına saldı. Dərəçiçəyə xəbər çatdı ki, Göyçəli Miskin Abdal onların torpağına təşrif buyurub. Elə bil, mahalda toy-bayram oldu. Elin ağsaqqalları bu tanınmış, adlı-sanlı ocaq sahibinin pişvazına çıxdılar. Onun ayağının altında qurbanlar kəsdilər. Hamı onun yaydığı dini-məzhəbə iman gətirməyə hazır olduğunu bildirdi. Ancaq bir dəstə adamın qəlbinə şeytan girmişdi. Onlar and içdilər ki, neçə ki, Miskin Abdal bir möcüzə göstərməyib, ona iman gətirməyəcəklər. Bunu eşidən Miskin Abdal göstəriş verdi, meydanın ortasında elə bir tonqal qaladılar ki, ucu gedib ərşə çatdı. Sonra qucağına bir qumral quzu aldı. Üzünü ulu Tanrıya tutub, dodaqaltı nəsə pıçıldadı və quzu qucağında alovun içinə girdi. Ocaq söndü. Miskin Abdal qucağında da qumral quzu sağ-salamat ocağın qorunun içindən çıxıb, buraya toplaşanların arasına gəldi. Hamı heyrətdən yerində donub qalmışdı. Həmin inamsız adamlar Miskin Abdalın ayaqlarına döşənib, ondan imdad dilədilər, günahlarının bağışlanması üçün ondan dönə-dönə təvəqqe elədilər. Miskin Abdal onların günahından keçdi. Onun böyüklüyünü, müqəddəsliyini, Allahın sevimlisi olmasını nəzərə alıb, bu kəndin adını “Miskin“ qoydular. Miskin Abdalın bu möcüzəsinin sorağı hər yana yayıldı. O, Göyçə mahalına xoş xəbərlə qayıtdı.

Artıq Miskin Abdalın əlli yaşı düzəlirdi. Bunu yadından çıxartmayan Növrəstə oğluna dedi:

– A bala, indi sözün nədir? Əlli yaşındasan. İndi də evlənmək istəmirsən? Allaha ağır gedər, bala. İzin ver toy tədarükündə olaq.

Miskin Abdal şəstlə dedi:

– İzindir, ana.

Elə ki, Miskin Abdalı ikinci dəfə evlənməyə razı saldılar, başladılar qız sorağında olmağa. Çox dərs-gors, çox çək-çevir, çox götür-qoydan sonra belə qərara gəldilər ki, soraqlaşıb, bu dəfə qızı Göyçə elindən alsınlar. Gecəni yatıb, səhər elədilər. Məhəmməd kişi gecə yuxusunda nə görmüşdüsə də oyanan kimi Uzun Qasımı çağırtdırıb, dedi:

– Qasım, minərsən Haçadil ata, cilovunu buraxarsan. Harda yorulsanız, at özü dayanacaq. Dincəlin, sonra yola düşün. At hansı eldə, obada, kənddə, şəhərdə dayanıb, ucadan kişnəsə, bil ki, Miskin Abdalın qisməti oradadır. Bundan sonrasını Allah bilir.

Uzun Qasım dedi:

– Baş üstə, Məhəmməd qağa.

Tez-tələsik Uzun Qasıma yol tədarükü gördülər. Ona bir saz da verdilər. O da Haçadil atın belinə sıçrayıb, yola düşdü. Uzun Qasım Məhəmməd kişinin dediyi kimi elədi, buraxdı atın cilovunu. Yorulanda dincəldilər, at çiçəkli otlardan otladı, bulaqların suyundan içdi. Qasım da çörək yedi, su içdi, yenə yola düşdülər. Gəldilər, gəldilər, nəhayət, gəlib, “Ağrı dağı“nın ətəyindəki İrəvan şəhərinə çatdılar. Şəhərin bir küçəsi ilə gedirdilər ki, birdən Haçadil dayanıb, bərkdən kişnədi. Bu vaxt yaxınlıqdakı dükandan bir tacir eşiyə çıxdı. O, bir Qasıma baxdı, bir çiynindəki saza, bir də altındakı ata. Gördü ki, bu heç bura adamlarına oxşamır, qəribdir, özü də, deyəsən, pis adam deyil. Sazını da görüb, lap müştaq oldu. Yaxınlaşıb, soruşdu:

– Aşıq, yoxsa qəribsən?

Qasım dedi:

– Bəli, tacir ağa.

Tacir:

– Haradansan?

Qasım:

– Göyçədən.

Göyçə sözü eşidəndə, elə bil, tacirin çiçəyi çırtladı. Dedi:

– Aşıq, bu axşam mənim qonağımsan.

Qasım:

– Baş üstə, tacir ağa.

Tacir dedi:

– Aşıq, adım Ziyaddır. Özü də Güney məhəllədə yaşayıram. Kimdən soruşsan, evimi göstərəcək. Gün batandan sonra yolunu gözləyirəm.

Qasım dedi:

– Baş üstə, tacir Ziyad.

Uzun Qasım lap cavan vaxtlarından Miskin Abdalın yanında idi, aşıqlıq etməsə də, özünə görə çalıb-çağırmağı bilirdi. Necə deyərlər, lazım gələndə çulunu sudan çıxarırdı.

Qərəz, deyilən vaxt Uzun Qasım oldu tacir Ziyadın qapısında. Onu çox mehribanlıqla və gülər üzlə qarşıladılar. Tez-tələsik atını yerbəyer elədilər, özünə dünyanın bütün naz-nemətlərindən yemək-içmək verdilər. Bu vaxt aşıq sözünü eşidən qohum-qonşular da tacir Ziyadın evinə toplaşmışdılar. Oradan-buradan bir az söhbət edəndən sonra tacir Ziyad dedi:

– Aşıq, bu uşaq-böyük buraya səndən ötrü toplaşıblar. Bir az çalıb-oxuyarsanmı?

Qasım dedi:

– Baş üstə, tacir Ziyad.

Uzun Qasım sazını köynəyindən çıxarıb, başladı çalıb-oxumağa. Hamısını da Miskin Abdaldan oxudu. Miskin Abdalın adını eşitdikcə, hamının Qasıma hörmət-izzəti birə-beş artdı. Nəhayət, gecənin bir vaxtı tacir Ziyad üzünü adamlara tutub dedi:

– Aşıq yol gəlib, yorğundur, oxuduğu bəsdir, izn verin dincəlsin.

Bunu eşidən adamlar razılıq edib, evlərinə dağılışdılar. Tacir Ziyada da elə bu lazım idi. Yenidən gəlib, oturdu Qasımla üzüzə, dedi:

– Aşıq, əvvəl-əvvəl de görüm, adın nədir?

Qasım dedi:

– Tacir Ziyad, mənim adım, Qasımdır, özü də ayamam da var, mənə balaca vaxtından Uzun Qasım deyirlər.

Tacir Ziyad bu sözü eşidib, gülümsünüb, dedi:

– Aşıq Qasım, yorğun olsan da, bağışla. Madam ki, deyirsən Miskin Abdal ilə həmişə bir yerdə olubsunuz. O adam haqqında çox eşitmişəm, ancaq hələ ki, üzünü görməmişəm. Ya qismət... Gəlsənə, Miskin Abdaldan mənə əməlli-başlı söhbət eləyəsən.

Uzun Qasım dedi:

– Tacir Ziyad, atalar deyib ki, igidin adını eşit, üzünü görmə. İnşallah, Tanrı qismət edər, görüşərsiniz də...

Bunu deyib, Qasım başladı Miskin Abdal haqqında nə bilirdisə də, hamısını bir-bir danışdı. Qasım sözünü qurtarar-qurtarmaz tacir Ziyad dərindən bir köks ötürdü. Bunu görən Qasım soruşdu:

– Tacir Ziyad nə üçün belə köks ötürdün?

Elə bil, tacir Ziyad bu sözə bənd imiş. Dedi:

– Aşıq Qasım, təxminən eyni hadisə mənim də başıma gəlib.

Uzun Qasım dedi:

– Necə?

Tacir Ziyad dedi:

– Aşıq Qasım, dərdim uzundur. İndi mən deyim, sən də eşit, hər yanda danış. Mənim yeddi oğlum, bir qızım var. “Ağrı dağı“nın həndəvərində, İrəvan mahalında qızımın gözəlliyi hamını mat qoymuşdu. Hələ, on dörd yaşa çatmamış elçilər qapımızı yağır elədi. Hamısına da “yox“ dedik. Bir-iki il də bu minvalla ötdü. Gördük, yox, olmur, qızın da vaxtıdır, məcbur olub, doğma xalası oğluna nişanladıq. Üç il də nişanlı qaldı. Dördüncü il toy tədarükündə olduq. Elə ki, toyu təzəcə başlamışdıq, xəbər çıxdı ki, oğlan yatıb, qalxmayıb. Toy vaya döndü. O vaxtdan qızım qara bağladı. Əhd etdi ki, ömrü boyu heç kəsə ərə getməyəcək. Nə az, nə də çox, on ildir ki, qızım qara bağlayırdı. Nəhayət, onu dilə tutduq, razılaşdıq ki, bu inadından əl çəksin, qismət olsa, bir halal süd əmmişə ərə getsin.

Bunu eşidəndə, elə bil, Uzun Qasım yatmışdı, ayıldı. O saat barmağını dişlədi ki, Məhəmməd kişi gördüyü yuxu, elə, bu imiş. Səbrini basa bilməyib, dedi:

– Tacir Ziyad, bil və agah ol, mən aşıq-zad deyiləm. Məqsədim soraqlaşıb, Miskin Abdala bir halal süd əmmiş qız tapmaqdır. Məni buraya Miskin Abdalın atası Məhəmməd kişinin yuxusu gətirib, çıxardıb. İndi razı qalsan, Göyçə elinə bir şad xəbər apararam.

Qasımın bu sözləri, elə bil, tacir Ziyadın ürəyindən imiş. O dərhal arvadını, qızını və oğlanlarını çağırdı. Əhvalatı onlara danışdı. Hamısı da bu işə çox ürəkdən sevindi. Qız da etiraz etmədi. Qasım gördü ki, qız, doğrudan da, Miskin Abdala layiq qızdır. Adını soruşdu, dedilər, Həlimədir. Danışıb, razılaşdılar ki, elçilər gələn kimi toya başlasınlar. Yola düşərkən Uzun Qasım dedi:

– Tacir Ziyad, mindiyim at Miskin Abdalındır, adı da Haçadildir. Allah qoysa, axşama evdəyəm. Bir-iki günə gəlirik. Allah mübarək eləsin! Toya hazırlaş.

Bunu deyib, üz tutdu Göyçə tərəfə. Uzun Qasım axşama demişdi, ancaq Haçadil onu hələ xeyli erkən evə çatdırdı. Xoş-beşdən sonra bildilər ki, Uzun Qasım xoş xəbərlə gəlib. O gördüklərini, eşitdiklərini ətraflı danışdı. Elə, səhərisi gün İrəvana yola düşdülər.

Aradan bir neçə gün keçməmişdi, tacir Ziyad bir də gördü ki, toy adamları özlərini yetirdi. Xoş-beşdən sonra onlara ədəblə yer göstərdilər. Əhval-pürsan oldular. Baxdılar ki, doğrudan da, Miskin Abdal adına layiq adamdır. Üz-gözündən abır-ismət, nur yağır. Özü də, ona heç əlli yaş vermək olmaz. Otuz-otuz beş yaşında oğlanlara oxşayır. Qərəz, başladılar toya. Tacir Ziyad düz yeddi gün-yeddi gecə toy çaldırdı. Toyda bir təlxək də var idi. O, yeddinci gecə üzünü Miskin Abdala tutub, zarafatla dedi:

– Ustad, mənim bu kar qulaqlarım eşidib ki, tacirin qızı Həlimə xanım səni bəyənmir.

Bunu eşidəndə Miskin Abdal da güldü. Bildi ki, təlxək nə demək istəyir. Ona görə də sazı sinəsinə basıb, dedi:

Ay dilbilməz, neyləmişəm,
Yandırırsan oda məni.
Cəllad isən, al xəncəri,
Gecə-gündüz buda məni.

Qara bəxtim qış gətirdi,
Başıma min iş gətirdi,
Bir tacirə tuş gətirdi,
Ucuz satdı yada məni.

Qoxlamadım qızılgülü,
Aldı məni qürbət eli,
Həlimənin fitnə-feli,
Saldı eldən cüda məni.

Mən Miskin Abdal olmuşam,
Dərd əlindən saralmışam,
Allah, nə günə qalmışam,
Bəyənməyir bu da məni.

Söz tamama yetişəndə hamı Miskin Abdalın kamalına əhsən dedi. Bir az da gülüşdülər. Ustad baxdı ki, Həlimə bir haldadır, day demə. Elə bil, on dörd gecəlik Aydır ki, durub. Dodaqları gül qönçəsinə, yanaqları laləyə bənzəyir. Elə bil ki, məclisdə bir gün doğub ki, bu da odur. Özü də şala bürünüb. Bu arada təlxək yenə sözə başladı, dedi:

– Ustad, sən lap, mənim dədəmi yandırdın. İndi bir de görək, qız xoşuna gəldi, ya yox? Olarmı ki, bu “Ağrı dağı“nın nərgizini aparasan, ancaq onun haqqında bircə qatar gözəlləmə deməyəsən. Daha onda, sənin adın niyə Miskin Abdaldır.

Miskin Abdal arif idi. Təlxəyin nə dediyini anlayıb, Həlimə xanımın tərifini belə dedi:

Dodaqları gül qönçəsi,
Yanaqları lala yarım.
Kölgən gələndə gün qaçar,
Sən bəlasan, bəla, yarım.

Tanrı səni var edibdi,
Mən aşiqi xar edibdi,

Fələkləri kar edibdi,
Çəkdiyim ah-nalə, yarım.

Miskinin şirin sözüsən,
Cümlə gözəllər gözüsən,
"Ağrı dağı"n nərgizisən,
Bürünmüsən şala, yarım.

Afərin sədaları göyə ucaldı. Hamı Miskin Abdalın hünərinə heyran qaldı. Onun ömrünə dualar oxudular, toya mübarək dedilər.

Səhərisi gün gəcavə Göyçə tərəfə üz tutdu. Gəlib, nəhayət, Zərgərli kəndinə çatdılar, burada da toy çaldırıb, şadyanalıq etdilər. Həlimənin kəbini Miskin Abdala kəsildi. Növrəstə xanım toy gününün sonunda oğlunun boynunu qucaqlayıb, üzündən-gözündən dönə-dönə öpüb, dedi:

– Arzum gözümdə qalmadı, bundan sonra ölsəm də, dərdim olmaz, ay oğul!

Toy qurtardı. Başladılar şad-xürrəm yaşamağa. Bunlar burada deyə-gülə yaşamaqda olsunlar, sizə haradan xəbər verək, Təbrizdən, Şeyx Heydərin yeganə sağ qalan züryəti İsmayıldan. Elə ki, İsmayıl on dörd yaşında oldu, baxdı ki, bütün elmləri sinədəftər eləyib, açarını da qoyub cibinə. Gördü ki, düşmənlər at oynadır, ölkə parça-parça olub, dağılır. Ölkəni xilas eləmək, düşmənlərdən qisas almaq məqamının yetdiyini görüb, qoşun topladı özü də oldu sərkərdə. Qoşun atlanıb, üz tutdu Azərbaycanın şimalına. Bu səfəri haradan başlamaq məsələsi ortaya çıxanda Hüseyn Lələ bəy əllərini sinəsinə qoyub, kamali-ədəblə İsmayılın qarşısında baş əyib, dedi:

– Ya mürşidim, məsləhət görürəm ki, Göyçədən keçək. Bu

yol səndən ötrü həm əlverişlidir, həm də çox gərəklidir. Çünki, Göyçə başdan-başa şiə məzhəbinə qulluq eləyir. Burada atan Şeyx Heydərin, baban Şeyx Cüneydin, ulu baban Şeyx Səfiəddinin nəsil-nəsil davam edən yaxın dostları, müridləri var. Səfəvilərin dini təriqətlərinin həm Göyçədə, həm də ondan çox-çox uzaqlarda yayılmasında can qoyublar. Bu adlı-sanlı nəslin son yetirməsi Miskin Abdalın hünəri heç dil ilə deyiləsi deyil. Allahın sevimli bəndəsidir, müqəddəs ocaq sahibidir. Saz çalmaqda, söz qoşmaqda ad çıxarıb. Özü də böyük kəramət sahibidir. Gözəllik beşiyi olan Göyçənin adamları bütün varlığı ilə Səfəvilərə, saza-sözə bağlıdır. Minlərlə göyçəli sənin yolunda canından keçməyə çoxdan hazırdır.

Hüseyn Lələ bəyin bu sözləri, elə bil, gənc İsmayılın ürəyinə təpər, qollarına qüvvət, dizlərinə taqət gətirdi. Göyçəyə olan məhəbbəti birə-beş artdı. Qoşuna əmr elədi ki, Çuxur Səddən keçib, Səlim gədiyindən aşıb, Göyçəyə üz tutsun. Qoşun hərəkətə gəldi. Günə bir mənzil, teyyi-mənzil, çoxlu dağlar, dərələr keçib, axır ki, gəlib "Qaranlıq" deyilən bir yurda çatdılar. Bura artıq Göyçə mahalı idi. İsmayıl gördü ki, ayə, Lələ hələ az deyib, bura lap behiştin özüdür. Gül gülü çağırır, bulbul bülbülü. Üzük qaşı kimi sıralanmış dağların ortasındakı durna gözlü göl könül oxşayır. İsmayıl Göyçənin gözəlliyinə baxıb, lap hayıl-mayıl oldu. Bunu görən Hüseyn Lələ bəy İsmayıla yaxınlaşıb, soruşdu:

– Ya mürşidim, necədir, Göyçə dediyim kimi varmı?

İsmayıl gözlərini Göyçənin gözəlliyindən çəkməyib, dedi:

– Lələ, Göyçə sənin dediyindən da artıq imiş.

Lələ dedi:

– Ya mürşidim, hələ, bu gördüklərin nədir ki, buranın öz möcüzələri var.

İsmayıl dedi:

– Nədir o möcüzələr?

Lələ dedi:

– Mürşidim, icazə ver, qoşunu yerbəyer eləyim, sonra gəlib, hamısını danışaram.

İsmayıl dedi:

– İzndir, Lələ.

Hüseyn Lələ bəy dərhal göstəriş verib, çadırları qurdurdu. Yol gəlmiş qoşun dincəlməyə başladı. Özü isə geri qayıdıb, İsmayılın qənşərində durub, danışmağa başladı:

– Ya mürşidim, gördüyün bu göl – adı dillərdən düşməyən "Göyçə gölü"dür. Bu göl öz suyunu durna gözlü bulaqlardan alır. Bu göldə "Qızıl balıq" adında dünyada tayı-bərabəri olmayan balıqlar var. Çox şahlar, sultanlar o balıqdan ötrü sinoy gedirlər. Deyirlər, bu göldə bir erkək dərya atı da var. Bu at hər yeddi ildən bir yaz vaxtı sulardan qırağa çıxır, ilk rastına çıxan ilxıda bir madyana yaxınlaşır və dərhal da geriyə qayıdıb, suların qoynunda görünməz olur. Əgər bu dəniz ayğırından əmələ gələn kürük doğulan gündən sonra qırx gün müddətində qaranlıq yerdə saxlanarsa, daha doğrusu, işıq üzü görməzsə, bu dayçanın qanadları olar. Ona quş da çata bilməz. Ya mürşidim, bu gözəl gölün başqa bir sirri də var.

İsmayıl dedi:

– Nədir o sirr?

Lələ dedi:

– Gedək, göstərim.

Onlar birlikdə gölün sahilinə endilər. Lələ yerdən bir daş götürüb, gölün suyuna batırdı və qarşıdakı qayaya atdı. Daş qayaya dəyən kimi yapışıb, orada qaldı. Bunu görən İsmayıl lap mat-məəttəl qaldı. Özü də bir neçə daşı gölün suyuna batırıb,

qayaya aldı. Atdığı daşların hamısı yapışıb, qayada qaldı. İsmayıl soruşdu:

– Lələ, bu möcüzəli yerin adı nədir?

Lələ dedi:

– Ya mürşidim, bu adı sən qoyacaqsan!

İsmayıl dodaqaltı bir neçə dəfə öz-özünə “at daşı”, “at daşı” dedi. Sonra üzünü lələyə tutub, söylədi:

– Lələ, qoy bu yerin adı “At daşı” qalsın.

Lələ dedi:

– Ya mürşidim, bundan da gözəl ad ola bilərmi?

Onlar geriyə, çadıra qayıtdılar. Lələ dedi:

– Ya mürşidim, Göyçənin başqa bir sirri də var.

İsmayıl dedi:

– Lələ, o möcüzələri, o sirrləri də söylə.

Lələ dedi:

– Ya mürşidim, Göyçədə “Qoşabulaq” adlanan bir yer var. Hər yeddi ildən bir, gecə vaxtı göylərdən bu bulağa bir göz qırpımında nur axır. Bu nurun təsirindən bulağın suyu aşıb-daşır, köpüklənir. Həmin vaxt hər kim bu sudan içsə, onun köpüklü suyunda çimsə, ömrü boyu naxoşlamaz, gözəl səsi, qulaq batıran nərəsi olar, onun qollarının gücünə güc çatmaz.

İsmayıl dedi:

– Lələ, bu xoşbəxtliyə kimsə çatıbmı?

Lələ dedi:

– Ya mürşidim, eşitməmişəm.

İsmayıl dedi:

– Bəs, bu düşərgə saldığımız yerə niyə “Qaranlıq” deyirlər?

Lələ dedi:

– Bu sıra dağlar o qədər ucadır ki, axşama hələ xeyli qalmış, gün batmamış bu yerlərə kölgə düşür. Uzaqdan buralar qaranlıq

görünür. Ona görə də buraya "Qaranlıq" deyirlər.

İsmayıl dedi:

– Gəl söhbətimizin davamını saxlayaq sonraya. Durmaq vaxtı deyil. Başımız söhbətə qarışar, vaxt ötər, gecikərik. Allah qoysa, o qədər boş vaxtımız olacaq ki. Gəlişimiz barədə Miskin Abdala xəbər göndərmək lazımdır.

Lələ dedi:

– Düz buyurursan, ya mürşidim.

Hüseyn Lələ bəy İsmayılın göstərişi ilə bir neçə nəfər atlı seçib, Miskin Abdala xəbərə göndərdi. Atlılar yol getməkdə olsunlar, eşit Göyçə camaatından. Bir səhər adamlar qalxıb, gördülər ki, Göyçəyə "Qaranlıq" tərəfdən xeyli qoşun-ləşkər varid olub. Camaat elə hesab elədi ki, yurdlarına düşmən ayaq basıb. Odur ki, hər kənddə, hər kəsəkdə, hər obada özünə gümanı gələn qeyrətli oğullar dərhal dava libasını geyib, ata süvar oldular. Gəldilər, görsünlər ki, ağsaqqalları nə deyir bu işə? Davaya başlasınlarmı? Miskin Abdal gördü ki, yurdunun oğulları dəstə-dəstə axışıb, gəlir. Bir azdan o qədər adam toplaşdı ki, ota, suya san var idi, onlara yox. Özü də elə silahlanmışdılar ki, heç Rüstəm-Zalın da bunlara gücü çatmazdı. Altdan geyinib, üstdən qıfıllanmışdılar, üstdən geyinib, altdan qıfıllanmışdılar. Hər birinin də gözlərindən qan damırdı. Elə bir himə bənd idilər ki, düşmənin hər tikəsini bir dərəyə səpələsinlər.

Miskin Abdal dünyagörmüş, çox hadisələrin şahidi olmuş bir adam idi. O qoşuna göz gəzdirib, dedi:

– Uşaqlar, gəlin bir az səbrli olaq. Biz tələsiklik eləyib, özümüzü düşmən üstünə gedən kimi göstərərik. Birdən gedib, görərik ki, gələn dostumuzdur. Utanıb, xəcalət çəkərik. Gəlin qabaqca adam göndərib, məsələdən hali olaq. Görsək ki, gələn yağıdır, onda davamız davadır.

Miskin Abdalın bu məsləhətindən sonra hamı sakitləşdi. Tez bir neçə adam ayırıb, həmin yerə yola saldılar kı, öyrənsinlər, bu gələn qoşun kimindir, nə məqsədlə gəlib?

Atlılar bir az gedəndən sonra bir də gördülər ki, qabaq tərəfdən bir-neçə atlı onlara tərəf gəlir. Onlar yaxınlaşıb, salam verdilər, əleyk alandan sonra bildirdilər ki, bizi qoşun böyüyü göndərib. Onun bu elin ağsaqqalı Miskin Abdala ismarıcı var, onu çatdırmalıyıq. Gedənlər mənzil başına çatmamış həmin atlılarla birlikdə geriyə qayıtdılar. Miskin Abdal, bir də qoşun əhli gördü ki, göndərdikləri atlılar budur, yoldan yarı-yarımçıq qayıtdılar, özü də yanlarında daha bir neçə atlı var. Axır, onlar gəlib çatdılar, salam verib, əleyk aldılar. Qonaqlardan biri qabağa yeriyib, dedi:

– Bizə, bu elin ağsaqqalı Miskin Abdal lazımdır.

Miskin Abdal bunu eşidib, qoşunun arasından çıxıb, mehriban-mehriban dedi:

– Əvvəla, siz buraya xoş gəlib, səfa gətiribsiniz. İkincisi, axtardığınız Miskin Abdal mənəm. Nə sözünüz varsa, deyin, qulağım sizdədir.

Həmin adam dedi:

– Bizi buraya Şeyx Heydər oğlu İsmayıl göndərib. Bu qoşun da onundur. Biz də onun adamlarıyıq. Sizlərə xəbər göndərdi ki, narahat olmasınlar, dost elinə dostlar qonaq gəlib.

Bu xəbəri eşidəndə, elə bil, Miskin Abdalın üstündən bir ağır dağ qalxdı, başından duman ayazıdı. Qoşun əhli də rahat oldu, əllər qılıncların dəstəyindən çəkildi. Hamı bu işə çox sevindi, ən çox sevinən Məhəmməd kişi idi. O, irəli yeriyib, oğluna dedi:

– Oğul, bilirsənmi, İsmayıl kimdir? O bizim dədə-baba dostumuz Şeyx Heydərin oğludur. Dayıları İsmayılın anasını, dədəsini, qardaşlarını qətlə yetirdi. Dostları güclə İsmayılı onların

qılıncının ağzından qaçırdı, aradan çıxara bildilər. İndi hu həmin İsmayıldır. Sən onun pişvazına, özü də əməlli-başlı çıxmalısan. Onları qonaq dəvət elə. Yolunuzu gözləyirik.

Bunu eşidən Miskin Abdal gələn atlılara dedi:

– Siz gedin, biz də indicə gəlirik.

Atlılar atlarını dördnala geriyə çapdılar. Miskin Abdal da qoşuna göstəriş verdi ki, yenidən atlansınlar, birlikdə gənc İsmayılı qarşılamağa gedəcəklər. Atlanarkən telli sazını, bir də başqa bir saz götürüb, yəhərin qancırğasına bağladı, «Haçadil»in belinə qalxdı. Miskin Abdal qabaqda, qoşun-ləşkər də dalda "Qaranlığ"a, İsmayılı qarşılamağa yola düşdülər.

Atlılar qabaqda gəlib, İsmayılı məsələdən hali elədilər, sonra Göyçə camaatının gülərüz, mehriban olduqlarından ürək dolusu danışdılar. Miskin Abdal haqqında nə qədər tərifli sözlər var idisə, dedilər.

Gözləri yollarda olan İsmayıl və onun qoşunu bir də gördülər ki, Göyçədən gələnlərin qabağı açıldı. Ancaq lap qabaqda bir adam gəlir, boyda, buxunda hamıdan seçilir. Atı özünə, özü də atına yaraşır. Zalım oğluna baxanda adamın qarnı doyur. Özü də yəhərinin qaşından bir, arxasından da başqa bir saz asılıb. İsmayıl nə qədər göz gəzdirdi, onda qılınc, qalxan görmədi. Axı, igidin qılıncı-qalxanı olar. Axı, eşitmişik ki, Miskin Abdal həm də igid adamdır. İsmayılın ürəyinə dammışdı ki, bu adam Miskin Abdal olacaq. O, ləläsinin üzünə baxmadan, gözünü Miskin Abdaldan çəkmədən, astadan soruşdu:

– Lələ, bu Miskin Abdaldır?

Lələ dedi:

– Bəli, mürşidim, başqa cür də ola bilməz.

İsmayıl dedi:

– Bəs, onun yarı-yarağı niyə yoxdur?

Lələ dedi:

– Ya mürşidim, Miskin Abdalın qılıncı-qalxanı sazı-sözüdür.

İsmayıl dedi:

– Lələ, atı da çox yaraşıqlı atdır. Lap, özünə layiqdir.

Lələ dedi:

– Ya mürşidim, eşitdiyimə görə, onun atı, Göyçə gölündəki dərya ayğırından törəyib.

İsmayıl maraqla soruşdu:

– İndi bu at quş kimi uça bilər?

Lələ dedi:

– Yox, mürşidim, deyirlər, bu atın əvvəlki sahibi çox sonralar bilib ki, onun bu köhləni dəniz ayğırından törəyib. Onu saxlaya bilməyib, aparıb, bazarda satıb. Onu da Miskin Abdal alıb.

İsmayıl dedi:

– Lələ, Göyçənin miskini, abdalı budursa, görəsən, oranın şahı, sultanı necədir?

Lələ dedi:

– Yəqin ki, mürşidimə bənzəri olar.

İsmayıl dedi:

– Heç, bu da o böyük addan, sandan geri qalan deyil.

Söz İsmayılın ağzından təzəcə qurtarmışdı kı, Miskin Abdal öz qoşunu ilə bərabər qonaqların bərabərinə çatdı. Ona İsmayılın çadırını göstərdilər. Miskin Abdal ilə qoşun əhli atdan düşüb, İsmayıla təzim elədilər, qonaqlara «xoş gəldin» elədilər. Miskin Abdalın üz-gözündən, baxışlarından yağan nur İsmayılı ovsunlamışdı. O, şəstlə ayağa qalxıb, Miskin Abdala tərəf addımladı. Miskin Abdal da ona tərəf gəldi. İsmayılı doğma balası kimi bağrına basıb, üz-gözündən öpdü. İsmayıl da onu qucaqladı, əlini öpüb, alnına qoydu. Hamı bu mehriban görüşə mat qaldı. Miskin Abdal atının yəhərindəki ikinci sazı gətirib, İsmayıla

bağışladı. İsmayıl bundan çox xoşhal oldu. Sonra öz sazını sinəsinə basıb, görək, şəninə qoşduğu "İsmayılı" saz havası üstündə əziz qonağına necə «xoş gəldin» elədi:

Vədə verdiyin ilqara,
Oğul, İsmayıl, xoş gəldin!
Göyçə adlı bu diyara,
Oğul, İsmayıl, xoş gəldin!

Bura gələn bir də gələr,
Qəm çəkənin üzü gülər,
Pişvazına çıxıb ellər,
Oğul, İsmayıl, xoş gəldin!

Sazın-sözün sirri burda,
İgid olan qalmaz darda,
Sənə sadiq olan yurda,
Oğul, İsmayıl, xoş gəldin!

Bu günümüz taydır ilə,
Toy-bayramdır bizim elə,
Lalə, nərgiz gəlib dilə,
Oğul, İsmayıl, xoş gəldin!

Bəxt yazılıb hər alına,
Bax Abdalın əhvalına,
Gözəlliklər mahalına,
Oğul, İsmayıl, xoş gəldin!

İsmayıl Miskin Abdalın hünərinə, qabiliyyətinə, mərifətinə, qanacağına heyran qaldı. Fürsət tapıb, astadan Hüseyn Lələ

bəyə dedi:

– Lələ, bu ağıllı-kamallı, üzündən nur yağan bu müdrik ağsaqqala necə müraciət eləyim?

Lələ dedi:

– Ya mürşidim, bu adam adı hər yerdə bəlli olan hörmətli, böyük-kiçik yanında urvatlı bir adam, Haqqın dərgahına ucalmış böyük bir övliyadır. O bütün elmlərdən hali olan məşhur bir ustaddır. Bəlkə də, səhv edirəm, ustadlar ustadıdır. Yaxşı olar ki, Miskin Abdala "Ustad" deyə müraciət eləyəsən.

İsmayıl dedi:

– Lələ, çox düz buyurdun. Belə adamı ancaq "Ustad" adlandırmaq olar. Hələ biz onun çox kəramətlərindən xəbərsizik.

Lələ dedi:

– Elədir, mürşidim.

Söz tamama yetdi. Miskin Abdal sazını çiynindən endirdi. Çaldığı hava İsmayılın lap sümüyünə düşmüşdü. O, astaca lələdən soruşdu:

– Lələ, görəsən, bu saz havasının adı nə idi?

Miskin Abdal onun pıçıltısını eşidib, dedi:

– Mürşidim, bu saz havasının adı "İsmayılı" idi. Sənin adına bağlamışam.

Bunu eşidəndə İsmayıl lap xoşhal oldu, dedi:

– Ustad, sağlıq olsun, vaxt gələr, əvəzini çıxarıq.

Miskin Abdal dedi:

– Oğul, mənə sənin adın-sanından, sağlığından başqa heç nə lazım deyil. Mən dünyanın hər üzünü görmüşəm. Dünya malında da gözüm yoxdur. Nə qədər canımda can var, qayım-qədim dostumuzun nəslindən olan İsmayılın yolunda hər cür qəza-qədərə, cəfaya dözəcəyəm. Onsuz da mən bu yolun miskini, abdalıyam. Mən bu yoldan dönən deyiləm.

İsmayıl baxıb, gördü ki, yox, Miskin Abdal çox ağıllı, kamallı adamdır. Hələ, deyilənlərdən də artıqdır. Öz-özünə götür-qoy elədi ki, tale ona yar olsa, əlinə bar hökmranlıq keçsə, gərək, Miskin Abdal kimi bir ağıllı adamı heç vaxt yadından çıxarmasın. İsmayıl bu fikir, xəyalda ikən Miskin Abdal üzünü ona tutub, dedi:

– Ya mürşidim, sən başda olmaqla bütün qoşun mənim qonağımdır.

Dərhal İsmayıl qoşuna göstəriş verdi. Əvvəlcə Miskin Abdal ilə İsmayıl, sonra hər iki tərəfin igidləri atlandılar. Onlar qabaqda, igidlər də arxalarınca Zərgərliyə (Sarıyaquba) doğru yol başladılar. Gün hələ varkən Basarkeçəri keçib, Zərgərliyə (Sarıyaquba) çatdılar. Onları hamıdan əvvəl Miskin Abdalın atası Məhəmməd kişi qarşıladı. Hamıya «xoş gəldin» elədi. İsmayılı qucaqlayıb, bağrına basdı. Sevincindən gözləri yaşardı. Olub-keçən günləri xatırladı. Dərin bir köks ötürüb, İsmayıla dedi:

– Bala, özünü burada qərib hesab eləmə. Sən mənim əziz dostumun, mürşidimin oğlusan. Olub-keçənlərin hamısını yaxşı xatırlayıram. Bizim bu dədə-baba dostluğumuzun tarixi çox qədimdir. Sənin rəhmətlik ulu baban Şeyx Səfiəddinlə bizim ulu babamız, “Zərgərli” tayfasının başçısı, öz zəmanəsinin adlı-sanlı ağsaqqalı kimi tanınan Yaqub çox yaxın dost olub. Sonra da bu dostluğu Yaqubun oğlu İbrahim, onun oğlu İsmayıl, onun oğlu Əli, onun oğlu – mənim atam Cəfər, mən və oğlum Miskin Abdal nəsil-nəsil davam etdirmişik. İnşallah, bundan sonrakı nəsillərimiz də davam etdirəcəklər.

Məhəmməd kişinin bu söhbətini İsmayıl, onsuz da, çoxdan eşitmişdi. Məhəmməd kişi olub-keçənlər haqqında xeyli məlumat verdi. Sonra Miskin Abdal hamını qonaqlığa dəvət elədi, Burada elə bir toy-büsat, elə bir çal-çağır oldu ki, rüzigarın gözü

belə şadyanalıq görməmişdi. Göyçə aşıqları bülbül kimi cəh-cəh vurur, çalıb-çağırırdılar. Aşıqların belə oxumağı İsmayılın lap xoşuna gəlirdi. Ürəyində götür-qoy elədi ki, qayıdan başı bu aşıqlardan bir neçəsini Təbrizə aparsın. Nə başınızı ağrıdım, o gecəni, beləcə, kef-damaqla açdılar. Sabah açılan kimi İsmayıl Miskin Abdala dedi:

– Ustad, bilirsən ki, bizim yolumuz uzaqdır. Atalar yaxşı deyib ki, yolçu yolda gərək. Sağlıq olsun, qayıdan baş belə yox, əməlli başlı qonağın olarıq, sənə daha böyük əziyyət verərik.

Miskin Abdal dedi:

– Ya mürşidim, sizin kimilərinin əziyyətini çəkmək həmişə bizə xoşdur. Allah özü köməyiniz olsun. İnşallah, siz bu torpağa qələbə ilə qayıdacaqsınız. Bir məsləhətim də var.

İsmayıl dedi:

– Ustad, nədir o məsləhət?

Miskin Abdal:

– Ya mürşidim, məsləhət görürəm ki, Göyçənin azman, ərgən igidlərindən də öz qoşununa qatasan.

İsmayıl Miskin Abdalın bu sözündən çox razı qaldı. Onun sözünü yerə salmayıb, öz qoşununa xeyli göyçəli igidlərin də qatılmasına razılıq verdi. Qoşun yerindən tərpənmək istəyərkən Lələ İsmayılın qulağına astadan nə isə pıçıldadı. İsmayıl dönüb, Miskin Abdala dedi:

– Ustad, biz uzaq, özü də çox mühüm bir səfərə gedirik. Səfərdən qabaq sənin adına olan ocağı ziyarət eləmək, o müqəddəs çanağında bəxtimizi sınamaq olarını?

Miskin Abdal dedi:

– Niyə olmur, mürşidim!?.

İsmayıl başında bir neçə adamla "Miskin Abdal ocağı"nı ziyarət elədi. Çanağa su töküb, bəxtini sınadı. Gördü ki, taxta

təknəyə tökdüyü soyuq su dərhal poqqa-poqla qaynamağa başladı. Hamının üzü güldü. İsmayıl ucadan dedi:

– Böyük Yaradanın izni ilə qələbə bizimlədir. Haydı igidlərim, atlanın. Bizi böyük qalibiyyət gözləyir! Çünki, biz müqəddəs bir insanın ağır ocağının adından döyüşlərə gedirik. İnşallah, bu torpağa xoş xəbərlə qayıdarıq!

İsmayılın bu sözündən sonra qoşun atlandı. Bir azdan «İstisu» deyilən tərəfdən uca dağları aşıb, gözdən itdilər. Miskin Abdalın ürəyinə dammışdı ki, İsmayıl yaxın vaxtlarda xoş müjdəli bir soraqla gələcək.

Elə də oldu. Aradan bir xeyli vaxt keçmişdi. Bir də bir gün sübh vaxtı gördülər ki, qiblə tərəfdən, «İstisu» tərəfdən, böyük bir qoşunun ucu çıxdı. Qabaqda gələnlərin əllərində qələbə bayraqları dalğalanırdı. Göyçədən qoşuna qatılanlar toy-bayramla qoşunun qabağında gəlirdilər.

Miskin Abdalın tapşırığı ilə el-oba onların pişvazına çıxdı. Miskin Abdalın onu belə dəm-dəsgahla qarşılamağını görəndə İsmayılın ürəyi atlandı, üzünü Miskin Abdala tutub, ucadan dedi:

– Ustad, sazın-sözün beşiyi bu «Göyçə çuxuru»na mütləq qələbə ilə qayıtmalı idik.

İsmayıldan bu sözləri eşidən Miskin Abdalın ürəyi dağa döndü. Düzdür, o indiyə kimi Göyçə haqqında ondan-bundan çox ulu tərifəlayiq sözlər eşitmişdi. Ancaq İsmayılın sözləri onun üçün çox qiymətli idi. Odur ki, dedi:

– Ya mürşidim, sənin qələbən bizim baş ucalığımızdır. Sənin zəfərin bütün göyçəlilərindir. İlk dəfə sənin ağzından eşitdiyim "Göyçə çuxuru" sözü mənim çox xoşuma gəldi. İzn versən, sinəmdə təzəcə yaranan "Göyçə çuxuru" saz havası ilə sənə öz ürəyimdəkiləri bəyan eləyərdim.

İsmayıl həvəslə dedi:

– İzndir, ustad, de gəlsin.

Miskin Abdal sazı köksünə sıxıb, zilini-zil, bəmini-bəm elədi. Aldı, görək, nə dedi, biz də nə eşitdik:

Sən getdin hünərlə, gəldin zəfərlə,
Qurtardın elləri yasdan, İsmayıl.
Yolların bəzənsin xalıyla, zərlə,
Adına yazılsın dastan, İsmayıl.

Sən ki getməmişdin nişana, toya,
Nərənə hay verdi hər dağ, hər qaya,
Səni qeyrətinlə bu qoca dünya,
Çəkirdi sınağa qəsdən, İsmayıl.

Demə ki, Abdalın meydanı dardır,
Qəlbinə Allahın sevgisi yardır,
Qolunda pələngin qüvvəti vardır,
Tülkü meydanında aslan İsmayıl.

Söz tamama yetən kimi hər yandan "Əhsən! Əhsən!" sədaları göylərə bülənd oldu. Miskin Abdal irəli yeriyib, İsmayılı doğma balası kimi bağrına basıb, alnından öpdü, hünərinə min əhsən dedi.

Yol boyu söhbət elədikcə gözünü Göyçənin qənirsiz gözəlliyindən çəkməyən İsmayıl Miskin Abdaldan soruşdu:

– Ustad, adı zaman-zaman dillər əzbəri olan bu ulu yurdumuzun gözəlliyini birə-beş artıran bu dağların, dərələrin, qayaların, təpələrin adlarını deyə bilərsənmi?

Miskin Abdal dedi:

– Ya mürşidim, isti sular qaynayan dağlardan bu üzə aşdığınız yer "Uca dağ"ın ətəyidir. Bundan o yana gördüyün geniş çəmənlik "Tərsə qoruğu"dur. Buraya "Yağı qoruğu" da deyirlər. O biri dağların başında görünən o yer "Ağ qaya"dır. "Ağ qaya"nın o biri tərəfində, dərin sıx otlu-ormanlı dərədə "Qoşa bulaq" deyilən yer var. Özü də bu bulaqlar sınaqlıdır.

İsmayıl dedi:

– Bəli, ustad görürəm, ora çənli, dumanlı, çiskinlidir.

Miskin Abdal yenə də söhbətinə davam elədi:

– Ya mürşidim, "Çənlibel"in baş tərəfindən görünən ucu şivri dağa "Şişpilləkən" deyirlər. Ondan o yana «Səlimin gədiyi»ndən keçib, bu üzə gəldiyiniz aşırımın adı "Qaranlıq"dır.

Bu yerdə İsmayıl Miskin Abdalın sözünü kəsib, dedi:

– Ustad, "Qaranlıq"la Göyçə gölü haqqında mənə çox danışıblar. Bəs, bu qarşımızdakı qırmızı qayanın adı nədir? Özü də, elə bil, qızıldır, par-par alışıb, yanır.

Miskin Abdal dedi:

– Düz buyurursan, ya mürşidim. Həmin qaya "Qızıl qaya"-dır...

Söhbətin bu yerində İsmayıl dedi:

– Ustad, sizin bu torpaq başdan-başa xəzinədir ki...

Miskin Abdal mehribanlıqla dedi:

– Elədir, oğul. Allahın böyük məhəbbətindən yaranan bir torpağın qisməti başqa nə ola bilərdi?!

Qərəz, beləcə şirin söhbət eləyə-eləyə Miskin Abdal ilə İsmayıl qabaqda, qoşun-ləşkər arxada Zərgərliyə (Sarıyaquba) gəldilər. Bu gəlişə görə bir toy-büsat, bir çal-çağır başladı ki, gəl görəsən. Ruzigarın gözü belə toy-bayram görməmişdi. Aşıqlar da ki, heç dincəlmək bilmirdilər. İsmayıl bilmirdi, bu şənlikdə nəyə daha çox tamaşa eləsin. Bu şənliyin gözəlliyi qarışmışdı

Göyçənin gözəlliyinə. Hər şey gözəllik içində itib-batmışdı. Arada İsmayıl Miskin Abdala dedi:

– Ustad, gedən baş Göyçə aşıqlarından bir neçəsini Təbrizə aparmaq istəyirəm. Sən nə deyirsən?

Miskin Abdal dedi:

– Ağıllı sözə mən nə deyə bilərəm, ya mürşidim?

Bu ara ürəyi atlanan Məhəmməd kişi söhbətə qarışdı:

– Oğul, İsmayıl, sənin ana baban Uzun Həsən Göyçədən sarayına nə az, nə də çox, düz yüzə qədər aşıq aparmışdı. O, aşıqdan ötrü sinoy gedirdi. Tez-tez də Göyçə dağlarına gəzməyə, dincəlməyə çıxardı. Deyərdi ki, Göyçənin suyu, havası, təbiəti loğmandır, min bir dərdə dərmandır.

Bunu eşidəndə İsmayıl daha da maraqlanıb, dedi:

– Atayi-mehriban, bəlkə, eşitmiş olarsan. Bu gözəllik diyarının adı nədən götürülüb?

Məhəmməd kişi bir az fikrə gedib, dedi:

– Oğul, bil və agah ol, Göyçə sözünü ilk dəfə dilinə gətirən Həzrəti Əli olub. Eşitdiyimə görə o, ilk dəfə bu yerə gələndə bu yerin gözəlliyinə valeh olub. Özündən biixtiyar deyib: “Bu nə Göyçək diyardır!” O vaxtdan da bu torpağın adı “Göyçə” adı ilə çağırılıb. Oğul, başqa cür də ola bilməzdi. Çünki, bu yer, bu yurd Allah-Təalanın ən xoş günündə yaranıb.

“Həzrət Əli” sözünü eşidəndə, elə bil, İsmayılın üstünə nur ələndi, dünya gözlərində işıqlandı. Bu torpağa olan mehri-məhəbbəti birə-yüz artdı. Bunu hiss edən Məhəmməd kişi sözünə davam eləyib, dedi:

– Oğul, İsmayıl, Həzrəti Əli təkcə Göyçənin adını qoymayıb. O, Göyçə gölünə qonur dəniz ayğırı, bir də dünyada tayı-bərabəri olmayan qızıl balıq kimi qismətlər də verib. Eşitdiyimə görə, bir az aralıda “Qoşabulaq” deyilən yerdə hər yeddi ildən

bir qoşa bulaqlar Əlinin üzünün nurundan köprüyüb, qaynayır. Həmin gecə onun suyundan içib, köpüyündə çimənlər xoşbəxtliyə çatırlar. Dəniz ayğırı da hər yeddi ildən bir sahilə çıxır, bir madyana yaxınlaşır. Ondan törəyən atlara at çatmaz, deyirlər.

Bu söhbətlər İsmayılı elə aludə eləmişdi ki, günün haradan gəlib, hara getdiyini hiss eləmirdi. Söhbəti Miskin Abdal davam etdirdi:

– Ya mürşidim, ulu Tanrının eşqindən yaranan bu diyar, doğrudan da, möcüzəlidir. Dünyaya qan udduran Teymurləng hər yeri viran qoya-qoya Göyçəyə gəlir. Özü də bilmədən qılıncını qında saxlayır. Qoşununa əmr eləyir ki, bu torpağı basın, keçin. Teymurləng bəlasından belə asanlıqla sovuşduğu üçün camaat bir bayatı da qoşub:

Teymurləng susar keçər,
Qan tökməz basar keçər,
Toy-bayramdır Göyçədə,
Ad qalar: "Basarkeçər".

Bu yer o gündən Basarkeçər adlanır.

İsmayıl Göyçə haqqında eşitdiklərindən, bu müdrik insanların şirin söhbətlərindən vəcdə gəldi. Miskin Abdalın üzündən yağan nur onun könlünü işıqlandırdı. Yadına dədə-baba, nəsil-nəsil davam edən dostluqları, bu illərdə qorunub saxlanılan sədaqət, etibar düşdü. Ucadan, şövqlə dedi:

– Böyük ustadın doğulduğu Zərgərli (Sarıyaqub) kəndini bu gündən Miskin Abdala bağışlayıram. Bu ətrafdakı daha beş kəndin vergisi də nəsilbənəsil ona çatacaq.

İsmayıl üzünü Hüseyn Lələ bəyə tutub, dedi:

– Lələ, Təbrizə çatıb, hakimiyyəti təmin etdikdən sonra

Göyçədə bir şahlıq iqamətgahı qurulmalıdır. Biz tez-tez bu torpağa ziyarətə gələcəyik. Çünki, bu torpaqda Allah eşqi, Əli rəhmi, Cənnət gözəlliyi var.

Sonra üzünü Miskin Abdala tutub, dedi:

– Ustad, təzə fikrə gəlmişəm. Sənin Təbrizə getməyini məsləhət görürəm. Gərək, bizimlə Təbrizə gedəsən. Sənin kimi müdrik ağsaqqala bizim ehtiyacımız çoxdur. Biz səndən hələ, çox şey öyrənməliyik. İnşallah, hər şey Allahın buyurduğu kimi olar.

Miskin Abdal İsmayılın sözünü yerə salmadı. Yola hazırlıq gördü. On iki aşıq da seçib, İsmayıla təhvil verdi. Qoşunun tərpənmək vaxtı çatanda Miskin Abdal İsmayıldan soruşdu:

– Ya mürşidim, indi biz Təbrizə hansı səmtdən getməliyik?

İsmayıl dedi:

– Ustad, yəqin ki, gəldiyimiz tərəfdən.

Miskin Abdal dedi:

– Ya mürşidim, məsləhət görürəm ki, qayıdan baş güney yolundan gedək. Ziyan çəkmərik.

İsmayıl dedi:

– Nə deyirəm, ustad, get deyirsən, gedək. Məsləhət sənindir. Böyüyün, ağsaqqalın sözünü eşidən ziyan tapmaz. Bir halda kı, sənin kimi bir müdrik adamı eşidəsən.

İsmayıl yola düşməzdən əvvəl yenə də «Miskin Abdal ocağı»nı ziyarət elədi. Tutduğu niyyət xoş oldu; taxta çanaqda su yenə də poqqur ha poqqur qaynadı. İsmayıl buna çox sevindi. Qayıdıb, qoşuna əmr verdi ki, Miskin Abdal dediyi səmtdən Təbrizə doğru yol başlasın. Getmək vaxtı çatanda Miskin Abdal bir az kövrəldi, qəlbi yuxaldı. Doğma Göyçəsindən ayrılmaq ona çox çətin idi. Üzünü İsmayıla tutub, dedi:

– Ya mürşidim, doğma eldən, obadan, yar-yoldaşdan,

qohum-qonşudan, tanış-bilişdən ayrılıram. Sinəmə bir neçə xanə söz gəlib. Atanızın, ulu mürşidimiz Şeyx Heydərin adına bir "Heydəri" havası yaratmışam. İzn versəydin, həmin sözləri o hava ilə səsləndirərdim.

İsmayıl dedi:

– Buyur, ustad. O nə sözdür? Ustadın çalıb-çağırmasına heç bir qoruq, qadağa ola bilməz.

Bunu eşidən Miskin Abdal telli sazını sinəsinə sıxıb, aldı, görək, nə dedi, biz də deyək, eşidib, feyziyab olasınız:

Halallaşıb ayrılıram elimdən,
Qayıdaram, qayıtmaram, ya qismət.
Doymamışam çəmənimdən, gülümdən,
Qayıdaram, qayıtmaram, ya qismət.

Ömür keçib, yetmişimə çatmışam,
Yaradanın ətəyindən tutmuşam,
Neçə ili, neçə ilə qatmışam,
Qayıdaram, qayıtmaram, ya qismət.

Bu torpağın qoxusunda canım var,
Bulaqların sularında qanım var,
Qatar-qatar ağır adım-sanım var,
Qayıdaram, qayıtmaram, ya qismət.

Bu torpaqda ulularım uyuyur,
Baş bədəndə, ürək canda soyuyur,
Vətən indi gözlərimdə böyüyür,
Qayıdaram, qayıtmaram, ya qismət.

Miskin Abdal deyər sözün müxtəsər,
Bu dünyanı dolanmışam sərasər,
Karvan keçər, neçə mənzil yol kəsər,
Qayıdaram, qayıtmaram, ya qismət.

Söz tamama yetdi. İsmayıl gördü ki, Miskin Abdal yaman kövrəlib. Ancaq, deyəsən, hələ sinəsindəki sözünün hamısını deyib qurtarmayıb. Ona görə də üzünü Miskin Abdala tutub, mehriban-mehriban dedi:

– Ustad, bəlkə, yenə deyiləsi sözün var? Varsa, de gəlsin.

Bu təklif Miskin Abdalın ürəyindən oldu. Sazını Göyçə həsrətli sinəsinə basıb, "Miskini" havası üstündə aldı, görək, nə dedi:

Yaxın gəlin, yaxın, qohum-qonşular,
Sizə deyim, indi hara gedirəm.
Kövrəlmişəm, dost, tanışlar-bilişlər,
Təbriz adlı bir diyara gedirəm.

Ərənlər əlindən badə almışam,
Söz götürüb, neçə hava çalmışam,
Haqq oğluyam, Haqqa meyl salmışam,
Doğru əhdə, düz ilqara gedirəm.

Dərd üstündən dərdə dərdlər yazılıb,
Ömür bağım neçə dəfə pozulub,
Gör, yoluma neçə sitəm düzülüb...
Mən Miskinəm, ahu-zara gedirəm.

Miskin Abdal sözünü tamamlayıb, sazını köynəyinə qoyanda İsmayıl başa düşdü ki, ustad daha dediyini dedi. Artıq yola

düşmək məqamıdır.

Kənd camaatı görəndə ki, İsmayıl öz ağsaqqalına "Lələ" deyə müraciət eləyir, başladılar atalarına, özlərindən böyüklərə o gündən "lələ" deməyə.

Elə bu vaxt gördülər ki, göydən bir dəstə durna qatarı uçur. Onlar Miskin Abdalın başının üstünə çatanda hərəsi dümağ bir lələk saldı. İsmayıl buna heyran qaldı. Bunu görən Lələ dedi:

– Ya mürşidim, eşitdiyimə görə, hər ilin payızında və yazında Göyçə mahalının üstündən qatarla uçan durnalardan hər biri Miskin Abdalın ziyarətgahına bir ağ lələk salıb, qismət alırlar.

Bunu eşidəndə İsmayıl heyrətləndi. Bir xeyli sükutdan sonra gördü ki, daha getmək vaxtıdır.

Əmr elədi. Qoşun-ləşkər hərəkətə gəldi. Güney yolundan Təbrizə doğru yol başladılar. Göyçədən keçdikləri hər kənddə, hər kəsəkdə onları toy-bayramla qarşılayıb, böyük hörmət-izzətlə yola salırdılar. Başda İsmayıl olmaqla Göyçədə ilk dəfə olanların hamısı bu yerin camaatının gülər üzünə, qonaqpərvərliyinə ürəkdən həsəd aparırdı.

Nəhayət, qoşun güney yolundan yavaş-yavaş keçib, Dərəçiçək mahalının qənşərinə çatdı. İsmayıl gördü ki, bura elə gözəl bir yerdir ki, gəl görəsən. Hayana baxırsan gül, çiçək bir-birini çağırır. Quşların cəh-cəhindən doymaq olmur. Gözəllikdə bura heç Göyçədən də əskik deyil.

Bunlar Dərəçiçək mahalının gözəlliyini seyr etməkdə olsunlar, eşit dərəçiçəklilərdən. Elə ki, el-obaya xəbər çatdı kı, İsmayılın qoşunu gəlib, çatıb, hamı əl-ayağa düşdü. Elin ağsaqqalları, ağbirçəkləri, başbilənləri məsləhət-məşvərətdən sonra toy-bayramla qoşunu qarşılamağa getdilər. Onların ayaqları altında saysız-hesabsız qurbanlar kəsildi. Bu görüş əsl el şənliyinə çevrildi. Çalan kim, oxuyan kim, oynayan kim... Bir çal-çağır oldu ki, gəl

görəsən... Biləndə ki, Miskin Abdal da buradadır, day, sevincin, şadlığın həddi-hüdudu olmadı. Bunu görəndə İsmayıl, lap məəttəl qalıb, dedi:

– Ustad, bunlar səni haradan tanıyırlar? Bunların bu qədər hörmətini necə qazanıbsan?

Miskin Abdal istədi ki, ağzını açıb, İsmayıla cavab versin, bu vaxt Dərəçiçəyin bir el ağsaqqalı qabağa yeriyib, təzim elədikdən sonra dedi:

– Oğul, bu el, bu oba Miskin Abdalı çoxdan tanıyır. O, dərəçiçəklilərin ən çox böyük ehtiram bəslədiyi müqəddəs bir şəxsiyyətdir. Bu onun Dərəçiçəyə dördüncü gəlişidir. Birinci dəfə cavanlığında Təbrizə öz butasının dalınca gedəndə bu torpağa ayaq basıb. İkinci dəfə butasına yetişib, geri qayıdanda burada olub. Bütün el onda iki cavanın qovuşmasına "mübarək" dedi. Üçüncü gəlişində dərəçiçəklilər onun təbliğ etdiyi şiəlik dini məzhəbini qəbul etdilər. Bu gəliş Miskin Abdalın Dərəçiçəyə dördüncü gəlişidir.

Ağsaqqal Miskin Abdalın burada böyük bir möcüzə göstərdiyindən də söhbət açdı. Bunu eşidəndə tez də gözlərini Miskin Abdaldan çəkdi. Çünki, bu adi gözlər deyildi. Bu gözlərdən qeyri-adi qüdrət boylanırdı. Üz-gözündən nur yağan bu pirani qocanın uca adı-sanı onu tamam-kamal valeh elədi.

Eşitdiklərindən vəcdə gələn İsmayıl dedi:

– Ustad, eşitdiklərim məni, lap heyrətə gətirdi. Sən müqəddəs bir övliyasan. Sən müqəddəs insan, əvəzsiz pir, kəramət sahibisən. Mən buna çox şadam. Sənin bu ucalığın, böyük adın-sanın mənim qolum-qanadımdır. Deyə bilərsənmi, sən bu qədər ad-san, şan-şöhrətə, hətta, müqəddəsliyə necə çatdın? Bunları sənə kim ərmağan elədi?

Miskin Abdal dedi:

– Ya mürşidim, nəyim varsa, Allahın izni ilə Həzrət Əlinin köməyi ilə olub.

Sonra o başladı Həzrət Əli ilə bağlı olan yuxusunu danışmağa.

Miskin Abdal danışdıqca İsmayıl da, eşidənlər də bu işə mat-məəttəl qaldılar. Hamının heyrətdən matı-mutu qurumuşdu. İsmayıl dedi:

– Ustad, Həzrət Əli haqqında, heç, dəyərli sözün olubmu?

İsmayılın bu sualı Miskin Abdalı, elə bil, cuşa gətirdi. Sazını sinəsinə basıb, dedi:

– Ya mürşidim, Əlini necə tanıdığımı, necə sevdiyimi sözlə desəm, dilim quruyar. İzn versən, sazla deyərdim.

İsmayıl dedi:

– İzndir, ustad.

Miskin Abdal dedi:

Ələstü Rəbbi-cəm xitab olanda,
Xub qailəm o adına, ya Əli,
Sənin pənahına iman gətirdim,
Bərqəraram o sevdana, ya Əli.

O, “Zey”, “Fey” adına, o nuri səfa,
Yetişsin şəninə hər quli-kəfa,
Varlığın mənası dini-Musdafa,
Sərxeyli-karvanın cüda, ya Əli.

Fəthi şəhri-zərrin, qatili-salsal,
Mürşidi-Cəbrayıl, şahı-beyzaval,
Qəşəmşəm, qəzənfər, şiri-Zülcəlal,
Müsəmmasan bir Minada, ya Əli.

Əzrayıl çəngəlin cana çalanda,
Ruhlar pərvaz olub, cəsəd qalanda,
Üz xakə döşənib, zəlil olanda,
Özün yetiş o fəryada, ya Əli.

Məhşər günü özün tutarsan camı,
Tutmuş ətəyindən niku, bad – hamı,
Seçmə muxsullardan Miskin Qulamı,
Kərəm et, Kövsərdən badə, ya Əli.

Miskin Abdalın Həzrət Əli haqqında dediyi sözlər İsmayılın, lap xoşuna gəldi. Ustadın kamalına, bacarığına "Səd afərin" dedi. Bu söhbətdən sonra el ağsaqqalı İsmayılı qoşunu ilə birlikdə nahara dəvət elədi. İsmayılgil bir gecə onların qonağı oldular. Qonaqlıqda nələr yox idi... Süfrələr dünyanın yüz nazı-neməti ilə ləmələm dolmuşdu. Qoşun əhli doyunca yeyib-içəndən sonra rahatlandı. Qərəz, sabah açıldı. Çox qalmaq olmazdı. Çünki, Təbrizdə İsmayılın yolunu hamı böyük həsrətlə gözləyirdi. Yola çıxmaq məqamında Miskin Abdal üzünü İsmayıla tutub, dedi:

– Ya mürşidim, heç insafdan deyil, buradan sazsız-sözsüz ayrılaq.

İsmayıl Miskin Abdalın bu fikrini çox bəyəndi. Miskin Abdal sazını köynəyindən çıxardı, aldı, görək, Dərəçiçək mahalına, onun bu qonaqpərvər camaatma öz ürək sözlərini necə izhar elədi:

Bu yerin nə gözəl bir aləmi var,
Daş da çiçək açar Dərəçiçəkdə.
Hər zaman bu yerə həmdəmdir bahar,
Güllər ətir saçar Dərəçiçəkdə.

Sürüsü çaylarda su bulandırar,
Ətri, təravəti behişt andırar,
Gözəllər alovsuz, odsuz yandırar,
Ağıl başdan uçar Dərəçiçəkdə.

Bu yerdə qonağı əziz tutarlar,
Yaxşıya sevinib, pisi udarlar,
A Miskin, qanların, qana qatarlar,
Dostlar qalmaz naçar Dərəçiçəkdə.

Söz Miskin Abdalın ağzından qurtaran kimi hər yandan "əhsən", "əhsən" sədaları göylərə bülənd oldu. El ağsaqqalının məsləhəti ilə Dərəçiçək mahalından da İsmayılın qoşununa igidlər qatıldılar. Onlar da Qızılbaş papağı geyib, siyirməqılınc, öz atlarına süvar oldular. Başbilənlərin öyüd-nəsihəti, Miskin Abdalın xeyir-duası ilə qoşun-ləşkər Təbrizə doğru yol aldı.

Bir xeyli gedəndən sonra gəlib, Dərələyəz mahalına çatdılar. Miskin Abdal cavan vaxtı buradan keçdiyini, Dərələyəzin bir dəstə gözəlinə saz tutub, söz qoşduğunu söylədi. İndi o vaxtdan nələr keçmişdi... Çox şeylər dəyişmişdi. Ancaq Dərələyəzin gözəlliyi öz yerində qalmışdı. Buranın da adamları İsmayılı təmtəraqla, toy-düyünlə qarşıladı. Burada da bütün qoşuna yaxşı yemək-içmək verdilər. "Mənəm-mənəm" deyən igid, pəhləvan cüssəli oğlanlar gəlib, Qızılbaş qoşununa qoşuldular. Bir gün dincələndən sonra İsmayıl öz qoşun-ləşkəri ilə yenə də Təbrizə doğru yol başladı. İsmayıl tez-tez Miskin Abdala tərəf baxırdı. Hiss eləyirdi ki, Miskin Abdal İsmayılın ürəyindən keçənləri bilir. Ona görə istər-istəməz sazı köynəyindən çıxarıb, dedi:

– Ya mürşidim, buradan sazsız-sözsüz ötüşsək, el bizi qınayar.

İsmayıl sevincək dilləndi:

– Elədir, ustad.

Miskin Abdal dedi:

– İndi ki, belə oldu, onda bir "Sultanı" havası üstündə, görüm, Dərələyəzi necə vəsf eləyə biləcəyəm.

İsmayıl soruşdu:

– Ustad, bu nə havadır?

Miskin Abdal qürurla dilləndi:

– Ya mürşidim, bu saz havası Şeyx Heydərin oğlu Sultanəlinin adınadır.

Qardaşı Sultanəlinin adını eşidəndə İsmayıl kövrəldi, gözləri doldu. Özünü o yerə qoymayıb, dedi:

– Çal, ustad, çal!

Miskin Abdal telli sazını sinəsinə müstəkəm eləyib, aldı, görək, nə dedi, bu yurdun tərifini necə verdi:

Yaxşı ki, güzarı saldıq bu yerdən,
Özgə növrağı var Dərələyəzin.
Şahlara layiqdir hər mina gərdan,
Eldə sorağı var Dərələyəzin.

Bülbülü oxuyar güllü budaqda,
Söhbəti dolaşar dildə, dodaqda,
Düşmənə bac verməz çətin ayaqda,
Yarı-yarağı var Dərələyəzin.

Miskin Abdal deyər şux gözəllidir,
Adamlar xoş xislət, xoş əməllidir,
Ocağı, tüstüsü elə bəllidir,
Sönməz çırağı var Dərələyəzin.

Miskin Abdal sözünü tamama yetirib, sazını köynəyinə qoydu. Mahalın ağsaqqallarının, ağbirçəklərinin xeyir-duası ilə dəstə-dəstə növcavan igidlər Qızılbaş əsgərlərinin paltarlarından geyinib, bellərinə qılınc, əllərinə qalxan götürüb, qoşuna qatılıb, Təbriz deyib, yol başladılar.

Qoşun az getdi, çox getdi, İrəvan düzənliyinə yetişdi. Buradan Ağrı dağı aydınca görünürdü. Miskin Abdalın ilham pərisi yenə ona qonaq gəldi. Özü də bilmədi, sazı köynəyindən nə vaxt çıxarıb, sinəsi üstünə necə qaldırdı. Bunu görən İsmayıl Miskin Abdalı dinləmək üçün qoşuna dayanmaq əmri verdi. Miskin Abdal bir qoşa dayanan "Ağrı dağı"na nəzər saldı, bir də İsmayıla baxdı. Onun qardaşlarını yanında görməyib, pis oldu. Öz-özünə:
– Ey dili qafil, qardaşları sağ qalsaydı, yanında olardı, o da Ağrı dağı kimi daha vüqarlı, daha məğrur, daha ehtişamlı görünərdi. Lənət şeytana, lənət mərdimazara – deyib, İsmayıla üz tutdu:

– Ya mürşidim, bu dünyanı yorub, yola salan, sirri bilinməyən bu qocaman Ağrı dağına deyiləsi, ürəyimdə bir qatar sözüm var. İzn versən, onu deyərdim. Özü də səsləndirdiyim bu saz havasının adı "İbrahimi"dir. Sənin kiçik qardaşının adınadır.

Miskin Abdal gördü ki, İbrahim adını eşidəndə İsmayılı yenə qəm, kədər çuğladı. Ona görə də tez saza dəm verdi:

Dayanıbdır mətin, qoşa,
Şah vüqarlı Ağrı dağı.
Bir qüdrətdir başdan-başa,
Bar-baharlı Ağrı dağı.

Başda Nuhun gəmisi var,
Ətəyində zəmisi var,
Tarixində qəm izi var,
Boran-qarlı Ağrı dağı.

Mövlam verib, sirri pünhan,
Səcdəsinə gəlir cahan,
Abdal kimi sürür dövran,
Etibarlı Ağrı dağı.

Söz tamam olan kimi, qoşun öz yoluna davam elədi. Elə ki, gəlib, Naxçıvana çatdılar, bir də gördülər ki, dağların arasından bir atlı onlara tərəf elə gəlir, elə gəlir, elə bil, kamandan qopmuş oxdur. Atı da, özü də qan-tərin içindədir. Bunu belə görəndə İsmayıl göstəriş verdi ki, qoşun dayansın. Yəqin, bir xəbər var.

Atlı bir təhər özünə gəlib, dedi:

– Amandır, çox irəli getməyin. Neçə gündür ki, bu dağlarda, bu dərələrdə sizin yolunuzu gözləyirəm.

Baxdılar ki, atlının dili topuq çalır, danışmağa taqəti yoxdur. İsmayıl dedi:

– Ona su verin, özünə gəlsin, görək, nə olub, nə demək istəyir, nə xəbərlə gəlib?

Tez atlıya su verdilər. O toxtayıb, dedi:

– Ya mürşidim, qurumsaq Əlvənd Mirzənin qoşunu, bax, o görünən dağın dalında, qayalıqların arasında gizlənib, sənin yolunu gözləyir ki, qəfildən üstünüzə atılıb, sizi məhv eləsin. O namərd həm də möhkəm silahlanıb. Ehtiyatlı olun.

İsmayıl dedi:

– Atlını nəzarətdə saxlayın. Bir adam gedib, xəlvətcə öyrənsin, görsün, atlı düz deyir, yoxsa yalan. Bəlkə, atlı bizi Əlvənd Mirzə kimi tülkünün tələsinə salmaq istəyir.

Bunu eşidən atlı hönkür-hönkür ağlaya-ağlaya dedi:

– Dədəmin goru haqqı, düz deyirəm. Gedin, yoxlayın.

Hüseyn Lələ bəy dərhal bir adam göndərdi. O xəbər gətirdi ki, bəli, atlı düz deyir. Əlvənd Mirzə öz başının dəstəsi ilə qabaqda pusqudadır.

Bunu eşidəndə İsmayılın göstərişi ilə atlı azad olundu. Ancaq o geriyə getmədi. Xahiş elədi, yalvardı ki, onu da özləri ilə aparsınlar. İsmayıl razı oldu. Sonra göstəriş verdi ki, qoşun döyüşə hazır olsun. Bu vaxt Hüseyn Lələ bəy dedi:

– Ya mürşidim, gecəni gözləyək, Əlvəndi özümüz mühasirəyə alıb, məhv eləyək.

İsmayıl bir az kinli-küdurətli səslə dedi:

– Əlvənd Mirzə kimi bir çaqqalın üstünə gecə getməyin özü də bir kişilikdən deyil. Onda olarıq biz də Əlvənd Mirzənin tayı. Kişi öz qeyrətini döyüşdə göstərər. İndi görərsiniz, bizim qoç igidlər Əlvənd Mirzə kimi qor-qoduğun özünə, başının dəstəsinə necə divan tutur. Onda görərlər analar necə oğlanlar doğub. Hər gədə-güdənin qabağından qaçsaq, onda hamı bizi söyər.

İsmayılın əmri ilə qoşun irəliyə doğru yola düzəldi. Elə ki, gəlib, Əlvənd Mirzənin gizləndiyi dağa çatdılar, hamı döyüşə hazır dayandı.

Bir az irəli gedəndə gördülər ki, arxa tərəfdən səs-küy qopdu. Elə, İsmayıla da bu lazım idi. Qızılbaş qoşunu düşdü Əlvənd Mirzənin quldur-qaçaq dəstəsinin üstünə. Şərur düzündə onları qanlarına qəltan elədilər. Qırılan qırıldı, əsir düşən əsir düşdü, güc-bəla ilə qaça bilən də qaçıb, gözdən itdi. Əlvənd Mirzəni də diri tutdular. Əlvənd Mirzə nə qədər yalvardısa, xeyri olmadı. İsmayıl dedi:

– Görürəm, ustadın Əlvənd Mirzəyə deməyə sözü var. Qoy o, sözünü deyib qurtarsın, sonra onun layiqli cəzasını verərsiniz.

Bunu eşidəndə Miskin Abdal “Heydəri” havası ilə aldı, görək, Əlvənd Mirzənin tərifini necə verdi:

Duruşu oxşayır quldur-qaçağa,
Nə pis günə qaldı halı Əlvəndin,
Kim dedi, dava sal nadan, alçağa?
Söküldü, qalmadı nalı Əlvəndin.

İşlədi qılınclar, nərə bir yana,
Qaçdı sağ qalanlar hərə bir yana,
Əzilən dəymişi, hələ bir yana,
Töküldü, qalmadı kalı Əlvəndin.

Bu dünya varına nələri satmır,
Qırıb dağıtmağa gecə də yatmır,
Bir zənən olmağa bunları çatmır:
Tumanı, yaylığı, şalı Əlvəndin.

Özünə güvəndi, unutdu Haqqı,
Birdən tənəzzülə döndü tərəqqi,
Kişilik adına qalmadı haqqı,
Yaman əldən getdi dalı Əlvəndin.

Abdal deyər, vurun burnuna kötək,
Xisləti qırıqdı, mayası kəpək,
Necoldu ulduza hürüyən köpək,
Soyudu yalaqda yalı Əlvəndin.

Bu sözləri eşidəndə hər yandan gülüş səsləri eşidildi. Əsgərlər gülməkdən uğunub getdilər. Əlvənd Mirzənin bir layiqli cəzası var idi, onu da cəllad bilirdi. İsmayılın bir himi ilə, bayaq ha, Əlvənd Mirzə cəlladın əlində cəhənnəmə vasil oldu. İsmayıl dedi ki, onlara xəbər gətirən atlıya da qalxan-qılınc verib,

özlərindən ayırmasınlar.

Beləliklə, İsmayıl bu döyüşdən də qələbə ilə çıxdı. Onların Şərur düzündə Əlvənd Mirzə kimi bir qurumsağa qalib gəlib, məhv eləməsi, tez bir zamanda hər yana yayıldı. Qoşun Naxçıvana tərəf üz tutdu. Nəhayət, gəlib, Naxçıvana çatdılar. Miskin Abdal İsgəndər bəyi soruşdu, dedilər ki, çoxdan rəhmətə gedib. Miskin Abdal onun ruhuna dualar oxudu. Sonra kim olduğunu dedi. İsgəndər bəyin uşaqları Miskin Abdalı qucaqlayıb, əllərindən öpdülər, onu duz kimi yaladılar. İsmayılgilə də böyük hörmət-izzətlə «xoş gəldin» elədilər. Bütün qoşun-ləşkərə böyük ziyafət verdilər. İsmayıl Naxçıvan əhlinin bu qonaqpərvərliyindən çox razı qaldı. Təbriz İsmayıl üçün möhkəm darıxırdı.

Qoşun Naxçıvandan xeyli aralanmışdı ki, bir də gördülər, qabaqdan bir dəstə atlı onlara tərəf gəlir. Yaxınlaşanda Miskin Abdal Qaçaq Mehdini tanıdı. Atdan düşüb, onun yanına getdi. Mehdi çox yaşlaşmışdı. Deyəsən, köhnə dostunu anşırda bilmədi. Miskin Abdal ondan soruşdu:

– Sən Qaçaq Mehdi deyilsənmi?

O, bir az duruxandan sonra dedi:

– Bəli, Mehdiyəm.

Miskin Abdal dedi:

– Məni tanımadın? Mən Miskin Abdalam.

Qaçaq Mehdinin sevincindən gözləri doldu. Ağlamsınıb, Miskin Abdalı bərk-bərk qucaqlayıb, bağrına basdı. Onu duz kimi yaladı. Miskin Abdal İsmayılı nigaran qoymamaq üçün cavanlığında butasının dalınca Təbrizə gələrkən, Qaçaq Mehdinin onu neçə dəfə ölümdən qurtardığını, İlan Mahmudu necə öldürdüyünü, nə başınızı ağrıdım, bunun qəhrəmanlıqlarını bir-bir İsmayıla danışdı. Hamı Qaçaq Mehdinin bu mərdanəliyinə və qeyrətinə heyran qaldı. Gördülər ki, yaşı çox olsa da, Qaçaq

Mehdinin üz gözündən kişilik, dəyanət yağır. Qolları da əvvəlki qollardır. Şir şirdir. Nə qocası, nə cavanı.

Bu tanışlıqdan sonra Qaçaq Mehdi İsmayıla yaxınlaşıb, dedi:

– Oğul, icazə versən, dəlilərimlə mən bu gündən sənin xidmətində olarıq.

İsmayıl can-başla razı oldu. Bir də baxıb gördü ki, Miskin Abdalın əli yenə sazın köynəyindədir. Dedi:

– Ustad, o vaxt Qaçaq Mehdini necə tərif eləyibsən, bizə məlum oldu. İndi də sazla-sözlə Qaçaq Mehdini bizə bir daha istinad ver.

Miskin Abdal, elə bil, bir himə bənd imiş. Tez sazını köynəyindən çıxarıb, sinəsinə basdı. Aldı, görək, "İbrahimi" havası ilə nə dedi, biz də nə eşitdik:

Zaman keçib, yaş çoxalıb,
Qocalıbdı qoçaq Mehdi.
Ürəyi bir az yuxalıb,
Səndən söhbət açaq, Mehdi.

Sənə batmaz əyri, oğru,
Yaşın gedir yüzə doğru,
Yoxdur sənə zaval-sorğu,
Bir ocaqsan, ocaq, Mehdi.

Düşmənə vermədin aman,
Adın gəzir dildə yaman,
Söylənəcək zaman-zaman,
Keçirdiyin bu çağ, Mehdi.

Yağılara gərib sinə,
Od vurubsan dədəsinə,
Xanın, bəyin didəsinə,
Qılınc, xəncər, bıçaq Mehdi.

Ucaldıbsan canda səri,
Yaxşı sözün var kəsəri,
Abdal deyər müxtəsəri,
Bir dastansan, qaçaq Mehdi.

Miskin Abdala diqqətlə qulaq asan İsmayıl gördü ki, ustad burada “dastan” sözünü işlətdi. Ona görə də səbr eləməyib, dedi:

– Ustad, sənin dastanını nə vaxt eşidəcəyik?

Miskin Abdal bığaltı qımışıb, dedi:

– Allah qoysa, tezliklə, ya mürşidim.

Qoşun yenə də Təbrizə doğru yol aldı. Qabaqda İsmayıl, Miskin Abdal, Hüseyn Lələ bəy bir də Qaçaq Mehdi. Arxada da Qızılbaşların qoşun-ləşkəri. Bu qoşuna uzaqdan baxanda göz qaralırdı. Artıq Təbrizə az qalırdı. İsmayıl qəsdən Miskin Abdalın sazını dilə gətirmək üçün dedi:

– Ustad, bu yerlərə bir diqqətlə nəzər sal. Gör, buralar gözəldir, yoxsa Göyçə?

Bunu eşidəndə Göyçə Miskin Abdalın gözləri önünə gəldi. Xəyalında yola saldığı günlər oyur-oyur oyandı. Onsuz da onun üçün dünyada Göyçədən gözəl bir yer, bir məkan yox idi. Əlini atıb, sazını köynəyindən çıxardı, zilə köklədi, aldı, görək, “Miskini” havası üstündə öz ürək sözlərini eşidənlərə necə çatdırdı:

Ərzim alsın həm yaxınlar, uzaqlar,
Yüz dağ olsa, bizim dağa bənzəməz.

Şərbət olsa, bal olsa da bulaqlar,
Göyçədəki hər bulağa bənzəməz.

Toy-düyünü qulaqlardan silinmir,
Çal-çağırın say-hesabı bilinmir,
Qəm üstünə heç vaxt qəmlər ələnmir,
Bu növraqlar o növrağa bənzəməz.

Almaların sarısı var, ağı var,
Meynələrin qulac-qulac tağı var,
Bu yerlərin öz bağçası, bağı var,
Heç birisi bizim bağa bənzəməz.

Günlərimiz hay-harayla keçərdi,
Qız sevənlər toy-şərbətin içərdi,
Biçinçilər zəmiləri biçərdi,
Bu çağlarım ötən çağa bənzəməz.

Qızlar saça gül-çiçəyi düzərlər,
Cavanların ürəyini üzərlər,
Abdal deyər, naz-qəmzəli gözəllər
Sənubər tək gül yanağa bənzəməz.

İsmayıl gördü ki, Miskin Abdal nə Göyçəsini, nə də yaş ötüb keçsə də, Sənubərini heç cürə unuda bilmir. Ürəyindən onun bu sədaqətinə, etibarına “səd-afərin!“ dedi.

Nəhayət, qoşun təmtəraqla Təbrizə daxil oldu. Yollara xalça döşənmişdi. Şamlar az qala dünyanı işıqlandırdı. Hər yanda bir toy-büsat, bir çal-çağır oldu ki, gəl görəsən. Elin adətinə görə, İsmayıl qırmızı geyinib, şahlıq tacını başına qoyub, taxta əyləşdi.

Şahlıq şərbətini Miskin Abdalın əlindən alıb, nuş elədi. Şaha ilk xeyir-duanı Miskin Abdal verdi. Təbriz cuşa gəlmiş bir ümman kimi coşub, çağlayırdı. Sarayda bir toy-bayram, bir vur-çatlasın var idi ki, gəl görəsən. Aşıqlar da ki, heç kəsə aman vermirdilər. Cılız da İsmayılın özü ilə Göyçədən gətirdiyi on iki aşığın sazı-avazı, zəngulələri bütün Təbrizi başına götürmüşdü. Bu şadyanalığa dünyanın hər yerindən qonaqlar təşrif buyurmuşdular. Elə ki, saz-söz meydanı Miskin Abdala verildi, hamı susdu. Miskin Abdal meydanın bir o başına getdi, bir bu başına gəldi, telli sazını sinəsinə basıb, "İsmayılı" saz havasında aldı, görək, nə dedi:

Bu tac, bu taxt qılsın vəfa
Şıx oğlu Şah İsmayıla,
Xızır Nəbi, ol Mustafa
Olsun pənah İsmayıla.

Haqqdan yerə gəlir bir səs:
Bəxtin üzü dönməsin tərs.
Qır qazana düşər nakəs,
Etsə günah İsmayıla.

Abdal telə mizrab vurar,
Gün gələr ki, dastan qurar,
Yerdə Əli kömək durar,
Göydə Allah İsmayıla.

Miskin Abdal əlini sazdan ayırmamış hər yandan "afərin", "əhsən" səsləri göyə bülənd oldu. İsmayıl ayağa qalxıb, ucadan dedi:

– Məni istəyən, ustada xələt.

Şah İsmayılın ağzından bu söz çıxmamış meydana bir xələt, bir nəmər töküldü ki, gəl görəsən. Qızıl pul, başqa hədiyyələr meydanda üst-üstə qalaqlandı. Bunu görən Miskin Abdal şahın qarşısında təzim eləyib, dedi:

– Qibləyi-aləm sağ olsun. Mənim dünya varında tamahım yoxdur. Hörmət-izzətinə görə var ol, səni min yaşa. Məsləhət görürəm ki, yığılan bu nəmər kasıb-kusuba paylansın.

İsmayıl üzünü Hüseyn Lələ bəyə tutub, dedi:

– Lələ, düz deyirmişsən, doğrudan da, Göyçənin «miskin»i də, «abdal»ı da şahlığa layiq adamlardır.

Sonra üzünü Miskin Abdala çevirib, dedi:

– Ustad, məsləhətinə görə var ol. Dediklərini qəbul eləyirəm. İndi keçək başqa məsələyə.

Miskin Abdal soruşdu:

– Qibləyi-aləm, nədir o məsələ?

Şah İsmayıl dedi:

– Ustad, oxuduğun tərifdə yenə “dastan” sözünü işlətdin. Allah qoysa, nə vaxt bir dastan eşidəcəyik?

Miskin Abdal dedi:

– Şah sağ olsun, darıxmaq lazım deyil. Vaxtı çatanda şahımızın adına layiq bir dastan danışacağam. Təki, sən sağ ol. Sənin sayəndə hələ çox işlər görəcəyik.

Şah İsmayıl soruşdu:

– Ustad, bu günkü çalıb-çağırmağın qurtardı?

Miskin Abdal təmkinlə dedi:

– Xeyr, qibləyi-aləm, qurtarmayıb. Hələ, şahımızın adına bir saz-söz bəxşişim də var.

Şah İsmayıl dedi:

– Nədir o bəxşiş?

Miskin Abdal dedi:

– Qibləyi-aləm, indi sənin adına layiq bir “Divani” çalıb-oxuyacağam.

Bu sözü eşidəndə Şah İsmayıl maraqla soruşdu:

– Ustad, «Divani» nədir?

Miskin Abdal:

– Qibləyi-aləm, «Divani» sazın-sözün övliyasıdır.

Şah İsmayıl təəccüblə:

– «Divani» sazın-sözün övliyasıdır?

Miskin Abdal dedi:

– Bəli, qibləyi-aləm.

Şah İsmayıl dedi:

– Ustad, onda bu «Divani»nin adı nədir?

Miskin Abdal dedi:

– Qibləyi-aləm, bu «Divani»nin iki adı olacaq.

Şah İsmayıl soruşdu:

– İki adı olacaq?

Miskin Abdal dedi:

– Bəli, hökmdar.

Şah İsmayıl dedi:

– O adları qabaqcadan deyə bilərsənmi?

Miskin Abdal dedi:

– Niyə deyə bilmirəm, hökmdar.

Şah İsmayıl dedi:

– Onda, de gəlsin.

Miskin Abdal dedi:

– Qibləyi-aləm, saz-söz sənətində «Divani» ilk dəfə çalınıb-oxunduğu üçün adını “Baş divani” qoymuşam. Buna həm də şahımızın ad-sanına, şərəfənə layiq olaraq “Şah divani” də demək olar.

Bunu eşidəndə Şah İsmayıl çox xoşhal olub, dedi:

– Yaxşı, ustad, bəs, ilk «Divani»nin sözü necədir?

Miskin Abdal sazı sinəsinə alıb, dedi:

– Qibləyi-aləm, çalıb-oxuyaram, bilərsən.

Bunu deyib, telli sazını dilə gətirdi. Könülləri riqqətə gətirən bir avazla "Şah divani" üstündə çalıb-oxumağa başladı:

Bey bismillah əzbərimdir, hey Xudadan, ya Əli,
Ən ibtida gəldi səda, Ərş-Əladan, ya Əli,
Badi sər-sər, lohu qələm oldu, dünya olmamış,
Bir Cəbrayıl qalxdı göyə tək dəryadan, ya Əli.

Səlli-aləm, mahi-aşkar, zülmətdən var pərdəsi,
Sey-Sirrdən səda gəldi, Cəbrayıl çəkdi bəhsi,
Həqiqəti düz bilmədi, tərsə döndü kəlməsi,
Alışıb, yandı şahpəri, oldun fərman, ya Əli,

Yandı şahpər, endi suya nələr gəldi yadına,
Xaki-kəlam verdi salam, yetişdi muradına,
Haqq-Təala özü dedi irəhmət ustadına,
Hər tərəfdən səda gəldi, «Əhsən, əhsən!», ya Əli.

Hər kəlmədə tərif edir, «Quran»da ayət səni,
Cəmi aləm övliyalar, yazır əsli-zat səni,
Həbib özü tərif edir külli-vilayət səni,
Zahirdə təvəllüdsən, sirri-Sübhan, ya Əli.

Göyçəlidir Miskin Abdal, yoxdur heç bir günahım,
Hər kəlmədə, hər ayədə sən ol mənim pənahım,
Puli-Sirat, Haqq divandır, ol Xudadan köməyim,
Vəli sənsən, vəkil sənsən, Şiri-Yəzdan, ya Əli.

Söz tamama yetəndə heyrətdən yerində qalmış şah irəli yeriyib, meydanda Miskin Abdalı qucaqlayıb, bağrına basdı. Hər yandan alqış sədaları ucalıb, göylərə bülənd oldu. Məclisə toplaşanların çoxu başqa ölkələrdən olduqlarından, əvvəlcə bu adamın kim olduğunu öyrənmək istədilər. Biri şahdan icazə alıb, soruşdu:

– Aşıq, sən haradansan?

Aşıq sözünü eşidəndə Şah İsmayıl özü ayağa qalxıb, dedi:

– Ay camaat, çox da ki, Miskin Abdal gözəl saz çalıb-oxuyur. Bilin və agah olun, o, böyük şairdir, əsl Haqq aşığıdır. O, heç kəsə bənzəməyən ustad sənətkardır. Harada doğulduğunu, haralı olduğunu o özü deyəcək.

Miskin Abdal məclisin tən ortasında sazını köksünə sıxıb, aldı, görək, nə dedi:

Mən aşıq, göycə dənəm,
Kim görüb Göyçədə nəm,
Hər kəsin öz eli var,
Mən ulu Göyçədənəm.

Alqış sədaları dünya ilə bir oldu. Miskin Abdal, elə bil, öz sazı ilə, sözü ilə bütün məclisi ovsunlamışdı. Şah da özünü göyün yuxarı qatlarında hiss eləyirdi. Vaxtın necə keçdiyini yadına salan yox idi. Hamı istəyirdi ki, Miskin Abdal danışsın, çalıb-oxusun, onlar da şirin-şirin qulaq assınlar.

Bu ara məclisdəkilərdən biri icazə alıb, dedi:

– Ustad, haralı olduğunu bildik. Deyə bilərsənmi, hansı məzhəbə, hansı məsləkə qulluq eləyirsən?

Miskin Abdal dedi:

– Onda, qulaq as:

Anadan pür kamal olub,
Şəriətə tapınmışam.
Din yolunda Abdal olub,
Təriqətə tapınmışam.

Miskin günüm gəlməz saya,
Qismətimdir ismət, haya,
Qulluq edib, tək Xudaya,
Mərifətə tapınmışam.

Miskin Abdal Tanrı qulu,
Qəlbindədir Haqqın yolu,
Ululardan daha ulu
Həqiqətə tapınmışam.

Bunu eşidənlər gördülər ki, yox ayə, bu haqq aşığı kimi ərşdən-gürşdən danışır. Ariflər də o saat başa düşdülər ki, Miskin Abdala vergi verilib. Özü də, maşallah, yaşı yetmiş olsa da, elə qıvraq hərlənir ki, elə bil, on dörd yaşında cavan oğlandır. Nə qədər çalıb-çağırırsa, yorulmur ki, yorulmur. Hamı başa düşdü ki, o adi insan deyil, övliyadır, pirdir, ocaqdır. Bu vaxt cavan bir aşıq onun əlindən öpüb, yazıq-yazıq dedi:

– Ustad, başına dönüm, dədənə qurban olum, atam-anam sənə fəda olsun, mən əlimə təzə-təzə saz götürüb, aşıqlıq eləmək istəyirəm. Ancaq bilmirəm, aşıq necə olmalıdır ki, onun el içində hörməti olsun.

Miskin Abdal dedi:

– Bala, bunu çox sənin kimilərinə demişəm. İndi deyim, sən də eşit. Amma bu sözlərimi sırğa elə, qulaqlarından as. Bunları unutsan, aşıq olmayacaqsan:

Aşıq, kəşt eləyib ağır elləri,
El içində namus, arı unutma,
Hər yanı gəz, təmiz saxla adını,
Dost yanında etibarı unutma.

Halal mala haram qatmaq nə lazım?
Hədər yerə kaman atmaq nə lazım?
Hər yetənə yalan satmaq nə lazım?
Əhd-peymanı, düz ilqarı unutma.

Miskin Abdal, bir qonaqsan dünyada,
Könlün bir dəryadır, ürəyin ada,
İstəsən ki, yetişəsən murada,
Yaş torpağı, dar məzarı unutma.

Söz tamama yetəndən sonra gördülər ki, budur ey, gecə, lap arxada qalıb, xoruzlar banlaşır, dan yerinə də səda düşüb. Şahın göstərişi ilə məclis dağıldı. Miskin Abdal da sarayda öz yerində dincəlməyə getdi. Elə, gözünə təzəcə yuxu getmişdi ki, qəflətən ayıldı. Nə qədər elədi, yuxusu gəlmədi ki, gəlmədi. Çar-naçar qalxdı. Bir az var-gəl elədi. Sonra sazını əlinə alıb, nə isə yeni bir hava çalmağa başladı. Miskin Abdalın başı saza yaman qarışmışdı. Şah İsmayıl da şirin-şirin yatırdı. Birdən qulaqlarına saz səsi gəldi. Elə bildi ki, yuxu görür. Gözlərini açıb gördü ki, yuxu nədir, zad nədir? Bu səs, doğrudan da, saz səsidir. Ancaq saz elə gözəl çalınır kı, eşitməkdən doymaq olmur. Özü də Şah İsmayıl bu saz havasını təzə eşidirdi. O, sazın səsinə heyran qala-qala yavaş-yavaş səs gələn otağa getdi. Qapını açanda Miskin Abdalı saz çalan gördü. Miskin Abdal şahı görən kimi mizrabını sazın telindən ayırıb, ayağa qalxdı. Sazın susmasından narahat

olan Şah İsmayıl özündən biixtiyar dedi:

– Ustad, ey sazın-sözün hökmdarı, sazı susdurmaqla mənə qəsdmi eləyirsən? Sənin sazının səsinə ayılmışam.

Miskin Abdal dedi:

– Şah sağ olsun, bu havanı təzəcə çalırdım. Adını da hələ seçməmişdim. Səni oyadan bu havanı "Şah qalxdı" adlandıracağam.

Şah İsmayıl başı ilə razılığını bildirdi. Miskin Abdal "Şah qalxdı" havasını böyük şövqlə çalmağa başladı.

Aradan bir neçə gün keçdi. Şah yenə bir məclis qurdu. Məclisdə saray əyanları, mötəbər adamlar, aşıqlar, bir də çox hörmətli qonaqlar var idi. Hamının gözü Miskin Abdalda idi ki, görək, çalıb-oxuyurmu? Bu ara məclisin ağsaqqalı bəyan elədi ki, bu axşamkı şənliyimizin başında duran böyük ustadımız Miskin Abdaldır. Buna hamı sevindi. Miskin Abdal şahanə addımlarla saz çiynidə meydana daxil oldu. Ədəblə bütün məclisə salam verdi. Yavaş-yavaş şahın qabağına gəlib, dedi:

– Qibləyi-aləm, sənin icazənlə birinci dəfə nə çalım?

Şah İsmayıl istəyirdi ki, ağzını açıb, nəsə desin, bu vaxt Hüseyn Lələ bəy qabağa yeriyib, dedi:

– Ustad, özün bilmirsənmi, nə çalacaqsan? Şah sevəni çal.

Bu sözlər Miskin Abdalın ürəyinə yatdı. İlhamı yenidən cuşa gəldi. Bir az fikrə gedəndən sonra sol əli ilə sazın qolunu sıxıb, sağ əlini sazın sinəsində gəzdirdi. Birdən bir tüğyan qopardı ki, gəl görəsən. Telli saz dilə gəldi. Miskin Abdal sazı çala-çala dedi:

– Şahim, bu çaldığım təzə havanın adı da qoy "Şah sevəni" olsun.

Hamı əhsən dedi. Miskin Abdal üzünü şaha tutub, "Şah sevəni" havasında aldı, görək, nə dedi:

Dostu-mehribanım, yetiş dadıma,
Səndən qeyri yox imdadım, ağlaram.
Ah çəkib, dağlara salaram səda,
Qohum gəlməz, gülər yadım, ağlaram.

Dəstində zülfiqar, Düldülə süvar,
Məhzərül-əcayib, bir adı Kərrar.
Müşkülə düşmüşəm, könlüm intizar,
Sən gəlməsən, ey ustadım, ağlaram.

Salma nəzərindən, salma İlahim,
Dar gündə köməyim, püştü pənahım,
Ərşə bülənd olub fəryadi-ahım,
Abdaldır, Miskindir adım, ağlaram.

Qızılbaş şahı gördü ki, elindən-günündən ayrıldığı üçün Miskin Abdal yaman kövrəlib. Bir də ki, yaşı o yaş deyil. Ancaq neyləmək olardı? Miskin Abdal kimi müdrik, ağıllı bir adam ona hava, su kimi lazım idi.

Onun könlünü almaq üçün dedi:

– Ustad, məclisdə hamının diqqəti səndədir. Adın dillərdən düşmür. Özün də Göyçə kimi ağır bir eldənsən. İndi hamı mat qalıbdır ki, görəsən, Miskin Abdala bu ağlı, bu müdrüklüyü kim verib, bu böyük ustad dərsini kimdən alıb?

Miskin Abdal sazının zilini zil, bəmini bəm eləyib, aldı, görək, şaha nə cavab verdi:

Təmiz əkilmişəm, pak doğulmuşam,
Atadan-anadan lütfi-halalam.
Dərsimi Haqq verib, ağdan almışam,
Dilimdə əzbərdir doxsan min kəlam.

Qafdan qərar tapmış, kafdan kainat,
İsmi feyli-hərfi olmuş əsli-zat,
Veydən bəna tutub, kaf-nundan nicat,
Yeydən bişərikdi, bişərikdi lam.

Əlifdən əladı, alidən ali,
Cimdən dücahandır böyük cəlalı,
Mimdən mehribandır məddi-məalı,
Nun – hər vaxt zəmini xəlq edib tamam.

Sin şükrü sənalar, vov vahid ismə,
Hey həlim, rey rəhmi acı yel əsmə,
Zey zəlil bəndədən, sin nəzər kəsmə,
Sat sahib ixtiyar, mən həqir qulam.

Ocaqzadə bir təb əhli nökərəm,
Kuyində qələndər, sinə dəftərəm,
Mimnən Məhəmmədəm, cimnən Cəfərəm,
Ləqəbi çox olan Miskin Abdalam.

Eşidənlər gördülər ki, Miskin Abdal dəryadır, özü də ucu-bucağı görünməyən bir dərya. Bu nurani kişi bütün elmlərin açarını qatlayıb, qoyub cibinə.

Şah İsmayıl üzünü Miskin Abdala tutub, iftixarla dedi:

– Ustad, olarmı, Göyçənin gözəlliyi ilə bizi bir feyziyab eləyəsən?

Bu sözü eşidəndə Miskin Abdalın eşqi cuşa gəldi. Meydanda bir o başa, bir bu başa gərdiş elədi, sonra gəlib, tən ortada dayanıb, dedi:

– Şah sağ olsun, çal-oxu deyirsən, çalım-oxuyum. Sən dedi-

yin kimi Göyçənin gözəlliyini "Göyçə gözəlləməsi" havası üstündə oxuyacağam.

Şah İsmayıl dedi:

– Buyur, ustad.

Miskin Abdal başladı çalıb-oxumağa. Göyçənin gözəlliyini məclisdəkilərə, görək, necə çatdırdı, biz də deyək, siz də eşidib, şad olasınız:

Eşidin sözümü ərzim qananlar,
Uludur, bilinməz yaşı Göyçənin,
Dünyanı ay, yorub, yola salanlar,
Qafdan da ucadır başı Göyçənin.

Ərənlər at çapar haradan-hara,
Köhlənlər yaraşar pəhləvanlara,
Adı bəzək olub çox dastanlara,
Qədrini nə bilər naşı Göyçənin?!.

Xəngəli, xaşılı gəlməyib sana,
Beçə qızartması loğmandır cana,
Ballı qayğanağı hələ bir yana,
Dillərdə söylənir aşı Göyçənin.

Torpağın üstündə qızıl rəngi var,
Hər elin, obanın öz ahəngi var,
Sanasan qurtarmaz, neçə kəndi var,
Yaqutdur, qızıldır daşı Göyçənin.

Cahanda hələ də tapılmır tayı,
Xoşdur bir-birindən ötən hər ayı,

Cənnət misallıdır baharı, yayı,
Özgə bir aləmdir qışı Göyçənin.

Mehmanlar bu yurdu müqəddəs sayıb,
Bunu qanmayanlar eyləsin ayıb,
Neçə mahallara bərəkət yayıb,
Öküzü, kotanı, xışı Göyçənin.

Yazda qol çırmanar bağa, bostana,
Hər yayı bənzəyər bir gülüstana,
Payız-qış evlərdə qurular xana,
Kəsilməz il boyu işi Göyçənin.

Çörək ətirlidir isti təndiri,
Baldan da dadlıdır motal pendiri,
Kababın xoş iyi tutar hər yeri,
Çəkilməz ocaqdan şişi Göyçənin.

Arı şanı neylər, qalarsa balsız,
Qərib-qürbət eldə qalmışam halsız,
Mən yaxşı bilirəm, Miskin Abdalsız
Axır gözlərinin yaşı Göyçənin.

Gördülər ki, oxuduqca Miskin Abdalın gözləri boşalıb-dolur. Şah İsmayıl ustadın bərk kövrəldiyini hiss eləyib, söhbətin səmtini dəyişmək üçün dedi:

– Ustad, olmazmı, sazı bir “Baş divani”yə kökləyəsən.

Miskin Abdal dedi:

– Baş üstə, qibləyi-aləm. Ancaq mən bu havanı həm də “Şah divani” adlandırmışam.

Şah İsmayıl dedi:

– Nə olar, ustad. Qoy "Şah divani" olsun. Sən sazını dilləndir, biz də eşidək.

Miskin Abdal şahın bu sözündən sonra sazı sinəsinə sıxıb, aldı, görək, nə dedi:

Yazıq könlüm, nə sızlarsan, bülbülə tay olmusan,
Haçan yardan yarımısan, sevilib, bay olmusan,
Sən dərvişsən Haqq yolunda, Haqqı istə, Haqqı sev,
Nə olsun ki, bel bükülüb, kamana tay olmusan.

Yar olsan da incimə gəl, ulu Tanrı bağışlar,
Dərgahında apaydındır bu cizgilər, naxışlar,
Qoy didəndən sel-sel olub, axsın qara yağışlar,
Axır məhşər görərsən ki, köpüklü çay olmusan.

Çay olmağın paklığındır, durma, yuyun, paka çıx,
Doğru-düzə yol açıqdır, nə qar, boran, nə palçıq,
Miskin Abdal, dolansan da ayaqyalın, baş açıq,
Zər qədrini zərgər bilər, zaylara say olmusan.

Miskin Abdalın bu «Divani»si məclis əhlini ovsunlamışdı. Miskin Abdal bunu hiss eləyib, sazın kökünü dəyişməyib, başladı başqa bir «Divani» oxumağa:

Ey dost, sənin bağın cənnət, narın üzə bilmərəm,
Ha silkinsəm, dəryan dərin, narın üzə bilmərəm.
''Qırxlar piri'' özü düzüb ayağıma atəşi,
Alışaram  Səməndər tək, narın üzə bilmərəm.

Dərviş gərək bu meydanda qurban olsun baş-başa,
Mürşidimdən üzüm dönməz, dünya gəlsə baş-başa.
Ayıq olan uzaq olsun, yetsin gərək baş-başa,
Fələk nə vaxt sökər üzüm, narın üzə bilmərəm.

Miskin Abdal, eşq əhlisən, ömrü vermə bada hey,
Özün haqqsan, Haqq əlindən götür nuş et, badə hey.
Məhşər günü tab etməzsən solxum-solxum bada hey,
Nə tutmusan özün dərviş, narın üzə bilmərəm.

Miskin Abdal sözünü tamamlayan kimi, şah dedi:

– Ustad, oxuduğun bu «Divani»lərdə elə mətləblər var ki, onların izahına ehtiyac hiss elədik.

– Şahım, mən bilirəm, sən nələri deyirsən. Amma sənin sayəyi-mərhəmətinlə indi hamı bizim təriqətin qayda-qanunlarını yaxşı bilir. Mənim yolum Haqq yoludur. Mən Haqqın dərgahına qovuşmaq üçün bu dünyada çox şeyə çoxdan əlvida demişəm. Mən Səfəvi müridiyəm. Kim Səfəvilərin böyük, müqəddəs yolunu anlayırsa, bu kəlmələrin başa düşülməsi onlar üçün çətin ola bilməz.

Bunları eşidən hər bir kəs Miskin Abdalın ağlına, kamalına bərəkallah dedi. Heyrətini gizlədə bilməyən şah ayağa qalxıb, amiranə səslə dedi:

– Bitikçi başı!

Bitikçi başı əmrə müntəzir halda dayanıb, dedi:

– Nədir, qibləyi-aləm?

Şah İsmayıl dedi:

– Tez xəttatı buraya çağır.

Bitikçi başı:

– Baş üstə, qibləyi-aləm.

Bir göz qırpımında bitikçi başı xəttatla geri qayıtdı.

Xəttat:

– Mən buradayam, qibləyi-aləm.

Şah İsmayıl dedi:

– Xəttat, yaz: "Anadan olduğu kəndin və beş kəndin vergisini veririk Miskin Abdala həmişəlik – nəsilbənəsil".

Xəttat:

– Yazdım, qibləyi-aləm.

Xəttat gümüş suyu ilə yazdığı fərmanı şahın qabağına qoyub, dala-dala geri çəkildi. Şah İsmayıl möhürünü qabdakı qızıl suyuna batırdı, fərmana vurdu. Sonra da qələmini qızıl suyuna batırıb, qol qoydu. Fərmanı Miskin Abdala doğru uzadanda, ustad ağır addımlarla irəli gəldi, istədi şahın qabağında yeri öpsün.

Şah dedi:

– Yox, yox, ustad, sən yer öpmə, sənin yerin çox ucadır. Sənin bu gecə verdiyin zövqün müqabilində bu fərman kiçik və acizdir. Sən bir daha doğma anamızın dilinin nə qədər şairanə, musiqili bir dil olduğunu xatırlatmaqla, aşıq, saz-söz sənətinin qüdrətini də göstərdin. Əhsən, «səd əhsən» sənin kimi ustadın kamalına.

Miskin Abdal Şahdan fərmanı alıb, dala-dala öz yerinə qayıtdı.

Şah İsmayıl sözünə davam elədi:

– Lələ.

Lələ dedi:

– Bəli, qibləyi-aləm.

Şah İsmayıl dedi:

– Lələ, Göyçə mahalında verdiyimiz sözün birini yerinə yetirdik. Qaldı ikincisi.

Lələ dedi:

– O hansıdır, qibləyi-aləm?

Şah İsmayıl dedi:

– Lələ, Göyçədə iqamətgah qurdurmaq lazımdır. Vaxt olanda gedib, bu cənnət guşədə dincələrik.

Lələ dedi:

– Baş üstə, qibləyi-aləm.

Şah İsmayıl dedi:

– Lələ, bir məsələ də var.

Lələ dedi:

– Qibləyi-aləm, bəyan edin, hali olaq, yerinə yetirək.

Şah İsmayıl dedi:

– Lələ, Miskin Abdal çox müdrik adamdır. Belələri hər zaman ələ düşməz. Bizim ölkəmizin Dağıstan tərəfdən təhlükəsi var. Sabahdan Miskin Abdalı Dağıstana elçi göndərək. Oradan gözlənilən dava-şavanı qoy ağlının gücü ilə, danışıqlar yolu ilə ram eləsin.

Hüseyn Lələ bəy dedi:

– Qibləyi-aləm, bəlkə, Miskin Abdal razı deyil.

Lələ bu sözü deyəndə hamı Miskin Abdala baxdı. Miskin Abdal əllərini sinəsinə qoyub, şaha təzimi-əzəm eləyib, başı ilə razılığını bildirdi. Bundan xoşhal olan şah dedi:

– Ustad, mən heç vaxt bu ayrılığı istəməzdim. Mən sənin həm nurlu üzündən, həm müdrik kəlamlarından, həm də mənə ilham verən sazından-sözündən ayrılıram. Neyləyək, iş belə gətirdi. Sağlıq olsun, bir neçə ilə vəziyyəti yaxşılaşdırıb, geri qayıdarsan. Onsuz da sənsiz darıxacağıq. Sabah buradan Göyçəyə, oradan da köç-külfətini götürüb, Dağıstana yola düş.

Sabah açılan kimi şah fərmanı Miskin Abdala verib, ona "yaxşı yol!" dedi. Miskin Abdal da şahla, saray əyanları ilə

xudahafizləşib, "Haçadil" atının belinə qalxdı və vətənə doğru yol başladı. Bir müddətdən sonra gəlib, doğma yurduna yetişdi. Eşidənlərin hamısı onun başına toplaşdı. Hal-əhval tutdular. Miskin Abdal başına gələnlərin hamısını danışdı. Bir neçə gün də burada qalıb, nəhayət, el-oba ilə, ata-anası ilə görüşüb, arvad-uşaqlarını götürüb, köç-külfəti ilə gedib, Dəmirqapı Dərbəndə çatdı. Evini-eşiyini rahatlayıb, başladı öz ölkəsinin elçisi kimi işləməyə. Burada olan xəta-bəlaları ağlının gücü ilə sovuşdurdu.

Dağıstanda bir Axtı bölgəsi var idi. Burada da azərbaycanlılar yaşayan bir böyük kənd. Kənd adamları Miskin Abdalın Dağıstana gəldiyini eşidib, çox sevindilər, onu kəndə dəvət etdilər. Miskin Abdal həmin kəndə təşrif buyurdu. Onun bu gəlişi əsl toy-bayrama çevrildi. Hamı bir nəfər kimi Miskin Abdalın təbliğ etdiyi şiəlik dini təriqətinə iman gətirdi. Bu kəndi onun adı ilə "Miskinli" adlandırdılar.

Miskin Abdal eşitdi ki, burada bir dağ var. Orada da "Qırxlar piri" deyilən bir ziyarət yeri var. Deyilənlərə görə, bir vaxtlar burada qırx müqəddəs övliya dəfn olunduğundan bu yer ziyarətgaha, pirə dönüb, zaman-zaman adamların ümid, inam yerinə çevrilib. Miskin Abdal da kəramət sahibi kimi bu yeri dəfələrlə ziyarət elədi. O hər dəfə "Qırxlar piri"nə ziyarətə gedəndə böyük oğlu Şadmanı da özü ilə aparırdı. Axırınca dəfə onlar pirdən geri qayıdanda yolun kənarında bir çəmənzarlıq gördülər.

Bu çiçəklik oğlu Şadmanın çox xoşuna gəldi. Gözünü onlardan ayırmayıb, dedi:

– Ay ata, bir bax, elə bil, bu güllər Göyçə gülüdür.

Oğlunun bu sözü Miskin Abdalın şair könlünə, elə bil, od qoydu. Yenə vətən yadına düşdü. Xəyalında dağı arana, aranı dağa çəkdi. Əl atdı telli sazına. Sinəsini boşaltmasa, dözə

bilməzdi. Bir təzə saz havası səsləndirdi. Adını da qoydu "Göyçə gülü". Görək, Miskin Abdal bu hava üstündə öz vətəninə olan məhəbbətini necə dilə gətirdi:

"Şiş pilləkən" dağların şah dağıdır,
Maralları neçə başı dolanır.
Quldur-qaçaq bu yerlərə yağıdır,
Fürsət güdər, dağı-daşı dolanar.

Ətəyində durna gözlü gölü var,
Zirvəsində dərilməmiş gülü var,
Yağılara basılmayan eli var,
Yazda yazı, qışda qışı dolanar.

Torpaqları zər yükünə yüklənib,
Könül sazı "Şahsevənə" köklənib,
Karvanları uzaq səmtə diklənib,
Nagah-nagah burda naşı dolanar.

Basılmazdır hər igidi, ərəni,
Biri saxlar neçə bəndi, bərəni,
Baxıb görsə dağda çiçək dərəni,
Ürəyində can ataşı dolanar.

Doğmaları bu torpağa yad olmaz,
Qəriblərin dəhanında dad olmaz,
Qürbət eldə Miskin Abdal şad olmaz,
Gözlərində kədər yaşı dolanar.

Bir neçə il idi ki, Miskin Abdal burada işləyir və yaşayırdı. Ailəsindən savayı burada heç bir əziz-xələfi, doğması yox idi. Ömür-gün yoldaşı Həlimə, uşaqları onun vətən niskilinə təskinlik gətirirdi. Ancaq doğma el-oba, ata-ana üçün həmişə darıxırdı.

Bir gün səhər tezdən Miskin Abdal evdən çıxanda arvadına tapşırdı ki, şam yeməyinə yağlı bir aş bişirsin. Axşam evə dönəndə gördü ki, evdən aş qoxusu gəlmir. Zarafatla arvadına dedi:

– Arvad, yoxsa aşı bişirdiniz, yediniz, mənə qalmadı.

Həlimə dedi:

– Ay kişi, Allah məni öldürsün. Gəlib çıxdın? Başımı Həsən ilə Əli elə qatıb ki, heç bilmirəm, axşam nə vaxt olub.

Miskin Abdal soruşdu:

– Uşaqlara nə olub, arvad?

Həlimə dedi:

– Yaman halsızdırlar. Sabahdan dillərinin arasından su da keçməyib.

Miskin Abdal dedi:

– Bəlkə, soyuq dəyib?

Həlimə dedi:

– Nə bilim, vallah. Axı, heç onları gözdən qoymamışam. Üç-beş yaşlı uşaqlar hara gedərlər ki, soyuğa da dəysinlər. İndi sən bir az uşaqlara göz-qulaq ol, mən də aş qazanını ocağın üstünə qoyum.

Uşaqların azarlamasını eşidən Miskin Abdalın da qanı bərk qaraldı. Qərib-qürbət eldə vətən həsrəti onun halını pozdu. Hərlənib, güzgüyə baxdı. Gördü ki, bura gələndən bəri xeyli qocalıb. Uşaqları da belə görüb, xeyli kədərləndi. Dörd yanına baxdı, dostlarını, həmdəmlərini görmədi. Əlacsız qalıb, ürəyindən keçənləri sazı ilə bölüşmək istədi:

Ay dolanıb, il ötüşür,
Yavaş-yavaş qocalıram.
Cavanlığım yada düşür,
Ötüşür yaş, qocalıram.

Bu gen dünya mənə dardı,
İşim-peşəm ahu-zardı.
Şəvə kimi telim vardı,
Çallaşıb baş, qocalıram.

Heyf, ömür getdi bada,
Xəbər olsun dosta, yada,
«Sözüm keçmir» arvada da,
Bişməyir aş, qocalıram.

Zimistandır hər gələn yaz,
Dünya uzun, ömür, lap az,
Dilimdə söz, əlimdə saz,
Gözümdə yaş qocalıram.

Miskin Abdal – bəlli adım,
Pərvazlanmır qol-qanadım,
Qayaları oynadardım,
Tərpənmir daş, qocalıram.

Miskin Abdalın belə dərdli-dərdli oxumasını görən arvadı zarafatla dedi:

– Ay kişi, Allah məni öldürsün. Mən nə vaxt sənə aş bişirməmişəm?

Miskin Abdal dedi:

– Arvad, incimə, bir zarafat idi, elədim.

Bir azdan aş hazır olub, süfrəyə gəldi. Miskin Abdal aşdan yedi. Böyük uşaqlar – Şadman və Məleykə də doyunca yedilər. Ancaq balaca Əli və sonbeşik Həsən yeməyə əl də uzatmadılar. Elə süfrə təzəcə yığışdırılmışdı ki, qapı döyüldü. Qapını açdılar ki, bir nəfər Qızılbaş şahından ona namə gətirib. Naməni açıb, oxuyanda gördü ki, anası Növrəstə ilə atası Məhəmməd kişi rəhmətə getdiyinə görə, şah Miskin Abdala köç-külfəti ilə birlikdə geri dönməyə icazə verir.

Bundan sonra Miskin Abdalın kefi yaman pozuldu. Özü də bilmədi, sazını necə götürüb, sinəsinə sıxdı. Dərdini bu qərib eldə, görək, necə izhar elədi:

Qadir Allah, əlim əldən uzaqdır,
Yazıq könlüm görən, indi dinərmi?
Vaxt yetişib, ömürdə qış-sazaqdır,
Şahin könlüm yuvasına enərmi?

Elim qalıb neçə dağlar dalında,
Qismətim var, yazılıbsa alında,
Gedəcəyəm, ayaq qalsa yalın da,
Pir igidin çırağı da sönərmi?

Miskin Abdal, hanı zərdən libasın?
İnsan olan unudarmı obasın?
Yada salıb ulu-ulu babasın,
Axır günü Göyçəsinə dönərmi?

Gecədən köçü hazırladılar. Dan yerinə səda düşməmiş yola düşdülər. Zarıncı, xəstə Həsən ilə Əli bərk-bərk büküldülər.

Dağıstan dağlarına çatanda gün çeşdə qalxmışdı. Miskin Abdal tələsirdi ki, uşaqlari sağ-salamat öz elinə çatdırsın. Sonra da Allah kərimdir.

Birdən-birə göyün üzünü qara buludlar aldı. Yaz ağzı idi, birdən-birə elə bir qar, elə bir çovğun başladı ki, gəl görəsən. Borandan göz-gözü görmürdü. Uşaqların dördünü də güc-bəla ilə yorğana bükdülər. Soyuq adamın, lap sümüyünə işləyirdi. Hava ayazıyanda gördülər ki, Həsən ilə Əlini şaxta dondurub. Çoxdan cənnət quşuna çevirib. Miskin Abdalın bir zaman gördüyü yuxusu yadına düşdü. Olacağa çarə olmadığını yaxşı bilsə də, itirdiyi uşaqları üçün göyüm-göyüm göynədi. Elə bil, başından tüstü-duman qalxdı. Nə etmək olardı?!. Yer qazıb, uşaqlarını torpağa tapşırdı. Sonra yanıqlı-yanıqlı oxumağa başladı:

Bu dağlar zülüm dağlar,
Kəsilib yolum dağlar,
Hanı o bir cüt balam:
Həsənim, Əlim, dağlar?!

Bu bələni dağ kəsər,
Ürəyim tel-tel əsər,
Ana "balam, vay!" – deyib,
Dörd yanı mələr, gəzər.

Bu dağlarda dağım var,
Ölənim var, sağım var,
Ağla gözlərim, ağla,
Dil deməyə ağım var.

Başını qaldırıb, Dağıstan dağlarına baxdı. Baxdı ki, dağlar elə əvvəlki kimi öz kefindədir. Onun dərdinə şərik çıxmaq fikrində

deyil. Qübarlanıb, sazını sinəsinə sıxdı. Üzünü dağlara tutub, aldı, görək, nə dedi:

Məğribdən məşriqə səf çəkib, durub,
Qüdrətdən çəkilib baş-başa dağlar.
İtaət boynuna həmayil vurub,
Misli-pəsəd, xotkar, xan, paşa dağlar.

Baxıb hökmü yek, dal dürey dükafa,
Gah kükrəyib, gah gəlirsən insafa,
Dey peykarə çəkib, bəyaz əffafə,
Pərvərdin geydirir qumaşa dağlar.

Ağ çeşmən sərindən car eylər seli,
Yaşıl tirmə qurşar adaca beli,
Zabitə kölgəsi, Dağıstan yeli,
Sədrin səfasıdır həmişə, dağlar.

Nəs illərdən satın aldın nəs günü,
Çağırıb dumanı, tökdün çiskini,
Gözü yaşlı qoydun Cüda Miskini,
Eylə gülə-gülə tamaşa, dağlar.

Dağların zülmündən gileyli Miskin Abdalın ürəyinə bir qatar da söz gəldi:

Adəmdən cavandır, Nuhdan qocadır,
Bir sirrdir, bilinməz yaşı dağların.
Tufana əyilməz, yada basılmaz,
Həmişə qar olar başı dağların.

Əhvalı necədir, bir səyyaddan sor,
Quşa cələ olur, ahulara tor.
Can desən – can deyər, çor söyləsən – çor,
Səs salar, səs verər guşu dağların.

Qüdrətdən yetibdi uca barata,
Sinəsi açıqdır elə, elata,
Mən Cüda Miskinəm, başımda xata,
Kəsib yollarımı qışı dağların.

Miskin Abdal gördü ki, yox, bu dedikləri ilə ürəyi sakitləşmir. Ürəyini boşaltmaq üçün yenə sazını sinəsinə bərk-bərk sıxıb, dağlara ün saldı:

Qadir Allah qismət etdi cəfanı,
Gecə-gündüz qəm kotanı çəkərəm.
Elə bildim, qopdu Nuhun tufanı,
Bəxt şumuna dərd-sərimi əkərəm.

Kəsilməzdi əllərimin səxası,
Zərdən idi köynəyimin yaxası,
Sınaqlıdır abidlərin çuxası,
Başım ilə daş qalalar sökərəm.

Qürbət eldə yanar ömür sürənlər,
Yasa batar bu halımı görənlər,
Yada düşdü igid ərlər, ərənlər,
Göz yaşımı sel yerinə tökərəm.

Həsrət qaldım Göyçə kimi elimə,
Əl uzatdım, əl çatmadı əlimə,
Əslim, zatım manşır olub aləmə,
Ev yıxmaram, müdam evlər tikərəm.

Miskin Abdal, çox ağlayıb, sıxtama,
Yazan yazıb bu işləri baxtıma,
Çoxu keçib, nə qalıb ki, vaxtıma,
Haqq yolunda mən bir qulam, nökərəm.

Miskin Abdal sözünü tamamlayıb, sağ qalan uşaqlarına şükr eləyə-eləyə köçünü hayladı. Bir xeyli gedəndən sonra axır ki, gəlib, Göyçəyə yetişdi. Yazın əvvəli idi. Hər yan gül-çiçəyə bürünmüşdü. Bütün el-oba onun gəldiyini eşidib, pişvazına çıxdı.

Miskin Abdal başına gələnləri hamıya danışdı. Hamı Həsənin, Əlinin ölümünə görə çox kədərləndi. Ancaq uşaqlardan Şadmanın və Məleykənin sağ qalmasına çox sevindilər. Allaha min şükür dedilər. Miskin Abdal camaatla birlikdə ata-anasının qəbrini ziyarət elədi.

Bir neçə gün burada qalandan sonra arvad-uşağını öz evində qoyub, "Haçadil" atına minib, tək-tənha Təbrizə yola düşdü.

Az getdi, çox dayandı, çox getdi, az dayandı, nəhayət, gəlib, Təbriz şəhərinə çatdı. Saraya gedib, Şah İsmayıl ilə, əyan-əşrəflərlə görüşdü, əhval-pürsanlıq elədi. Şah Miskin Abdalın başına gələnlərdən çox mütəəssir oldu.

Şah İsmayıl aradan bir az keçəndən sonra Miskin Abdalı yenidən öz elçisi kimi başqa bir ölkəyə göndərdi. O, elçisi olduğu dövlətlərdə şahının bütün tapşırıqlarını can-başla yerinə yetirdi, təkcə Osmanlı dövlətində öz işlərini tamamlaya bilmədi. Çünki, Osmanlı hökmdarı Sultan Səlim bir dəfə onun möhkəm könlünə dəymişdi.

Bu belə olmuşdu. Miskin Abdal Osmanlıya təzəcə gəlmişdi. Günlərin birində Sultan onu yanına çağırtdırıb, dedi:

– Miskin Abdal, sən öz şahının adına dillər əzbəri olan bir “Baş divani” saz havası yaradıbsan. Olmazmı, mənim də adıma başqa bir “Baş divani” saz havası düzüb-qoşasan.

Çox hazırcavab olan Miskin Abdal Sultanın qarşısında şax dayanıb, vüqarla demişdi:

– Bəli, Sultan, öz şahımın adına gözəl bir saz havası qoşmuşam. İndi ki, istəyirsən, birini də sənin adına qoşaram.

Miskin Abdal sazının zilini zil, bəmini bəm eləyib, aldı, görək, nə dedi:

Şeşpərlərə əgər nişan olsa yaxan, qoymaram,
Cəng olarsa bu meydanda könül yıxan qoymaram.
Yaxşılıqdan payım vardır, qismətimdir halallıq,
Beca yerə sitəmlərə qəlbi yaxan qoymaram.

Pak olmasan ulu Tanrı verər ağır cəzanı,
Qır qazanda qaynadar O, düz yolundan azanı,
Sitəmlərə düçar edər mərdə quyu qazanı,
Mərdi-məzar deyiləni səmtə yaxın qoymaram.

Miskin Abdal göstərməyib heç zaman sərt üzünü,
Dərviş olub, əridərəm ürəklərin buzunu.
Yol gedirəm diyar-diyar neçə illər uzunu,
Düz ərkanı əyri gedən – ya bəy, ya xan, qoymaram.

Arif adamlar Miskin Abdalın nəyə işarə elədiyini o saat anladılar. Saz da, söz də hamının xoşuna gəldi. Əlalxüsus da, Sultan Səlimin. O ağzını açıb, “Məni istəyən ustada xələt!” – demək

istəyəndə, Miskin Abdal irəli yeriyib, dedi:

– Sultan, mənə heç bir xələt, nəmər lazım deyil. Mən pay alan yox, pay verənlərdənəm. Heç kəsin də varında gözüm yoxdur. Dünyanın malı dünyada qalacaq. Var, pul əl kiridir, gələr də, gedər də. Yaxşılıq, mərdlik isə həmişəlikdir.

Eşidənlər Miskin Abdalın bu sözlərinə «bərəkallal» deyib, onu alqışladılar. Sultan Səlim üzünü Miskin Abdala tutub, dedi:

– Miskin Abdal, mənə bir de görüm, şahın ilə mənim adıma qoşduğun bu «Divani»ləri necə bir-birindən ayırd eləmək olar?

Miskin Abdal dedi:

– Sultan, adları ilə.

Sultan təəccüblə soruşdu:

– Necə yəni, adları ilə? Hər ikisinin də adı “Baş divani” deyilmi?

Miskin Abdal təmkinini pozmayıb, dedi:

– Xeyr, Sultanım, hər iki «Divani»nin adı “Baş divani“ deyil. Şah İsmayılın adına qoşduğum havanın adı “Baş divani”, sənin adına qoşduğumunku isə “Ayaq divani“dir.

Bunu eşidəndə sultanı, elə bil, ildırım vurdu. Əsəbi halda soruşdu:

– Bu nə deməkdir? Bunu necə başa düşmək olar?

Miskin Abdal qürurla dedi:

– Çox asan. Burada başa düşülməyən heç nə yoxdur. Şah İsmayıl mənim şahımdır. Sən isə başqa bir ölkənin sultanısan. İndi mənim sənə bir sualım var, Sultan. Əgər sənin elçin səni başqa hökmdarlardan üstün tutmasa, sən ona hansı gözlə baxarsan? Yəqin ki, ona, nankordur, deyərsən.

Sultan özündən asılı olmayaraq dedi:

– Bəli.

Miskin Abdal dedi:

– Sultan, onda inciməyin yeri yoxdur. Əgər sənin adına qoşduğum “Ayaq divani” saz havasının adı xoşuna gəlmirsə, bu adı dəyişmək də olar.

Sultan Səlim narazı halda soruşdu:

– İndi nə ad qoymaq istəyirsən?

Miskin Abdal dedi:

– Sultana layiq bir gözəl ad: “Osmanlı divanisi”.

Bu söz Sultan Səlimin acığından köz-köz olan ürəyinə bir su çilədi. Başı ilə razılığını bildirdi. Ancaq Miskin Abdalın xətrinə dəyə bilmədi, çünki, onu hamı bir kəramət sahibi, övliya kimi tanıyırdı, qədrini bilir, hörmətini saxlayırdı.

Ürəyini Sultana boşaltdığına görə Miskin Abdal özünü rahat hiss elədi. Çünki, o Sultan Səlimin nə yuvanın quşu olduğunu yaxşı bilirdi. O zəhərli bir ilan kimi Şah İsmayılı vurmağa girəvə axtarırdı. Hələlik, Miskin Abdal buna yol vermirdi.

Bir neçə gündən sonra Miskin Abdalın qapısı döyüldü. O qapını açıb, Sultan Səlimin adamını gördü. Həmin adam bildirdi ki, Sultan onun “Haçadil” atını almaq istəyir. Bu sözdən bərk qəzəblənən Miskin Abdal dərhal şaha məktub yazıb, elçilikdən geri çağırılmasını rica elədi. Şahın cavabını gözləmədən tezliklə Təbrizə qayıtdı.

Şah İsmayıl Miskin Abdalın Osmanlı dövlətində başına gələnləri eşidib, ustadının kamalına, qeyrətinə dönə-dönə “əhsən“ dedi. Xeyli vaxtdan bəri Miskin Abdalın sazından-sözündən ayrı düşən Şah üzünü ona tutub, dedi:

– Ustad, yadındadırmı, bizim bir “dastan” əhdi-peymanımız var idi. İndi o əhdi-peymanımızı yerinə yetirməyin vaxtı deyilmi?

Miskin Abdal dedi:

– Bəli, qibləyi-aləm, vaxtıdır. Sabah axşam məclis qur. Dedi-

yim sözə əməl eləyim.

Şahın əmri ilə bir gün sonra sarayda məclis quruldu. Buraya çoxlu mötəbər adamlar toplaşmışdı. Meydana xalçalar döşənmişdi. Hər yandan çil-çıraqlar, şamlar bərq vururdu. Hamı yerbəyer olan kimi Miskin Abdal şahın yanından qalxıb, sazı çiynində meydana daxil oldu. Məclisə başdan ayağa göz gəzdirib, salam verdi. Sonra üzünü şaha tutub, dedi:

– Qibləyi-aləm, dastan nə şeirdir, nə nağıl. Dastan qəhrəmanlar haqqında sözlü-nağıllı düzülüb-qoşulan bir uzun hekayətdir. Bəzən, bunu bir neçə gecə də danışsan, qurtarası deyil.

Bunu eşidən məclisdəki sənətkarların matı-mutu qurudu. Çünki, onlar hələ indiyəcən dastan nə olduğunu bilmirdilər. Bir də bunu haradan biləydilər. Axı, ilk dəfə idi ki, dastan söylənilirdi. Miskin Abdal ilk dastanı yaradırdı.

Miskin Abdal sözünə davam eləyib, dedi:

– Qibləyi-aləm, bu dastanın adı belədir: "Aslan Şah və İbrahim". Mən bu dastanı Şeyx Heydərin oğlanlarına düzüb-qoşmuşam. Aslan şah sənsən, İbrahim isə nakam qardaşın.

Şah başı ilə razılığını bildirdi. Miskin Abdal üç ustadnamədən sonra dastanı söyləməyə, çalıb-oxumağa başladı. Hamı elə qulaq kəsmişdi ki, məclisdə milçək vızıltısı da eşidilirdi. Nə məclisdə əyləşənlər, nə də dastana diqqətlə qulaq asanlar Miskin Abdalın söhbətindən doymaq bilmirdilər. Dastanın şirinliyi hamının yuxusunu ərşə çəkmişdi. Miskin Abdal axşamdan başladığı "Aslan şah və İbrahim" dastanının duvaqqapmasını oxuyub qurtaranda bir də gördülər ki, xoruzlar banlamağa başlayıb, dan yeri də təzəcə sökülür.

Dastan gecəsindən doymayan Şah İsmayıl soruşdu:

– Ustad, de görüm, bundan başqa da dastanın varmı?

Miskin Abdal dedi:

– Hələlik, biri də var, qibləyi-aləm.

Şah İsmaylı soruşdu:

– Ustad, o nə dastandır?

Miskin Abdal dedi:

– Qibləyi-aləm, o "Yetim Hüseyn" dastanıdır.

Şah İsmayıl soruşdu:

– Ustad, o dastanda söhbət nədən gedir?

Miskin Abdal dedi:

– Yetim Hüseyndən, qibləyi-aləm.

Şah İsmayıl soruşdu:

– Ustad, bəs "Yetim Hüseyn" dastanını nə vaxt eşidə bilərik?

Miskin Abdal dedi:

– Şahımın könlü nə vaxt istəsə, onda.

Bu sözdən Şah İsmayıl çox xoşhal oldu. Elə, söhbət təzəcə qurtarmışdı ki, şaha xəbər gətirdilər ki, qonşu ölkədən bir qasid gəlib, şahı görmək istəyir. Bu qasid kim ola, kim olmaya, qonşu dövlətin hökmdarı Şeybanı xanın göndərdiyi adam. Şahın göstərişi ilə qonaq içəri daxil oldu. O, əlindəki naməni şaha verdi. Şah naməni oxuyub, gördü ki, Şeybani xan onu davaya çağırır. Bunu eşidəndə, elə bil, hamının üstünə su ələndi. Xeyli çək-çevir, məsləhət-məşvərətdən sonra belə qərara gəldilər ki, bu qasidə bir adam qoşub, Şeybani xanın yanına göndərsinlər. Şahın adından ona məsləhət görsün ki, bu işdən əl çəksin, davaya lənət deyiblər. Elə də elədilər. Amma Şeybani xan həmin adamları geriyə qaytarıb, Şah İsmayıla bir kəşkül, bir də bir çəlik göndərdi. Bu onun şah yox, dərviş nəslindən olduğuna işarə idi. Belə bir təhqirə dözmək olmazdı. Şah İsmayıl qoşun böyüyünü çağırıb, məsələdən hali elədi. Qoşun döyüşə hazır oldu. Bu vaxt Miskin Abdal irəli çıxıb, dedi:

– Şahım, mən Şeybani xanı yaxşı tanıyıram. O, Osmanlı sul-

tanının fitvasına gedir. Düdəmənin biridir. O qədər gücü yoxdur. İcazə versəydin, döyüşə əvvəlcə Göyçədən, Dərəçiçəkdən, Dərələyəzdən, Qaçaq Mehdinin dəstəsindən olan igidlər girərdi. Görsək ki, düşmən güc gəlir, onda, sən bütün qoşununla hay verərsən.

Miskin Abdalın bu məsləhəti şahın ağlına batdı. Miskin Abdal gördü ki, bunu eşidən igidlər cilov gəmirirlər. Elə bir himə bənddirlər ki, qılınclar qınından sıyrılsın. Miskin Abdalın ürəyi cuşa gəldi, sazını çiynindən aşırıb, bir “Atlandırma” havası çaldı ki, dağ-daş lərzəyə gəldi. Atlar qulun kimi kişnədilər. İgidlər sazın bu səsindən cuşa gəlib, atlara süvar oldular. Miskin Abdal da “Haçadil”in belinə qalxdı. Sinəsində saz çala-çala, qoşunun qabağında getdi.

Şeybani xan uzaqdan gördü ki, paho, Şah İsmayılın qoşununun qabağı açıldı. Baxanda adamın gözü qaralır. Ota, suya san var, qoşuna yox. Bunu görəndə canına bir vicvicə düşdü ki, ta nə deyim. Sonra gördü, qoşunun qabağında gələnlərdən biri də Miskin Abdaldır. Özü də sinəsində saz çala-çala gəlir. Öz-özünə fıkirləşdi ki, ey dili-qafil, mən bunları davaya çağırmışam, yoxsa, toya? Sümüyü yaman ürpəşdi. Qabaq cərgədəki nər kimi döyüşçüləri görəndə ayağı yerdən üzüldü. O saat anladı ki, bunlara gücü çatmayacaq. Daha, bir qələt idi, eləmişdi. Bir belə camaatın qabağında sözünü geri götürə bilməzdi. Bir də, Şah İsmayıl çox ağır təhqir olunmuşdu. Yaxşı bilirdi ki, Şah İsmayıl qisası qiyamətə qoyanlardan deyildi. Qoşunlar üz-üzə dayandılar. Şah İsmayıl ucadan dedi:

– Əgər Şeybani kişidirsə, meydana çıxsın. İkimiz vuruşaq. Kim-kimi bassa, qələbə onun olsun. Nahaq yerə qırğına yol verməyək.

Daşdan səda gəldi, Şeybani xandan yox. O baxdı ki, iş

şuluqdur, dərhal öz qoşununa əmr elədi ki, hücum eləsinlər. Şah İsmayılın igidləri, elə bunu gözləmirdimi? Dərhal Miskin Abdalın dediyi kimi, Göyçədən, Dərəçiçəkdən, Dərələyəzdən, Qaçaq Mehdinin dəstəsindən olan igidlər misri qılınclarını qınından sıyırıb, düşmənin üstünə atıldılar. Gözünüz yamanlıq görməsin, Şeybani xanın qoşununa bir divan tutdular ki, day demə. Leş-leşə söykəndi. Qırılan qırıldı, qaçanlar it unu kimi dağa, dərəyə səpələndi. Bu döyüşü seyr edən İsmayılın rəngi gül kimi açılmışdı. O tapşırdı ki, «Şeybanidir, quleybanidir, nədir», onu diri tutsunlar. Nə qədər axtardılarsa, Şeybanini nə dirilərin, nə də ölülərin arasında tapa bilmədilər. Bir də baxıb gördülər ki, bu düdəmə qorxusundan qaçıb, bir kolun arasında gizlənib. Onu murdar ət kimi sürüyə-sürüyə şahın qabağına gətirdilər. Şeybaninin tula sifətini görən şah dedi:

– Necəsən, quleybani xan?

Şeybani tir-tir əsə-əsə, Şah İsmayılın ayaqlarına döşənib, dedi:

– Dədəm, anam sənə qurban, şah. Mənə rəhmin gəlsin. Mən şeytan felinə düşdüm. Bir qələtdir eləmişəm, keç günahımdan. Bir də belə qələt eləmərəm. Amanın bir günüdür, məni öldürmə.

Şah İsmayıl dedi:

– Quleybani xan, sənin kimi ləyaqətsiz adamın yaşamağından ölməyi məsləhətdir. Amma səni elə belə yox, əzabla öldürəcəyəm.

Şahın əmri ilə Şeybani xanı aparıb, zindana atdılar. Qabağına çörək əvəzinə bir az təzək, kərmə qoydular. Şah İsmayıl bununla Şeybani xana demək istəyirdi ki, sən xan nəslindən yox, davar nəslindənsən. Bir neçə gündən sonra zindanı açıb, gördülər ki, Şeybani xan aclığa tab gətirməyib, təzəkdən xeyli gəmirib. Şah İsmayıl baxdı ki, Miskin Abdalın sinəsi yenə

sözlə dolub. Odur ki, dedi:

– Ustad, bəlkə, bu quleybaniyə bir deyiləsi sözün var?

Miskin Abdal dedi:

– Bəli, qibləyi-aləm, izn versən, deyərəm.

Şah İsmayıl dedi:

– İzndir, ustad, de gəlsin.

Aldı Miskin Abdal, görək, Şeybani xanın tərifini necə verdi:

Atalar deyib ki, davaya lənət,
Çox dedik, gəlmədi yola Şeybani,
Qatdı aralığı vermədi möhlət,
Nə yaman tez girdi kola Şeybani.

Əsli haramzada, zatı qırıqdı,
Dəhanda söz qalmaz, ağzı cırıqdı,
Hulqumu quruyub, çoxdan zırıqdı,
Qurumsaq, dələduz, qula Şeybani.

Hazırdır ömürlük zəhər olmağa,
Qoymadı gecəni səhər olmağa,
Çalışdı, köhləndə yəhər olmağa,
Döndü bir qatırda çula Şeybani.

Tamahı ucundan tora düşübdü,
Qayadan yapışıb, zora düşübdü,
Zindana düşməyib, gora düşübdü,
Aslan meydanında tula Şeybani.

Adını “xan“ qoyub, düdəmə imiş,
Ağıldan kəm imiş, dəmdəmə imiş,

Hədəsi, qorxusu sərdəmə imiş,
Dəyməz beş şahılıq pula Şeybani.

Bir zaman Allaha Allah demirdi,
Qoyunun ətindən kabab yemirdi,
Zindanda acından kərmə gəmirdi,
İndi çaqqal kimi ula, Şeybani.

Miskin Abdal deyər, sağdı sağırı,
Açıldı, qalmadı pası-paxırı,
Nə yaman pis gəldi onun axırı,
Tay oldu bir qara qula Şeybani.

Söz Miskin Abdalm ağzından qurtaran kimi Şah İsmayıl əmr elədi ki, bu məlunu aparıb, bütün ölkəni dolandırsınlar, sonra qul bazarına çəksinlər. Qoy hamı bunun cəmdəyinə tüpürsün. Sonra cəllada tapşırdılar ki, aparıb, bir dərədə onun başını kəssinlər, cəmdəyi qurda-quşa yem olsun. Qoy hamı bilsin ki, günahsız tökülən qanların cəzası budur.

Elə də elədilər. Şeybani xan cəhənnəmə vasil oldu. Onun əlindən cana gəlmiş xalq da dincəldi. Bu qələbədən sonra ölkədə bayram oldu. Hər yan al-əlvan bəzəndi. Elə bil, dünya çıraqbana döndü. Bir şadlıq, bir şadyanalıq başladı ki, gəl görəsən.

Axşam sarayda dastan məclisi quruldu. Miskin Abdal "Yetim Hüseyn"i başlamazdan əvvəl şaha xitabən, iki saz havası çaldı. Birincisinin adını "Şah Xətai" gəraylısı, ikincisinin adını "Şah sarayı" qoydu. Sonra başladı səhər xoruz banına kimi "Yetim Hüseyn" dastanını söyləməyə. Aşıqlar da bu təzə dastanı da, saz havalarını da sinədəftər elədilər.

Miskin Abdal qocalsa da, şah ondan əl çəkmirdi. Yenə də ən

çətin yerlərə onu səlahiyyətli elçi göndərirdi. Fürsət düşən kimi də bir məclis təşkil etdirər, Miskin Abdalı çaldırar-oxutdurar, həyatdan bir zövqü-səfa alardı. Miskin Abdal da onunla nəfəs alır, İsmayılı öz doğma balası kimi sevirdi.

Bir gün xəbər gəldi ki, bəs, bilməzsənmi, Osmanlı sultanı Səlim müharibə etməyə gəlir. Bunu eşidən qoşun böyüyü gəlib, Şah İsmayıla dedi:

– Qibləyi-aləm sağ olsun. Osmanlıların qoşununun sayı bizimkindən qat-qat çoxdur. Özləri də gedib, Firəng dövlətindən top gətiriblər. Onlar indi Çaldıranın o bir yanında filan dağın arxasında xəbərsiz dincəlirlər. Gəl gecə ikən üstlərini kəsək. Belə olsa, biz onları məğlub eləyərik.

Qoşun böyüyünün bu sözlərini eşidən Şah İsmayıl bərk qəzəbləndi. Dedi:

– Bu nə deməkdir? Biz bəyəm, oğru, qulduruq ki, gecə yarı gedib, karvan qabağı kəsək? Dava igid üçündür. Neyləyək ki, onlar çoxdur. Kişi kimi vuruşmalıyıq. Allah ya onlara verər, ya bizə.

Beləliklə, Çaldıran düzündə dava başladı. Qılınc, qalxan səsindən, igid nərəsindən bu düz ərəsət-məhşər ayağına dönmüşdü. Bütün dünya al-qana batmışdı. Şahın döyüşçüləri şir kimi döyüşürdülər. Şah İsmayılın qılıncının nər savaşına düşmən tab gətirə bilmirdi. Osmanlılar pərən-pərən düşmüşdülər. Qaçıb dağılan vaxt birdən osmanlılar tərəfdən toplardan atəş açılmağa başladı. Nər savaşına tab gətirməyən osmanlılar firənglərin təzə icad elədiyi bu silahlardan Qızılbaş ordusu üzərinə od yağdırmağa başladılar. İlk dəfə belə bir silah görən qızılbaş ordusu pərən-pərən düşdü.

Bu dəhşətli qırğına tab gətirə bilməyən Şah İsmayıl bir dəli nərə çəkib, yaralı aslan kimi düşmən üzərinə şığıdı. Onun qılıncı

havada hər parlayanda neçə-neçə düşmən başı yetişmiş meyvə kimi Qəmərdayın ayaqları altına tökülürdü. Bir neçə həmlədən sonra Şah İsmayıl düşmən səflərini yarıb, Firəng toplarına çatdı. Onun odlu qılıncı topların lülələrini biçib-tökməyə başladı.

Düşmən bü dəhşətli mənzərədən qorxub, geri durdu. Dava səngidi. Hər iki tərəf böyük itkilər verib, öz tərəfinə çəkildi.

Döyüş meydanında bir addım belə yanından aralanmadığı şahının çox kədərli olduğunu görən Miskin Abdal ondan sual elədi:

– Şahım, niyə belə kədərlisən?

Şah İsmayıl kədərli gözlərini onun üzünə dikib, dedi:

– Ustad, qoşunun azəqəsi tükənib. Arxadan da hələ yemək gəlib çatmayıb. Belə ağır döyüşdə ac qoşunla neyləmək olar?

Miskin Abdal fikirləşmədən cavab verdi.

– Şahım icazə versəydi, qoşunu yedizdirib, doyuzdurardım.

Şah İsmayıl təəccüblə soruşdu:

– Ustad, mən bir qüdrətli ölkənin şahı ola-ola bunu eləyə bilmədiyim halda, sən necə eləyəcəksən?

Miskin Abdal əvvəlki inam və qətiyyətlə dedi:

– Şahım, sən mənə izn ver. Sonrası ilə işin yoxdur.

Bu sözdən çaşqın qalmış şah istər-istəməz icazə verdi. Sonra Miskin Abdalı diqqətlə izləməyə başladı ki, görsün, o, bu qədər yeməyi haradan alıb, döyüşçülərə paylayacaq?! Gördü ki, Miskin Abdal xurcunundan bir kömbə çörək, bir badya da qatıq çıxardı. Əsgərlərə bir-bir kömbədən və qatıqdan bölüb, verdi. Payladıqca nə bu bir kömbə çörək, nə də bir badya qatıq qurtarmırdı ki, qurtarmırdı. Hələ, bir az da artıq qaldı. Bunu görən şah heyrətə gəldi. Onsuz da Miskin Abdalın böyük kəramət sahibi olduğunu bilirdi. Ancaq belə bir möcüzəyə adamın inanmağı gəlmirdi.

Sabah dava yenidən qızışdı. Çox ağır savaş oldu. Axır ki, topların hesabına Osmanlılar döyüşdə uğur qazandılar. Osmanlılar Qızılbaşlardan xeyli əsir almışdılar. Xəbər gəlib çatdı ki, sultanın əmri ilə paşa əsirləri qılıncdan keçirtdirir. Bunu eşidəndə istər şahın, istərsə də saray əyanlarının kefinə soğan doğrandı. Çox məyus oldular. Çıxış yolu axtardıqları vaxt Miskin Abdal dilləndi:

– Şahım, icazə versəydin, bu işi də öz yoluna qoyardım.

Bunu eşidəndə, elə bil, Şah İsmayılın başından duman ayazıdı.

Axı, o, Miskin Abdalın hünərinə yaxşı bələd idi. Bu nurani ağsaqqal haraya gedirdisə, orada iş düzəldir, əmin-amanlıq yaradırdı.

Şahından icazə alan Miskin Abdal Osmanlı dövlətinə, Sultan Səlimin yanına getdi. Ədəb-ərkanla salam verdi. Sultan da, başqaları da onu böyük ehtiramla qarşıladılar. Sultan gördü ki, Miskin Abdal yaman dolub, sözlü adama oxşayır. Odur ki, dedi:

– Miskin Abdal, xeyir ola, sən hara, bura hara? Nə əcəb gəlmisən? Bəlkə, çox sevdiyin şahının bir xahişini gətiribsən?

Miskin Abdal gözlərini sultanın gözlərinə zillədi. Bu baxışdan sultanı, elə bil, vahimə basdı. Bunu hiss edən Miskin Abdal dedi:

– Sultan, mən sənin yanına şahımın xahişini yox, sənə deyəcəyim öz sözlərimi gətirmişəm.

Sultan şaşqın halda dedi:

– Nədir o sözlər?

Miskin Abdal dedi:

– Onda, qulaq as.

Bunu deyib, Miskin Abdal sazını köynəyindən çıxarıb, bir "Osmanlı divanisi" üstündə aldı, görək, nə dedi:

Çərxi-gərdiş yarıtmadı dövlətdən, vardan məni,
Min-bir dərdi əzab verib, ayırdı yardan məni.
Səkrəqibin fitnə-feli çəkdi məni çarmıxa,
Yazıq Həzrət İsa kimi asdı divardan məni.

Bunu eşidən sultanı qucunma tutdu. Ürəyində öz-özünə dedi: “Ayə, bu məni, lap biabır elədi ki... “

Miskin Abdal aldı «Divani»sinin o biri bəndini:

Türk əcəmə, əcəm türkə zülm eləsə günahdır,
İkisi də bir kökdəndi, yaradan da Allahdır,
Öz elinə düşmən kəsin axır günü kütahdır,
Qadir mövlam, uzaq eylə bayquşdan, sardan məni.

Sultan gördü ki, Miskin Abdal ovu gözündən vurdu. Onun sözləri eşidənlərin hamısını yerindən tərpətdi. Gördülər ki, kişi, lap «Quran»ın ortasından danışır. Özü də, onun kəramət sahibi – bir övliya olduğu hamıya bəlli idi.

Onların nə fikirləşdiyini hiss eləyən Miskin Abdal aldı, görək, sözünün tapşırmasında onlara nə dedi:

“Qırxlar piri“ özü verib dərsimi ümman mənim,
Çətin girə ürəyimə, ləini-şeytan mənim,
Seyyid Miskin Abdal mənəm, söz mənim,
meydan mənim,
Qoruyanım, özün qoru xain dostlardan məni.

Söz tamama yetəndə Miskin Abdal gördü ki, sultan da, onun adamları da yaman kirişiblər. Daşdan səs çıxır, onlardan yox. Axır ki, sultan bir az özünü düzəldib, dedi:

– Miskin Abdal, açıq de görüm, sözün, mətləbin nədir?

Miskin Abdal dedi:

– Sultan, qulaq as. Qoy dediklərimi paşaların da eşitsin. Miskin Abdal "Paşa köçdü" saz havası üstündə görək, nə dedi, biz də nə eşitdik:

Sultanın fərmanı, paşa qəzəbi,
Paşam, mürvət elə, belə kar olmaz!
Üzdü məni bu yolların əzabı,
Paşam, mürvət elə, belə kar olmaz!

Canım qoydum mürşidimin yolunda,
Sərgərdən qalmışam Urum elində,
İslam bada gedir cəllad əlində,
Paşam, mürvət elə, belə kar olmaz!

Miskin Abdal çəkər qəmi, möhnəti,
On iki imamdı peyğəmbərin züryəti,
Sünni, şiə – Məhəmmədin hümməti,
Paşam, mürvət elə, belə kar olmaz!

Bu sözdən sonra, elə bil, sultan da, yanındakılar da yatmışdılar, ayıldılar. Bildilər ki, Miskin Abdal nə demək istəyir. Sultan Səlim Miskin Abdalı süzüb, dedi:

– Miskin Abdal, sənin sözlərini yerinə yetirmək üçün iki şərtim var. Əməl eləsən, əsirlər qılıncdan keçirilməyəcək. Əməl eləyə bilməsən, bu, mənim günahım deyil.

Miskin Abdal dedi:

– Sultan, o şərtlər hansılardır?

Sultan dedi:

– Birincisi, bizə görə bir söz də çalıb-oxuyasan. Özü də ustadnamə ola. İkincisi, gərək, sənin istəkli şahının qılıncını mənə gətirtdirəsən.

Miskin Abdal hər iki şərti qəbul eləyib, dedi:

İki sultan əyləşib nərgiz taxtında,
Ortalığa şəmşir endi, ağlaram.
Məkas fəqan etdi dərya üzündə,
Yelkənim tərsinə döndü, ağlaram.

Nökər olan qulluq edər xanına,
Məşuqlar susadı aşiq qanına,
Cəbrayıl yetişdi Haqq məqamına,
Ahından şahpəri yandı, ağlaram.

Ya Rəbb, görən, kimlər yetər dadıma,
Həsrət qaldım, ocağıma, oduma.
Miskinəm, ərənlər düşdü yadıma,
Didəm yaşı selə döndü, ağlaram.

Hamı gördü ki, Miskin Abdal baltanı, lap kökündən vurdu. Nə deyirsə, düz deyir. Sultan çox nainsaflıq eləyir. Onu deyim ki, sultan da əvvəlki sultan deyildi. Miskin Abdalın sözləri onun ürəyinə bir tıqqıltı salmışdı. Onu eşitməsə, bu işin axırının yaxşı olmayacağını hiss eləyirdi.

Qərəz, nə başınızı ağrıdım, Miskin Abdal tez adam göndərib, şahın qılıncını gətirtdi. Sultan Səlim qılıncı əlinə alıb, bir o yana, bir də bu yana baxıb, topun lüləsinə endirdi. Qılınc lüləyə heç iz də salmadı. Bunu görüb, adamların yanında pərt olan sultan qəzəblə dedi:

– Miskin Abdal, görürsən, şahın məni aldadıb, mənə öz misri qılıncını yox, başqa bir qılınc göndərib.

İşin nə yerdə olduğunu bilən Miskin Abdal üzünü sultana tərəf tutub, qürurla dilləndi:

– Sultan, qılınc həmin qılıncdır, amma vuran qol o qol deyil.

Bunu eşidəndə, elə bil, sultanı ildırım vurdu. Anladı kı, Miskin Abdal sözün düzünü danışır. Özünü o yerə qoymadı. Gördü ki, hamının diqqəti ondadır. Öz sözünə xilaf çıxsa, xalq ondan üz döndərər. Odur ki, əlacı kəsilib, içindən qırıla-qırıla dedi:

– Miskin Abdal, get, əsirləri sənə bağışladım.

Miskin Abdal xoş xəbərlə geri qayıtdı. Başına gələnlərin hamısını Şah İsmayıl başda olmaqla, bütün saray əyanlarına danışdı. Hamı Miskin Abdalın ağlına, kamalına heyran qaldı. Şah əmr elədi, Miskin Abdalın şərəfinə şənlik məclisi quruldu. Yemək-içmək, çal-çağır dünyanı başına aldı. Hamı hər yerdə Miskin Abdalın böyüklüyündən, müdrikliyindən ağız dolusu danışırdı. Axşam saz-söz məclisində meydan yenə Miskin Abdala verildi.

Şah İsmayıl dedi:

– Ustad, bu gün nədən başlamaq istəyirsən?

Miskin Abdal dedi:

– Qibləyi-aləm, “Şah divani” üstündə bir «Divani» oxumaq istəyirəm.

Şah İsmayıl dedi:

– Buyur, ustad.

Miskin Abdal başladı oxumağa:

Xoşbəyanlıq virdim oldu, böhtana yol vermədim,
Şirin-süxən əndəlibəm, hədyana yol vermədim.
Nifrin edib, lənət dedim xainə, iblislərə,
Qəlbimi ayna saxladım, nadana yol vermədim.

Bir bəşəri incitmədim, özümü şah saymadım,
Dostun sirrini söyləyib, dildən-dilə yaymadım,
Ömür qısa, dünya əzəl, çox yaşadım, doymadım,
Dür mətaha meydan açdım, tək cana yol vermədim.

Aşıq olub, dərs alanlar, söz desin sözüm kimi,
Miskin Abdal, məğrur istə hamını özün kimi,
Arifi, mətləb qananı bilirəm gözüm kimi,
Sinəm üstdən mərd yeridi, şeytana yol vermədim.

Hər yandan "Afərin", "Əhsən" sədaları ucaldı. Şah Miskin Abdala üz tutub, dedi:

– Ustad, indi nə oxumaq istəyirsən?

Miskin Abdal, dedi:

– Şahımın icazəsi ilə bir «təcnis» oxuyardım.

Şah təəccüblə dedi:

– Bu da sənin təzə icadlarından biridir? İndiyə kimi heç yerdə eşitməmişəm.

Miskin Abdal dedi:

–Qibləyi-aləm sağ olsun, indi oxuyaram, eşidib, feyziyab olarsınız:

Yaz olanda büsatıdır dağların,
Ətəyində yer eyləyər elata.
Qarı düşmən qovğa, salsa üstünə,
Bata bilməz, süvar olsa el ata.

Bir Allahdır ərşi-gürşü yaradan,
Adı çoxdur, bir adı da Yaradan,
Nə yaratsan Yaradana yarat, an,
Qorx ki, sənə qara daşı el ata.

Miskin Abdal, şeytan anma, nər div an,
Müxənnəsə tutacaqdır nər divan.
Haqqa doğru sən qoyubsan nərdivan,
Ona görə, deyir sənə el: "Ata".

Gördülər ki, paho, Miskin Abdal saz-söz xəzinəsinin ağzını hələ təzəcə açıb. Məclisdəkilər Miskin Abdalın bu qabiliyyətinə də heyran qaldılar.

Şah İsmayıl vəcdə gəlib, Miskin Abdala dedi:

– Ustad, bu gecəki məclisimizdə bizi, yəqin ki, hələ çox heyrətləndirəcəksən.

Miskin Abdal dedi:

– Şahım, indi də "Şah Xətai" havasını səsləndirmək istəyirəm.

Şah gülümsəyib, dedi:

– Buyur, ustad.

Miskin Abdal sazını "Şah Xətai" gəraylısı üstündə kökləyib, aldı, görək, nə dedi:

Vətən – deyib, ağlayanın,
Göz yaşları selə dönər,
Axıb gedər gecə-gündüz,
Bir məkanda gölə dönər.

Yolu yorğun yol aşanın,
Axırı yox şöhrət-şanın,
Qürbət eldə yaşayanın,
Bir həftəsi ilə dönər.

Bir yandadır hay-haraylar,
Bir yandadır sonsuz vaylar,
Çil-çıraqlı çox saraylar,
Yanıb-yanıb külə dönər.

Mayasıdır Haqqdan halal,
Hər kəlməsi sirrli sual,
Qərib olan Miskin Abdal,
Bir gün olar, elə dönər.

Belə-belə Şah İsmayıl ona saz-söz sənətinə dair bir-birindən maraqlı suallar verdi. Miskin Abdal da başladı sazın, sözün sirlərindən onlara məlumat verməyə. Şah dedi:

– Ustad, neçə saz havasının ustadısan?

Miskin Abdal dedi:

– Qibləyi-aləm sağ olsun, bir xeyli var...

Şah İsmayıl maraqla dedi:

– Onlardan bir-neçəsinin adını çəkə bilərsənmi?

Miskin Abdal dedi:

– O nə sözdür, şahım, indi mən deyim, sən də, eşidənlər də qulaq assınlar: "Şah divani", bu həm də "Baş divani"dir, "Şah sevəni", "Şah qalxdı", "Şah Xətai" gəraylısı, "Ayaq divani", bu həm də "Osmanlı divanisi"dir, "Şah sarayı", "Heydəri", "İbrahimi", "Sultanı", "Miskini", "Abdalı", "Sənubəri", "Göyçə gözəlləməsi", "Göyçə çuxuru", "Göyçə döndərməsi", "Göyçə şikəstəsi", "İsmayılı", "Göyçə gülü", "Hüseyni", "Atlandırma", "Paşa köçdü" və yeri düşdükcə, adını çəkəcəyim bir çox başqa havalar.

Şah İsmayıl dedi:

– Yaxşı, ustad, bəs niyə həmişə sazını kökləyəndə ortadakı

bir pərdənin üstündə kökləyirsən? Olmazmı, bir pərdə yuxarı, bir pərdə aşağı tutasan?

Miskin Abdal dedi:

– Yox, olmaz, şahım. Bu da sazın öz qayda-qanunudur. Ondan kənara çıxmaq mümkün deyil. Özü də, həmin pərdənin adı "Baş pərdə"dir. Bu gündən mən onu "Şah pərdə" adlandırıram. Çünki, şahım sazın vurğunudur.

Şah İsmayıl dedi:

– Ustad, mən həm də sənin sözünün vurğunu, aşiqiyəm.

Miskin Abdal dedi:

– Səni həmişə var ol, şahım!

Şah İsmayıl dedi:

– Ustad, görəsən, niyə saza ürəkdən bağlanıb, onu günlərlə, aylarla eşitməkdən doymuruq. Bəlkə, bunun da bir sirri var?

Miskin Abdal dedi:

– Bəli, qibləyi-aləm, onun böyük bir sirri var.

Şah İsmayıl dedi:

– Nədir, o sirr?

Miskin Abdal dedi:

– Qibləyi-aləm, mən, hələ balaca uşaq idim. Atam məni əvvəlcə molla yanına qoydu, orada dərsimi aldım. Sonra döyüş sirrlərini öyrəndim. Daha sonra atam məni Göyçənin Dəliqardaş kəndindən olan Ozan Heydərin şagirdi olmuş Ozan İbrahimin yanına şagirdliyə qoydu. Az vaxtda qopuz çalmaqda ustadımı mat qoydum. Ancaq nə qopuz, nə də onda çalınan havalar məni qane eləmirdi. Hey düşünürdüm ki, qopuza oxşar bir musiqi aləti yaradım. Gecə-gündüz səbri-qərarım yox idi. Fikrim-xəyalım yalnız onda idi. Bir gün yuxumda gördüm ki, bir nurani qoca mənə yaxınlaşdı, mehriban-mehriban saçımı sığallayıb, dedi:

– Oğul, sözlərimə yaxşı qulaq as. Görürəm, çox pəjmürdəsən.

Nigaran olma. Mən Qadir Allahın köməkliyi ilə səni bu sıxıntılardan azad eləməyə gəlmişəm.

O bu sözləri deyib, mənə bir saz göstərib, dedi:

– Sabah gedərsən filan ustanın yanına. O səni görən kimi tanıyacaq. Çünki, mən onun da yuxusuna girib, nə lazımdır demişəm. Sənə ürəyinə yatan bir çalğı aləti düzəltdirib, verəcəyəm. Onun adı “saz“dır. Saz, gördüyün kimi, ürəyə oxşayır. Sən onu qopuz kimi dizinin üstünə yox, ürəyinin üstünə qoyub, üzü Allaha doğru çalacaqsan. Çünki, sazın incə, gözəl səsində Allah eşqi olacaq. Sazı çalana ozan yox, aşıq deyiləcək. Sənə saz kimi əvəzsiz bir qismət verirəm. Sazına-sözünə görə adın dillərdə əzbər olacaq; dünya neçə qərinə dolub-boşalsa da, sən hörmətlə yad ediləcəksən. Bu sənət sənin adınla qalacaq.

Bunu deyib, qoca qeyb oldu. Mən ayıldım. Yuxumda gördüklərimi atama danışdım. O məni həmin ustanın yanına apardı. Usta məni görən kimi tanıdı. Sazı düzəldib, verdi. Sazı əlimə alıb, baxanda, elə bildim ki, dünya mənimdir. Onu ürəkdən çalmağa başladım. Başıma xeyli adam toplaşdı. Onlar sazı görüb, çox təəccübləndilər. Mən gördüyüm yuxunu onlara danışdım. Usta da belə bir yuxu gördüyünü söylədi. O gündən başladım Allah vergisi və eşqi olan sazı ürəyimin başında çalıb-oxumağa. Daha iki saz düzəltdirib, birini babam Cəfərə, birini də atam Məhəmmədə ərməğan elədim. Onlar da sazı yavaş-yavaş dınqıldatmağa başladılar. Sazın “Şah pərdə”də köklənməsini də, həmin nurani qoca yuxuda mənə öyrətdi. O gündən sazın səsi-sorağı hər yana yayılmağa başladı. Aşıq olmaq istəyənlərin sayı gündən-günə çoxaldı. Qısa zamanda aşığın-sazın sorağı hər yandan gəldi.

Eşitdiklərindən vəcdə gələn şah ucadan dedi:

– Lələ, Miskin Abdal həm də gözəl şairdir. Mən onu daha çox sevdiyim yeddi böyük şairdən biri bilirəm.

Hüseyn Lələ bəy:

– Doğrudur, mürşidim! Miskin Abdal bu sevgiyə layiqdir.

Şah İsmayıl:

– Lələ, Miskin Abdal özü boyda möcüzədir. Çağır xəttatı. Xəttat o saat hazır oldu. Şah İsmayıl dedi:

– Yaz, xəttat. "Ey mömin insanlar, Miskin Abdal mötəbər şəxsdir, ona sidq ürəklə inanın, nə mətləbiniz varsa, ondan diləyin".

Şah həmin fərmana möhür vurub, qol çəkdi, verdi Miskin Abdala, dedi:

– Ustad, bu fərmanı məndən yadigar saxla. Qoy gələcək nəsillər bilsinlər ki, möcüzələri, müdrikliyi ilə hamını heyrətə gətirən Miskin Abdal Şah İsmayılın ən yaxın dostu, ən çox inandığı adamlardan biri olub. Həmin gündən bu mötəbər ağsaqqalı özünün vəziri təyin elədi.

Şah İsmayıl Miskin Abdala həm də üzərində ay və səkkiz guşəli ulduz olan bir daş möhür və şeyx nəslindən qalan sınaqlı bir əl əsası da bəxşiş etdi.

Məclis beləcə, deyib-gülə başa çatdı. Miskin Abdal ürəkləri öz şirin sözləri, ağlı, kamalı ilə sehrləmiş, məftun eləmişdi. Heç kəs ondan ayrılmaq istəmirdi.

Miskin Abdalın hörməti sarayda gündən-günə yüksəlirdi. Bunu gözü götürməyən saray əyanlarından biri Şah İsmayıl ilə Miskin Abdal arasında olan bu qayım-qədim dostluğu sarsıtmaq üçün gecə-gündüz fürsət axtarırdı. Axır ki, bir gün o uydurduğu dəhşətli bir yalanla şahın qəlbinə şübhə toxumu səpə bildi.

Hamıdan çox inandığı bir adamın ona xəyanət edə biləcəyini təsəvvür eləyə bilməyən şah möhkəm sarsılmışdı. O, gözətçilərə əmr eləmişdi ki, axşama kimi saraya heç kəsi buraxmasınlar. Baş verənlərin hamısı Miskin Abdala gün kimi aydın idi. O özü-

nün vəzir libasını geyinib, saraya doğru addımladı. Bütün keşikçilərin arasından səssiz-səmirsiz keçib, saraya daxil oldu. Dərin fikirlər, xəyallar içində boğulan şah bir də gördü ki, qapı açıldı. O, Miskin Abdalı qarşısında görəndə heyrətdən yerindəcə donub qaldı. Dərin bir heyrətlə ondan sual elədi:

– Ustad, bu saraya necə daxil oldun? Sən bura gələndə keşikçilər harada idilər?

Miskin Abdal kirimişcə sazını sinəsinə basıb, aldı, görək, onun bu sualına necə cavab verdi:

Səhərdən bu bağın keştinə vardım,
Bu bağın bağbanı ayaq üstədir,
Könlüm pərvaz eylər şahı görməyə,
Yatmayıb seyraqub, ayaq üstədir.

Salam verdim, əleyk aldım dərindən,
Səda gəldi dəryalardan dərindən,
Əlim üzməm ərənlərin dərindən,
Ağam Şahi-Mərdan ayaq üstədir.

Abdalın paklığı düzgün cavabdır,
Doğru söz söyləmək özü savabdır,
Şahim, nə yatıbsan, dünya xarabdrı,
Haqq özü yatmayıb, ayaq üstədir.

Bu sözləri eşidəndə, elə bil, Şah İsmayıl qəflət yuxusundan ayıldı. Şeytan hiyləsinə aldandığını başa düşüb, çox peşman oldu. Tez bütün saray əyanlarını – gözətçiləri, cəlladları çağırtdırdı. Başına gələnləri onlara danışdı. Özü qəsdən gözətçilərdən soruşdu:

– Mən sizə tapşırmamışdımmı ki, bu gün saraya heş kəsi buraxmayın? Bəs, siz nə həddlə Miskin Abdalı buraxıbsınız?

Gözətçilər bir ağızdan dedilər:

– Qibləyi-aləm sağ olsun, Miskin Abdalı hələ biz uzaqdan görəndə buraxmaq istəmirdik. Ancaq o bizə gəlib çatanda, elə bil, qeybdən dilimiz-ağzımız qurudu, yerimizdə lal-dinməz qara daşa döndük. Özümüz də bilmədik, bu necə oldu.

Bunu eşidənlər heyrət elədilər. Qəzəbdən şahın gözləri qan çanağına döndü. Miskin Abdal kimi bir övliya haqqında bir xainin sözü ilə bədgüman olması onu tamam sarsıtmışdı. Əmr elədi ki, həmin naxələfi tapıb, hüzuruna gətirsinlər. O saat namərdi tapıb, gətirdilər. Xain ayaq üstə ölmüşdü. Nə qədər yalvar-yaxar elədisə, xeyri olmadı.

Şah İsmayıl qəzəblə dedi:

– Cəllad!

Cəllad dedi:

–Mən buradayam, qibləyi-aləm.

Miskin Abdal gördü ki, xainin işi şuluqdur, axırı çatıb. Bir istədi ki, Şah İsmayıldan təvəqqe eləsin ki, onun günahından keçsin. Gördü ki, yox, Şah İsmayıl elə pərtdir, elə qəzəblidir ki, ona başqa söz demək olmaz. Naəlac qalıb, dedi:

– Qibləyi-aləm, ixtiyar sahibisən. Məluna nə cəza verirsən, ver. Ancaq yaxşı olar ki, o, cəzasını almamışdan əvvəl sinəmdə bir-iki xanə sözüm var, onu deyim, ürəyimdə qalmasın.

Şah İsmayıl dedi:

– Buyur, ustad, de!

Aldı Miskin Abdal:

İnsan oğlu, qeybət etdin yoldaşdan,
Kəsdin haqq-salamı, harası qaldı?

Söz yetişdi sahibinə, utandın,
Axır sənə üzün qarası qaldı.

Pislikdən nə çıxar, söylə, ay insan,
Çıxmaz yaddan, yüz il keçsə aradan,
Tutaq ki, bir yoldaş çıxdı sıradan,
Kimə zər-zibası, xarası qaldı?

Miskin Abdal, bəsdir daha bu qədər,
Bülbül nəğmə deyər, bayquşlar ötər,
Xəncərdən, bıçaqdan, qılıncdan betər,
Sinəmdə pis sözün yarası qaldı.

Söz tamama yetdi. Doğrudan da, Miskin Abdalın hər sözü qılıncdan da betər kəsərli idi. Xain nə qələt elədiyini indi, lap yaxşı anlamışdı. Miskin Abdalın ayaqlarına düşüb, yalvarmağa başladı: "Qələt eləmişəm zatı-pakımla, bir səhvdir eləmişəm, keç günahımdan".

Bunu eşidən Şah İsmayıl qəzəblə dedi:

– Məlun, sən bir səhv eləməyibsən. Sən məni bu dünya boyda günaha batırıbsan. Sən məni müqəddəs bır insanın qabağında xəcil eləyibsən. Bunu mənə, heç Allah da bağışlamaz. Sən layiq olduğun cəzanı almalısan ki, başqalarına dərs olsun!

– Cəllad...

Cəllad dedi:

– Bəli, qibləyi-aləm.

Şah İsmayıl dedi:

– Cəllad, apar bu məlunu qıyma-qıyma doğra, yekə tikəsini qulağı boyda elə, bəlkə, ürəyim soyuya.

Miskin Abdal vəzir olanda da öz səfərlərindən qalmırdı.

Bu hadisədən sonra yenə də Miskin Abdal el-el, oba-oba gəzib, Şahının qüdrətini, mənsub olduğu dini təriqətin ideyalarını yayırdı. Hər yerdə Miskin Abdalı böyük hörmətlə qarşılayır, bu nurani qocanın sözündən, söhbətindən doymaq bilmirdilər.

Bir dəfə yenə də Miskin Abdal sazı çiynində haradansa Təbrizə qayıdırdı. Yaşı doxsanı adlamışdı. Yaşlansa da, hələ dizi təpərli və gümrah idi. Səfəri uzaq olmadığından yolu piyada keçib gəlirdi. Yol yeriyib, yorulduğundan gəlib, Təbrizin kənarındakı bir uçuq-sökük, xaraba qalmış evin divarının dibində oturub, dincəlirdi. Birdən yol ilə saray cəlladının atın üstündə keçdiyini gördü.

Elə bil, Miskin Abdalın başına göylərdən od ələndi. Bütün ölümlərə nifrət edən bu böyük din xadimi sarayda heç vaxt cəllada salam verib, salam almırdı. Bunu cəllad da yaxşı bilirdi. Miskin Abdal deyirdi ki, insan öz əcəli ilə ölməlidir, insan insanı qətlə yetirməməlidir. Buna görə o, var, pul, qızıl üstündə dava eləyib, məcburi qırğınlar törədən padşahlara, xanlara, sultanlara nifrət eləyirdi. Onları görməyə gözü yox idi. Cəllad da bunların biri idi. Miskin Abdal belələrini daş ürəkli adlandırırdı.

Miskin Abdalın burada oturduğunu görən cəllad atının başını döndərib, Miskin Abdalın bərabərinə sürüb, dedi:

– Salam, ustad.

Miskin Abdal heç yerindən də tərpənmədi. Gözlərini uzaq bir yerə zilləyib, acıqlı-acıqlı dedi:

– Cəllad, sən yaxşı bilirsən ki, mən qan tökənlərin salamını almıram.

Salamının cavabsız qaldığını görən cəllad yaman pərt oldu. Ancaq özünü o yerə qoymadı. Miskin Abdalı çaşdırmaq üçün dedi:

– Əgər sən belə ürəyi yumşaq adamsansa, niyə o gözəl çəmən-

zarlığı qoyub, gəlib, bu xaraba, kalafa qalmış evin tozlu-torpaqlı divarının dibində oturubsan. Axı, şairlər təbiətin, gözəlliyin vurğunudur.

Miskin Abdal amiranə bir səslə dedi:

– Cəllad, sənin baş kəsdiyin çil-çıraqlı, hay-haraylı, dəbdəbəli sarayların da axır taleyi xarabazarlıqdır. Dediyin o çəmənzarlığın da ömrü gödəkdir. Bu gün var, sabah yox. Ancaq söz çəmənzarlığının ömrü əbədidir.

Cəllad gördü ki, yaman pis yerə ilişib. Peşmanladı ki, nahaq yerə yolu düz çıxıb getmədim. Onsuz da Miskin Abdal onu heç vaxt saya salmırdı. Öz-özünə fıkirləşdi ki, gəl ona Göyçəsini yadına sal, bəlkə, ürəyi yumşaldı. Dedi:

– Ustad, eşitdiyimə görə, sənin vətənin Göyçə mahalı gözəllik diyarı, cənnət məkanıdır. Bu yaşda belə gözəl vətəndən ayrı düşmək sənə çətin deyilmi?

Miskin Abdal fəxrlə dedi:

– Cəllad, indi yurdumuzun hər qarış torpağı mənə vətəndir.

Cəllad gördü ki, yox, Miskin Abdala söz tapıb, deyə bilməyəcək. Qaldı çar-naçar, bilmədi, nə eləsin. Başladı sözün səmtini dəyişməyə. Dedi:

– Mənə bir saz çal.

Miskin Abdal kinli-kinli dedi:

– Çalmaram.

Cəllad elə zənn elədi ki, Miskin Abdal saz çalmağa pul istəyir. Cibindən xeyli pul çıxarıb, dedi:

– Al bu pulları, mənə bir saz çal.

Miskin Abdal qəzəblə dedi:

– Dedim ki, çalmaram.

Cəllada elə gəldi ki, Miskin Abdal pula azımsınır. Ona görə də dedi:

– Bir saz havası üçün mən sənə nə qədər pul verməliyəm?

Miskin Abdal qürurla dedi:

– Cəllad, sən mənə dünyanı da bağışlasan, mən sənə saz çalmaram. Çünki, sən cəlladsan, başkəsənsən, qantökənsən!

Bu sözləri eşidəndə, elə bil, cəlladı ildırım vurdu. Əhvalı qarışdı. O, ömründə hələ, belə təhqir eşitməmişdi. Cəllad öz-özünə qəzəblənib, dedi:

– Şair, sən nə üçün adamların ölümünə fərman verən şaha saz çalırsan, onu yerinə yetirən cəllada yox.

Miskin Abdal təmkinlə dedi:

– Cəllad, qulaqlarını aç, yaxşı-yaxşı eşit. Mən heç vaxt Şah İsmayıl Xətaiyə saz çalmamışam. Mən sazı Şeyx Heydər oğlu şair İsmayıla çalmışam!

Eşitdiyi sözlərin zərbəsindən cəlladın qulaqları uğuldadı, gözlərinə qaranlıq çökdü, dünya başına fırlandı. Miskin Abdal onun gözündə getdikcə böyüdü, ucaldı. Özü, elə bil, kiçilib, yox oldu. Miskin Abdalın sözləri onu ildırım kimi vurmuşdu. Cəllad bu sözdən sonra, elə bil, dəli olmuşdu. Elə bil, o, bütün günahlarını başa düşmüşdü. Özü də bilmədi, atdan necə düşüb, qılıncını daşlara çırpıb, əzik-əzik elədi, atını qamçılayıb, bərri-biyabana buraxdı, çul kimi döşəndi Miskin Abdalın ayaqlarına. Göz yaşlarını sel kimi axıda-axıda yalvardı, yaxardı, dedi:

– Yalvarıram, əllərini göylərə aç, Ulu Tanrıdan mənə rəhm dilə. Daha mənə cəllad demə, daha mən cəllad deyiləm. Məni əfv elə, keç günahlarımdan.

Miskin Abdal cəlladın yalvarışlarını eşidib, dedi:

– Ömrü boyu günah iş tutanı bağışlamaq özü günahdır.

O, cəlladın kürəyindən tutub, ayağa qaldırdı. Gözünü onun üzünə zilləyib, dedi:

– Yüz ağlasan da, sıtqasan da, sən cəlladsan, başkəsənsən, qantökənsən.

Ümidsizliyə qapılan cəllad Miskin Abdalın əlindən çıxıb, dəli kimi bərri-biyabana üz tutdu. Gözdən itib, yox olanadək “daha mənə cəllad demə, daha mən cəllad deyiləm” sözləri eşidildi. O, haraya getdiyini heç özü də bilmirdi...

Cəllad gözdən itəndən sonra Miskin Abdal əllərini göylərə açıb, Ulu Tanrıdan ona rəhm dilədi.

Saray cəlladının birdən-birə yoxa çıxması hamını çaş-baş salmışdı. Miskin Abdal əlacsız qalıb, bu nigarançılığa son qoydu. O, cəlladla olan söhbətini olduğu kimi şaha və saray əyanlarına danışdı. Onun bu hərəkəti hamının çox xoşuna gəldi. Şah İsmayıl ayağa durub, Miskin Abdala tərəf gəldi, onun qarşısında dayanıb, dedi:

– Ustad, mən ömrümdə, hələ, belə hikmət eşitməmişdim.

Sonra o amiranə səslə dedi:

– Çağırın, xəzinədarı.

Xəzinədar dərhal gəlib çıxdı. Şah ondan bütün xəzinələrin açarını alıb, yenidən Miskin Abdala üz tutub, dedi:

– Ustad, sənin İlahi vergisi olan müdrikliyinin əvəzində cüzi də olsa, al bu xəzinələrin açarını. Nə qədər istəyirsən götür, payla. İstəyirsən, Şah İsmayıl Xətainin xətrinə, istəyirsən, Şeyx Heydər oğlu şair İsmayılın xətrinə.

Bu təklifdən bir məğrurluq duyan Miskin Abdal mehribanlıqla dedi:

– Qibləyi-aləm sağ olsun. İstər Şah İsmayıl Xətaiyə, istərsə də Şeyx Heydər oğlu şair İsmayıla olan sonsuz sədaqət və hörmətim Tanrı payımdır. O ki qaldı, xəzinələrin açarından imtina etməyimə, bundan incimə. Çünki, xəzinələrini daşıyaram, paylayaram qurtarar. Ancaq sənin mənim hikmətimə verdiyin qiymət tükənməz xəzinədir. Daşımaqla, paylamaqla qurtarası deyil. Bundan böyük bəxşiş olarmı?!

Bu sözlər, elə bil, eşidənlərin hamısını ovsunladı. Hamının diqqəti şahda idi. Şah İsmayıl bunları dinləyəndən sonra üzünü saray əyanlarına doğru çevirib, iftixarla dedi:

– Sən adi insan deyilsən, ustad! Sən ərənlər ərəni, kəramət sahibi, övliyasan!!!

Bunu deyib, Şah İsmayıl Miskin Abdalı qucaqlayıb, bağrına basdı.

Bir gün eşitdiyi dəhşətli bir xəbər Miskin Abdalın qəlbinə sarsılmaz dağ çəkdi. Ona xəbər gətirmişdilər ki, Şah İsmayıl Xətai – Şeyx Heydər oğlu şair İsmayıl vəfat eləyib. Bu xəbərdən sonra, elə bil, dünya uçub, altında qalmışdı. Doğma övladı kimi sevdiyi İsmayılın vaxtsız ölümü onu göyüm-göyüm göynədir, yandırıb-yaxırdı. Bu ahıl çağında gözlərinin yaşı çay kimi axıb, yaxasında göl bağladı. Əlləri əsə-əsə sazını sinəsinə sıxıb, öz dərdi-dilini "İsmayılı" havasında belə oxudu:

Gedin, deyin Lələ bəyə,
Bu naleyi-əfqanımı.
Qanlı fələk zülm elədi,
Ayırdı candan canımı.

Mən bu bağa girərəmmi?
Gül dəstəsin hörərəmmi?
Bir də, ya Rəbb, görərəmmi,
Özə mürşidi-sultanımı?

Miskin Abdal, bu nə kələk,
Dövran qoymaz bizi gülək.
Yerə vurdu məni fələk,
Ucaltdıqca düşmanımı.

Onun yanıqlı harayı, az qaldı, əlindəki sazı kösövə döndərsin:

Adəm oğlu, xəbdən oyan, bir eşit,
Neçə milyon canlar var idi, getdi.
Kim sürdü dünyada zövqü-səfanı,
Kimlər ’’oxxay” deyib, yarıdı getdi.

Gəl sənə söyləyim Əjdəri-Sandan,
Babası Carcavar, o Nərimandan,
Keykavus, İsgəndər, o Süleymandan,
Onlar da bir iqlimdar idi, getdi.

İqlimin şahıydı Həzrət Süleyman,
Ədalətə pənah idi Nuşirəvan,
Şıx oğlu İsmayıl – o, cənnət məkan
Düşməz ələ o, bir yadigardı getdi.

Abdal, bu sözləri qanana söylə,
Tapsan bir ədalət divana söylə.
Səxalılar yetər imana söylə,
Əmsaxa dünyadan xar idi, getdi.

Bu dərdə dözə bilməyən Miskin Abdal biryolluq saraya əlvida söyləyib, doğma Göyçəsinə, dədə-baba yurdu Zərgərli (Sarıyaqub) kəndinə qayıtdı. İtirdiyi əzizlərinin ağır dərdlərini çəkə-çəkə kənddə məktəb açıb, balalara elmin sirrlərini öyrətməyə başladı.

Miskin Abdal Təbrizdən Göyçəyə dönəndən sonra bir gün sabah tezdən qalxıb, gördülər ki, onun qapısında bir sürü maral var. Marallar onun qapısına qeybdən sağına gəlmişdilər. Maral-

lar sağından sonra yenə örüşə qayıtdılar. Adamlar bu möcüzəyə mat-məəttəl qalmışdılar.

Bundan sonra marallar hər gün Miskin Abdalın qapısına sağına gəlir və sonra da geriyə, örüşə qayıdırdılar.

Bir gün ocaqda maral südünün qan kəsdiyini görən arvadı bunu tez ərinə xəbər verdi. Miskin Abdal dərhal təşviş içində dedi:

– Arvad, yəqin, oğlum Şadman adam öldürdü.

Bir azdan Şadman gəlib çıxır. Məlum olur ki, Şadman atasının “Sarı yer“ yaylağında olan mal-qarasına, ilxısına basqın edən quldur-qaçaqlardan bir neçəsini öldürüb. Bunu eşidəndə hirsindən Miskin Abdalın əlindəki çəlik burum-burum olur. Çəliyi qəzəblə yerə elə bərk vurur ki, bu vaxt zəlzələ baş verir. Sonra da əlini atıb, ocaqdan bir höyüş odun çəkib, oğlu Şadmana tərəf qılamazlayır. Allah-Təala günahsız Şadmanı atanın bu qəzəbindən qoruyur. Ağac Şadmana çatmamış yerə sancılır, qol-budaq atıb, yaşıl bir armud ağacına dönür. O gündən həmin ağac bir ziyarətgaha çevrilir.

Miskin Abdalın yaşı yüzü adlamışdı. Qocalıq yavaş-yavaş özünü göstərirdi. Keçirdiyi günlər göz önünə gəlirdi. Qəlbində nisgillər baş qaldırırdı. Bu fikirlər içində sazını əlinə alıb, öz ürəyindəkiləri onunla bölüşmək istədi. Miskin Abdalın sazı dilləndi. Aldı, görək, “Hüseyni” saz havasında nə dedi:

Hardan gəldi-getdi ömür, bilmədim,
Baxdım ki, qapımı döydü qocalıq.
Bir kərə ürəkdən deyib-gülmədim,
Qəddimi kaman tək əydi qocalıq.

Ümidim, pənahım, qadir Allahım,
Dar gündə hoy edən var qibləgahım,
Pakam, Tanrı bilir, yoxdur günahım,
Ağlayan, sızlayan neydi qocalıq.

Şaha baş əyməzdim, şeşpər atardım,
Sultanlar yurdunda at oynadardım,
Namərdi bazarda qul tək satardım,
Bilməm niyə gəldi, nəydi qocalıq?

Ötübdür hay-hayım, qalıb vay-vayım,
Sananır dillərdə hər günüm, ayım,
Oxum əldən çıxıb, sökülüb yayım,
Miskin Abdal deməz yeydi qocalıq.

Miskin Abdalın yanıqlı-yanıqlı qocalıqdan şikayətlənməsi onun yanındakıları yamanca kövrəltmişdi. Onlardan biri dözə bilməyib, Miskin Abdala dedi:

– Haqq dərgahına çatanlar, diri ikən ocağa çevrilənlər qocalmır, ustad.

Miskin Abdal gülümsəyib, dedi:

– Dünyada qocalmayan yoxdur, oğul. Nə deyirsiniz deyin, qocalıq qocalıqdır. Bundan heç kim qaça bilməyibsə, Miskin Abdal da qaça bilməz.

Bu sözləri deyib, sazını yenə sinəsinə sıxdı. Aldı, görək, "Abdalı" saz havasında nə dedi:

Yaman yerdə yaxalayıb vaxt məni,
Hey desəm də qocalmaram, qocaldım,
Yüzü keçib, silkələyir baxt məni,
Nə olsun ki, pirəm, nuram, qocaldım.

Seyyid mənəm, pay paylayan dərvişəm,
Namərdlərin xətasını görmüşəm,
İsmətimdən bir məbədgah hörmüşəm,
Sızıldayır qanlı yaram, qocaldım.

Miskin Abdal yolu Haqqın yoludur,
Ömrüm Tanrı dərgahının quludur,
Adım, sanım, halallığım uludur,
Etməmişəm bircə haram, qocaldım.

Bu məclisdən bir az sonra Miskin Abdal xəstələnib, yorğan-döşəyə düşdü. Oğlu Şadmanı, qızı Məleykəni, nəvə-nəticələrini başına toplayıb, vəsiyyətini eləyəndən sonra bu şeiri dedi:

Eşit deyim, dünya, səndə,
Ayım, ilim, yazım qaldı.
Qövr eləyir söz sinəmdə,
Dil-dil ötən sazım qaldı.

Yar sevmişdin, yarım getdi,
Var yığmışdın, varım getdi.
Eşqim, etibarım getdi,
Ahım, ünüm, sızım qaldı.

Qayaları sökdürərdim,
Zərdən saray tikdirərdim,
Yağıları çökdürərdim,
Məndən təpər, dözüm qaldı.

Ərşə-gürşə bəlli əslim,
Yaradana ollam təslim,
Adla, sanla olan nəslim,
Bir oğlum, biı qızım qaldı.

Hər nə varsa, hədər imiş,
Hər şey gəldi-gedər imiş.
Ölüm yaman betər imiş,
Yol-ərkanım, izim qaldı.

Şadman könlüm tari-mardır,
Şanda balım zəhri-mardır,
Günüm-gecəm ahu-zardır,
Şirin-şirin sözüm qaldı.

Yaşayan kim, ölən kimdir,
Ağlayan kim, gülən kimdir,
Gedən gedir, gələn kimdir...
Nə mizrabım, nə sim qaldı.

Yoxdur daha Şahənşahım,
Ərşə bülənd oldu ahım.
Adım, sanım, qibləgahım,
Haqq çağıran səsim qaldı.

Telli saza mizrab vurdum,
Məclislərdə dastan qurdum,
Neçə-neçə aşıq yordum,
Sözüm düzüm-düzüm qaldı.

Bir şəcərəm, bir kəşkülüm,
Gur ocağım, odum, külüm,
Yığın-yığın, varım, mülküm,
Al-qumaşım, bezim qaldı.

Dünya puçdu, puçdu dünya,
Dünya heçdi, heçdi dünya,
Abdal, yaman keçdi dünya,
Yaşamaqda gözüm qaldı.

Axırda da bunları dedi:

Bu dünya, o dünya var,
Allah, ölümün haqqdır!
Bir dirilik suyu var,
Allah, ölümün haqqdır!

Axırın puçdu, dünya,
Var ikən heçdi dünya,
Hey gəldi, keçdi dünya...
Allah, ölümün haqqdır!

Abdal, yastıq daş olar,
Üst torpağın yaş olar,
Mələklər yoldaş olar,
Allah, ölümün haqqdır!

Nəhayət, fani dünyaya əlvida deyib, gözlərini qapadı. Müqəddəs ruhu cənnət quşuna dönüb, Haqqın ulu dərgahına qovuşmaq üçün göylərə qanad aşdı.

Bir ustad aşıq Miskin Abdalın ruhunu yad elədi, dualar oxudu, Allahdan ona rəhmət dilədi və bu cahannamə ilə bu dastanı tamamladı:

Dəhri-fənada belə insan hanı?
Qılmaya fani onu dövran hanı?
Ey bivəfa dünya, sən nə zalımsan,
Bu qayətdə sənə gələn can hanı?

Əvvəl sənə gəldi Adəmü-Həvva,
Beş gün qonaq oldu səndə binəva,
Öldürdün Habili, saldın bir dava,
Düşdü aralığa nahaq qan, hanı?

Neçə padişahlar gəldi sahib-cəng,
Cəmşidü Cəm, Nuşirəvanü-Huşəng,
Dağyanus, Hülakü, Çingiz, Teymur-Ləng,
Onlardan bircəsi bu zaman hanı?

Ey bivəfa dünya, fanisən, fani,
Necə dağıtdın sən şövkəti-şani,
Gecələr çaldılar gürzü-girani,
Rüstəmi-Zal kimi pəhləvan hanı?

Neçə həkim gəldi təbibi-zaman,
Ərəstun, Əflatun, Fərəzdək, Xaqan,
İstədi, diriltsin özünü Loğman,
Qaldı kuzəsi də yarımcan, hanı?

Dünya, səndə Aşıq Səməd var idi,
Nəzmü, şeri ləli gövhərdar idi,
Bir gözəl eşqinə giriftar idi,
Onun kimi bəs bəhri-ümman hanı?

Bu dünyada heç də gəzməmişdi kəm,
Aşıq Əli oğlu, Aşıq Məhərrəm,
Həsrətin çəkirdi Rumi, həm Əcəm,
Əlində tütəyi-balaban hanı?

Tamam yola gedər, heyif gözəllər,
Sırf müşki-ənbər qoxuyan tellər,
Murad üstə neçə xınalı əllər,
Torpağa döndülər, vay, aman hanı?

O ala gözlərə, o gül yanağa,
O nazik əndama, o tər buxağa,
Necə qıyıb, döndərirsən torpağa,
Nazənin-nazənin incə can hanı?

Hanı Xosrov, Həsən, Yusif, Züleyxa?
Hanı Əsli, Kərəm, Vamiku-Əzrə?
Şeyx-Sənan sevmiş idi bir tərsa,
Onların sürdüyü o dövran hanı?

Hafizu, Nəvai, Füzuli, Cami,
Şeyx Sədi, Hilali, Ürfi, Nizami,
Dünya, səndə kəşt eyləyib tamami,
Firdovsi tək nəzmi-dürr-əfşan hanı?

Hanı Molla Pənah, bivəfa cahan?
Təxəllüsü Vaqif, nəzmi-dürr-əfşan,
İndi eyləmisən xak ilə yeksan,
Tapmaq olmaz o kamalda can, ham?

Çox çətin ki, bir də dolana dövran,
Növbə mənə yetsə, aman, əlaman!
Bir gün ola görən, bilən, tanıyan,
Deyərlər Valehi-natəvan hanı?

# «ASLAN ŞAH VƏ İBRAHİM» DASTANI

Bəli, mənim əzizlərim, qulluğunuza haradan ərz eləyim – Rey şəhərindən, kimdən – Zülal şahdan. Zülal şahın varı-dövləti, cahi-cəlalı həddini aşmışdı. Bir cüt oğlu var idi. Böyük oğlunun adı Aslan, kiçiyinin adı isə İbrahim idi. Bunlar gedib, molla yanında dərs alırdılar.

Günlərin bir günü Zülal şahla arvadı küləfirəngidə oturub, qapılarındakı çinar ağacının başında yuva salan zümrüd quşlarının balalarına baxırdılar. Bir gün Zülal şahın arvadı gördü ki, Zümrüd quşu tək gəldi. Bir neçə gün keçəndən sonra baxıb gördü ki, quş gedib, özünə bir tay tapıb, gətirib. Geri qayıtdı, gəldi Zülal şahın yanına, Zülal şah baxdı ki, arvadı çox bikefdir. Zülal şah soruşdu:

– Xanım, niyə bikefsən?

Dedi:

– Zülal şah, mənimlə çıxaq, yenə bir küləfirəngidə oturaq.

Zülal şah durub, arvadı ilə bərabər küləfirəngiyə çıxdı. Bir azdan Zümrüd quşu çinarın başına gəlib, balalarına yem gətirdi, gətirdiyini balalarına verib, uçub, getdi. Bir qədər sonra təzə gələn Zümrüd quşu gəldi. Balaların qabağındakı yemi özü götürüb, yedi. Sonra onları dimdikləyib, qanına qəltan elədi.

Arvad bunu görüb, hönkür-hönkür ağladı. Şah dedi:

– Övrət, niyə ağlayırsan?

– Şah sağ olsun, o Zümrüd quşunun tayı ölüb. Gedib, özünə

bir tay tapıb, gətirib. Ona fikir verirsənmi? O təzə gələn Zümrüd quşu analıq hesab olunur. Bunu görəndə fikirləşirəm ki, mən öl-səm, mənim uşaqlarım da analıq yanında elə olacaq.

Bunu deyib, arvad yenə ağladı. Şah dedi:

– Övrət, ağlama. Allah eləsin ki, sən ölməyəsən. Amma elə iş olsa, mən heç vaxt evlənməyəcəyəm.

Vaxt dolandı, aylar keçdi, insandan ötrü ölüm haqdır, hamı öləcək. Vaxt o vaxt oldu ki, bir gün Aslan şahın arvadı ömrünü sizə bağışladı. El yığılıb, onu dəfn eləyib, ehsan verdi. Şəhər əhli şaha başsağlığı verib, dedi:

– Şah, axır qəmin olsun, başın sağ olsun, oğlanların sağ olsun.

Zülal şah arvadına söz vermişdi ki, sən ölsən də, mən uşaqla-ra analıq gətirməyəcəyəm. Aslan ilə İbrahim, doğrudan da, dün-ya gözəli idilər. Hər ikisi Yusifi-Kənana bənzəyirdi.

Aylar ötdü, illər keşdi, Zülal şah evlənmədi. Amma ildən-ilə camaatın xərcini artırırdı. Özünün də səbri daralmışdı. Camaat, şəhər əhli, ağsaqqallar yığışıb, saraya gəldilər. Şaha təzim elə-yib, dedilər:

– Şah sağ olsun, ya bizim camaatın sözünü tut, ya da bizə icazə ver, sənin vilayətindən çıxaq. Neçə ki, sən evlənməyibsən, bizə gün-güzəran olmayacaq.

Şah dedi;

– Yaxşı, bir az mənə möhlət verin.

Zülal şah gəldi oğlanlarının yanına. Başlarını sığalladı, üzlə-rindən öpdü. Bir söz demədi. Bunlar bir-biri ilə danışdılar. Daha yekəlmişdilər. Hər işi başa düşürdülər. Aslan dedi:

– Qardaş, gedək, atamıza biz də deyək, getsin, bizə bir ana gətirsin.

Getdilər atalarının dərgahına. Baş əyib, atalarına təzim elə-dilər. Zülal şah hər ikisinin üzündən öpüb, qızıl kürsünün üstün-

də əyləşdirib, soruşdu:

– Ey nuri didələrim, mənim yanıma nə məqsədlə gəlibsiniz, buyurun.

Aslan şah dedi:

– Ey atayi-mehriban, şəhər əhlinin səndən narazılığını eşitmişik. Deyirlər ki, Zülal şahın övrəti öləndən sonra camaata zülm eləyir. Ona görə, sənin yanına xahişə gəlmişik. Gərək, bizim sözümüzü yerə salmayasan. Camaatın sözünü eşidib, bizə bir ana gətirəsən.

Zülal şah oğlanlarının sözündən çıxa bilməyib, dedi:

– Yaxşı, siz gedin.

Sonra vəzirini çağırıb, dedi:

– Qulağıma sədalar gəlir ki, mən günü-gündən camaata daha çox zülm eləyirəm. Onların dolanışığı getdikcə pisləşir. İndi mənə bir tədbir tökün ki, ədalət yerini tapsın. Mən neyləyim ki, əvvəlki hörməti yenidən qazanım?

Dedilər:

– Şah sağ olsun, sənin kimi ədalətli, insaflı şah heç bir yerdə yox idi. Biz belə başa düşürük ki, sənin övrətin öləndən sonra səndə belə qəzəb, insafsızlıq, səbrsizlik peyda olub. İstəyərdik ki, sən bir cümə günü seyrə çıxasan, qəm-qüssən dağıla, eynin açıla. Ondan sonra sənə bir məsləhət eləyərik.

Zülal şah dedi:

– Nə deyirəm. Sabah cümədir. Hazırlıq görün, sübh tezdən yola düşək.

Vəzir, vəkil eşiyə çıxandan sonra camaat bu xəbəri eşitdi. Sevindilər ki, Allah, sənə şükr. Yeddi il idi, Zülal şah seyrə çıxmırdı. İndi yenə, inşallah, camaata gün doğar. Səhər tezdəndən Zülal şah, vəzir, vəkil, bir xeyli qoşun atlanıb, seyrə çıxdılar. Axşama qədər ovladılar, quşladılar. Geriyə, şəhərə qayıtdılar.

Vəzir, vəkil şah ilə bərabər saraya gəldi. Vəzir dedi:

– Şah sağ olsun, mən belə məsləhət eləyirəm ki, sənə bir övrət gətirək.

Zülal şah baxıb gördü ki, vəzir də şəhər əhlinin dediyini deyir. Zülal şah soruşdu:

– Vəzir, nə məsləhət eləyirsən?

Vəzir dedi:

– Şah sağ olsun, sizə layiq bir qız Cum şəhərinin padşahının arvadıdır. Özün bildiyin kimi də, o padşah da yeddi ildir rəhmətə gedib.

Zülal şah dedi:

– Vəzir, məsləhətdirsə, gedin, gətirin.

Vəzir qabaqcadan bir qasid göndərdi. Dedi:

– Gedin, o xanımın ağzını arayın. Görün, gəlmək fikri olsa, gəcavə göndərərik.

Bəli, çapar gedib, xəbər gətirdi ki, xanım razıdır. O, Zülal şahın ədaləti, səxavəti haqqında çox eşitmişdi. Ona görə də razılıq verdi. Gəcavələr bəzəndi. Vəzir, vəkil, bir xeyli qoşun getdi gəlinin dalınca. Bir neçə gündən sonra xəbər gəldi ki, gəcavə gəlir. Aslan İbrahimi çağırıb, dedi:

– Qardaş, gəlsənə, anamızın qabağına gedəsən.

İbrahim dedi:

– Yox, mən səndən kiçiyəm, sən özün get.

Onda İbrahimin on beş yaşı var idi. Aslan gedib, köhlən yəhərlədib, qılınc bağlayıb, atına bəzək vurub, cövlana gətirdi, gəcavənin qabağına sürdü. Xanım faytondan göz gəzdirdi, görsün, onu kimə gətirirlər. Aslan at oynadırdı. Arvad baxıb gördü ki, bir gözəl bəynişin oğlan at oynadır. Öz-özünə dedi: «Nə olaydı, məni bu oğlana gətirəydilər". Üzünü çevirdi qibləyə, Allaha dualar oxudu. Gəcavə gəldi, dayandı padşahın qapısında.

Padşah bir neçə ağsaqqal ilə söhbət eləyib, dedi:

– Bir gəlin çörəyi vermək lazımdır.

Aradan bir neçə gün keçəndən sonra arvad Zülal şaha dedi:

– Ay kişi, bəs sənin oğlandan, qızdan bir züryətin yoxdur?

Zülal şah dedi:

– Ay arvad, bəs sənin qabağında at oynadan mənim züryətimdir də, hələ biri də var. Onlar təkcə mənim yox, həm də sənin oğlanlarındır. Arvad dedi:

– İndi başa düşdüm ki, mən analığam. Ona görə, onlar mənim yanıma görüşə gəlmədilər.

Zülal şah dedi:

– Arvad, onlar dərsdədirlər, yaxın şəhərdə. İndi onları mən ismarlayaram, gələrlər səninlə görüşməyə.

Padşah xəbər göndərib, onları çağırtdırdı öz imarətinə. Onları arvadına göstərib, dedi:

– Sənin övladların, bax, bunlardır.

Arvad baxıb, gördü ki, gəcavənin qabağında at oynadan Zülal şahın böyük oğludur. O vaxtdan gözü onu yaman tutmuşdu. Bir-iki gün aradan keçəndən sonra arvad Zülal şaha dedi:

– Bəs, sənin gəzmək üçün qırx otağın, qırx bağın yoxdurmu?

Zülal şah dedi:

– Var, niyə yoxdur, qırx otağım da var, qırx bağım da.

Arvad dedi:

– Bəs mənə niyə demirsən, gəzəm, dolaşam. Qəribsəyirəm. Bəlkə, bir az eynim açılardı.

Zülal şah Aslanı çağırtdırıb, dedi:

– Aslan, oğlum, güllü bağlarımızı, otaqlarımızı, aparıb, anana bir-bir göstərərsən.

Aslan dedi:

– Baş üstə, atayi-mehriban.

Aslan anasını aparıb, güllü bağı gəzdirdi. Sonra otaqların açarını atasından alıb, başladı onları göstərməyə. Aslan qabaqca qapını açırdı. Açarı üstündə qoyurdu. Arvad dalınca qapını bağlaya-bağlaya gedirdi. Otuz doqquzuncu otağı keçdilər. Qırxıncı otaqda arvad dedi:

– Ə axmaq oğlu, axmaq, ana nədir? Səni görəndən gözüm səni tutub. Mənimlə başbirlik eləyirsən elə, eləmirsənsə, vay sənin halına.

Aslan arvadın ağzının üstündən bir elə sillə vurdu ki, gəl görəsən. Qaçmaq istədi, qapının birini açdı. İkincini açana qədər arvad daldan ona çatdı. Bıçaqla köynəyinin dalından tutub, kəsdi. Dedi:

– Get, köpək oğlu, köpək.

Aslan getməkdə olsun. Arvad Zülal şahın yanına özünü çatdırmaqda. O, Zülal şahı görən kimi səsini başına atıb, ağlaya-ağlaya dedi:

– Sənin taxtın tarac olsun, balalarının vayına oturasan.

Zülal şah məəttəl qalmışdı. Dedi:

– Ay arvad, nə olub?

Arvad bir az da səsini qaldırıb, yalandan qışqıra-qışqıra dedi:

– Görmürsənmi, nə olub? Ağzımın, burnumun qanını bir-birinə qatdı oğlun.

Zülal şah təəccüblənmiş halda dedi:

– Niyə, nə üstə?

Dedi:

– Ciyəri yanmışın dedi ki, ya gərək mənimlə başbirlik eləyəsən, ya da səni öldürəcəyəm. O biqeyrətin əlindən zorla qaçdım, qurtardım. Bu əlimdəki onun köynəyinin dal ətəyidir.

Zülal şah taxta çıxıb, cəllada əmr elədi ki, tez oğlanlarımı gətirin. Cəlladlar gedib, Aslan ilə İbrahimi gətirdilər. Şəhər əhli

əhvalatdan xəbər tutub, dedilər ki, bəlkə, Zülal şahla söhbət eləsinlər, onu dilə tutub, fikrindən döndərsinlər. Fikirləşdilər ki, bəlkə, şahın bu gün acığı tutub, oğlanlarının boynunu vurdurur. Birdən, sabah hirsi dağılandan sonra deməzmi, ay vəzir, ay vəkil, ay camaat mənim acığım tutmuşdu, bəs siz niyə mənə ağıl vermədiniz? Sonra o, camaata heç rəhm eləyər? Camaat bu fikirlə irəli yeridi. Dedilər:

– Şah sağ olsun, dünyasında elə şey olmaz. Biz özümüzü onlardan qabaq qılınca verəcəyik.

Zülal şah dedi:

– Vəzir, tədbir.

Vəzir dedi:

– Şah sağ olsun, qurra atanı çağıraq gəlsin, nə məsləhətdirsə, o deyəcək.

Qurra atan gəldi. Camaat qurra atanı öyrətdi ki, elə et ki, bunlar sürgün olunsunlar. Qurra atan qurrasını atıb, dedi:

– Şah sağ olsun, qurrada bunların payına sürgün düşür. İndi özün bilən məsləhətdir.

Şah dedi:

– Onda, onları sürgün eləyin. Amma bu şərtlə ki, hərəsi xəzinədən bir qızıl götürüb, tərəzinin gözünə qoysun. Biri o birindən ağır gəlsə, ikisinin də boynunu vurduracağam.

Hər ikisi öz qızılını qoydu tərəziyə. Xudavəndi-aləm elə elədi ki, ikisininki də eyni çəkidə gəldi. Zülal şah dedi:

– Çıxarın bunları şəhərdən!

Aslan ilə İbrahimi şəhərdən çıxarıb, Misirə doğru yola saldılar. Bunlar gecə-gündüz yol gedib, bir basəfa yerə çatdılar. Çörəkləri qurtardığından dizlərində taqət qalmamışdı. Aslan yay-ox ilə bir quş vurdu. Bu quş şah şonqar quşu imiş. Bu quşun ətini yeyən dövlətli olurmuş, başını yeyən padşah. İbrahim

kiçik olduğuna görə Aslan ətin hamısını ona verdi. Quşun başını isə özü bişirib, yedi. Bir az dincələndən sonra yollarına davam elədilər. Çox çətinliklə gəlib, Misir torpağına çatdılar. Bir böyük məzarstanın yanından keçəndə Aslan dedi:

– Qardaş, sən yorulubsan. Atalar deyirlər, məzarstan da şenlikdir. Qorxma, gəl sən bu günbəzdə dur, mən görüm, bu qəbristanlıq hansı şəhərin, hansı kəndindir. Bir tikə çörək tapım. Görək, sonrası nə olur?!.

İbrahim günbəzdə qalmaqda olsun, görək, Aslanın başına nə gəldi?.. Aslan gəlib, bir böyük şəhərə çatdı. Soruşdu:

– Bu hansı şəhərdir?

Dedilər:

– Misir şəhəridir.

Bir az ora-bura vurnuxandan sonra gördü ki, camaat çox yığılıb. Xəbər aldı:

– Bu nə yığıncaqdır?

Dedilər:

– Misirin padşahı ölüb. Quş uçurdacaqlar. Gəlib, kimin başına qonsa, onu padşah seçəcəklər.

Baxıb gördü ki, vəzirin, vəkilin oğlanları ən hündür yerə çıxıblar. Fikirləşirlər ki, quş hündür yeri daha tez tapar.

Quşu uçurdular. Quş havada cövlan elədi, bir xeyli dolaşandan sonra gəlib, Aslanın başına qondu. Vəzirin oğlu özünü yetirib, Aslana bir yumruq vurub, dedi:

– Hələ, sən bunun işinə bax. Öldüyü yerdə ölmür, gəlib, şahlıq eşqinə düşüb. Xülasə, bunu döyüb, camaatdan araladılar. Aslan çox pisikdi, döyülməyinə görə. Axı, bu gəlmişdi, yazıq, qardaşına çörək aparsın. Yenə də quşu uçurdular. Quş yenə havaya qalxdı, hərləndi, fırlandı. Təzədən gəlib, Aslanın başına qondu. Bu dəfə vəkilin oğlu yetirdi özünü:

– Ayə, sən haranın dələduzusan?

Camaat dedi:

– A kişi, yazığı niyə öldürürsünüz? Aparın uzaqda xaraba bir dəyirman var, çoxdan işləmir. Salın oraya, qapısını da örtün. Bir-iki nəfər də qaravulu qoyun, gözləsin. Baxaq, görək, quş onu yenə tapır, ya yox.

Bəziləri də dedi ki, bəlkə, papağın altına ətdən-çörəkdən qoyub, quş ona görə gedib, onun başına qonur?

Uzun sözün qısası, Aslanı aparıb, həmin dəyirmana salıb, ağzını bağladılar. İki nəfər də gözətçi qoydular. Quşu yenə uçurdular. Quş bu dəfə də çox hərləndi, getdikcə hündürə qalxdı. Bir də gördülər ki, quş qəflətən şığıdı dəyirman tərəfə. Özünü dəyirmanın bacasından içəri salıb, Aslanın başına qondu. Aslan quşu tutub, oxşadı, üzündən öpüb, dedi:

– Ay Allahın heyvanı, məni niyə döydürürsən, mənə şahlıq qismət olsaydı, öz atamın vilayətində olardı. Nə özünə, nə də mənə əziyyət vermə.

Bunu deyib, quşu buraxdı. Quş yenə getmədi, qayıdıb, yenə Aslanın çiyninə qondu. Pasibanlar içəri girib, Aslanı götürüb, getdilər şəhərə. Camaata dedilər:

– Oğlan quşu tutub, belə deyirdi: “Ay Allahm heyvanı, şah olsam, elə öz atamın vilayətində olardım!”

Sirri-Sübhan vəzir irəli yeriyib, dedi:

– Camaat, bir halda ki, quş bu oğlanın başına qonub, gəlin, elə bunu padşah seçək.

Camaatın hamısı razı oldu. Aslan şahı gətirib, taxta çıxarıb, şahlıq tacını onun başına qoydular. Dedilər:

– Buranın şahı sənsən.

Aslan şah bir neçə gün camaatla, şəhər əhli ilə məşğul oldu. Sarayın işləri ilə bərk məşğul oldu. Qardaşı yadına düşmədi.

Başı bərk qarışdığından birdən gecənin birində yatdığı yerdə İbrahimi xatırlayıb, dedi:

– Ey dadi-bidad, mən gəlmişdim ki, İbrahimə çörək aparam.

Tezdən vəzirini-vəkilini çağırıb, dedi:

– Vəzir, camaata xəbər ver, gedəcəyəm qəbristanlığa, dua verməyə. Qoy hazırlaşsınlar.

Sizə haradan xəbər verim – İbrahimdən. İbrahim gecə-gündüz günbəzdə ağlayırdı. Qırx lotu var idi. Başçısı Ziyad haramı idi. Ziyad haramı gecə vaqiəsində görmüşdü kü, bir xeyirli şey tapıb. Sabah tezdən qalxıb, yoldaşlarına dedi:

– Uşaqlar, bu günkü səfərimizdə nə tapsaq, mənim olsun.

Razılaşdılar. Atlarına minib, səfərə çıxdılar. Gəzə-gəzə gəlib, günbəzə rast gəldilər. Gördülər ki, günbəzin içində bir cavan oğlan ağlayır. Ziyad haramı günbəzin qapısından baxanda gördü ki, bu oğlan o qədər gözəldir, daha nə deyim, üz-gözündən nur tökülür. Amma bunları görəndə, hiss elədi ki, bərk qorxur. Ziyad haramı dedi:

– Oğul, qorxma.

Ziyad haramının yoldaşları içəri girdilər. Bu cavan oğlanı görəndə bir az şübhələnib, dedilər:

O özü bunu gətirib, buraya qoyub, bizə də deyir ki, bu günkü şikarımıza nə çıxsa, mənim olsun. Bir az xısınlaşandan sonra dedilər:

– Gəlin, bunu öldürək.

İbrahim onların niyyətini duyub, dedi:

– İcazə versəydiniz, dərdimi sizə sazla anladardım.

Dedilər:

– Buyur, de.

İbrahim sazını sinəsinə sıxıb, aldı, görək, nə dedi:

Başına mən dönüm, Ziyad haramı,
Gözüm yolda qaldı, gedən gəlmədi.
İtkin qardaş bağlamadı yaramı,
Gözüm yolda qaldı, gedən gəlmədi.

Ziyad haramı soruşdu:

– Sənin kimin var, haradan gəlib, haraya gedirsən?

İbrahim dedi:

– Qəribəm. Gəlib, buraya çatandan sonra qardaşım mənə burada qalmağı məsləhət gördü. Özü də getdi ki, çörək tapıb, gətirsin.

Ziyad haramı dedi:

– Gözləyək, qardaşı da gəlsin. Qardaşını siz aparın qul adına satın, pulunu bölüşdürün. Amma bunu mən aparım. Züryətim yoxdur, özümə züryət eləyim.

İbrahim aldı sözün o biri xanəsini:

Göydə bulud bulum-bulum bulanar,
Yaralarım köz-köz olub, sulanar.
Qardaş gəlib, günbəz dibin dolanar,
Gözüm yolda qaldı, gedən gəlmədi.

Bir xeyli gözlədilər. Gördülər, heç kim gəlmədi. İbrahim aldı sözünün tapşırmasında, görək, nə dedi:

Ayağım apardı yolların daşı,
Yaxamı çürütdü gözümün yaşı.
Gedib İbrahimin Aslan qardaşı,
Gözüm yolda qaldı, gedən gəlmədi.

Ziyad haramı yoldaşlarına üzünü tutub, dedi:

– Nə məsləhət görürsünüz?

Bunların içindən biri irəli yeriyib, dedi:

– Ə, belə bir oğulu heç qul adına satarlarmı? Verək Qiyas vəzir özünə oğul eləsin.

İbrahimi götürüb, Qiyas vəzirin evinə apardılar. Qiyas vəzir arvadına dedi:

– Köynəyindən keçir bu oğlanı, özümüzə oğul götürək.

Arvad Qiyas vəzirlə razılaşdı. Köynəyinin yaxasından keçirdi, İbrahimi özünə oğul elədi.

İbrahim burda qalsın, sizə haradan xəvər verim – Aslan şahdan. Aslan şah vəzirə demişdi. Şəhər əhli yığılıb, şəhərdən çıxdı. Çox razı qaldılar ki, gör nə gözəl şahdır kı, dirimiz o yanda dursun, ölülərimizin də qədrini bilir. Aslan vəzirə dedi:

– Camaat qəbristana dolmasın. İkimiz hərlənək. Daşları oxuyaq, gələk, qəbristanlığa dua verək.

Vəzir dedi:

– Camaat, ayağınızı saxlayın.

Camaat dayandı. Aslan hərlənə-hərlənə günbəzə çatdı. Baxdı, gördü ki, qardaşı yoxdur. Göydəki bulud kimi qaraldı. Vəzir onun dolduğunu görüb, dedi:

– Şah, niyə birdən-birə tutuldun?

Aslan şah gözünün on yerindən qanlı yaş tökdü, vəzirin üzünə baxıb, dedi:

– Vəzir, bu sirr ikimizin arasında qalsın.

Aldı, görək, Aslan şah nə dedi:

Alçaqdan ucaya çəkilib başın,
Məzərstanlıq, İbrahimi neylədin?
Atılsın kərpicin, qalmasın daşın,
Məzərstanlıq, İbrahimi neylədin?

Qalalar içində nə bərk qalasan,
İgidlər başına yaman bəlasan.
Qarğamıram səni, viran qalasan,
Məzərstanlıq, İbrahimi neylədin?

Aslan şaham, qəm evində yatmışdım,
Mən dərdliyəm, dərdi dərdə qatmışdım.
İbrahimi səndə qoyub, getmişdim,
Məzərstanlıq, İbrahimi neylədin?

Söz tamama yetişdi. Vəzirlə bərabər qəbristanlığı çox dolaşdılar. Çox gəzəndən sonra Aslan şah geri qayıdıb, günbəzə bir də baxdı. Dərdi tüğyan elədi. Aldı, görək, Aslan şah nə dedi:

Çərxi-fələk mənlə yaman yağıdır,
Öz mülkündən qoymur kana dərdimi,
Bir gün olar bu ölkəni dağıdır,
Çıxartmadım bir məkanə dərdimi.

Vəzir dedi:

– Şah sağ olsun, gəlsən, sənə bir söz deyəm.

Aslan şah dedi:

– Buyur, vəzir nə istəyirsən, de!

Vəzir dedi:

– Şahım, sən dərdini mənə de, bəlkə, bir şey fıkirləşdik. Yoxsa, bu camaat elə bilər ki, şah eşqə-zada düşüb, ya da başına hava gəlib.

Aslan şah dedi:

– Vəzir, qayıdan kimi başına çarə qıl. Səndən vəzir olmaz.

Vəzir kor-peşman dedi:

– Şah sağ olsun, məni bağışla, mən özüm belə dedim ki, bəlkə, sənin eynin açıla.

Aslan şah vəzirin sözündən yaman təsirlənmişdi. Dodaqları titrəyə-titrəyə Aslan şah aldı, görək, nə dedi:

Bir ah çəksən, köksüm üstdən ötürməz,
Eynim yaşı sağçarələr bitirməz.
Mənim dərdim nər mayalar götürməz,
Siz yükləyin gərgədana dərdimi.

Aslan şaham, qəm evində nökərəm,
Dost bağında qızıl güllər əkərəm.
Öz dərdimi özüm pünhan çəkərəm,
Deyə bilməm hər nadana dərdimi.

Vəzir elə başa düşdü ki, şahın, yəqin, bir istəkli qardaşı ölüb, ona görə, günbəzə, qəbristanlığa belə söz deyir. Gəlib, qəbristanlığın qırağına çıxdılar. Şah dedi:

– Hamı üzünü qibləyə tutsun. Cəmi qəbristanlıq əhlinə dua verək.

Camaatın hamısı dua verib, şahdan çox razı qaldı. Şad-xürrəm geri qayıtdılar. Şah gəlib, öz taxtına çıxdı, həmən gündən vəziri azad elədi.

Vəkil dedi:

– Ey qibləyi-aləm, Sirri-Sübhan bilikli vəzirdir. Nahaq çıxardın.

Şah bir söz deməyib, vəkilin sözü ilə Sirri-Sübhanı vəzir saxladı, təzə qaydalar, qanunlar çıxardı. O, fərman verdi ki, heç bir dükançılar, aşbazlar yadlardan, qəriblərdən pul almasın. Gəmiçilərə tapşırıldı ki, kasıblardan, qəriblərdən yol pulu almasınlar.

Camaat baxıb gördü ki, bu təzə padşah kasıb-kusubun pənahıdır. Buna görə, camaat çox sevinib, gecə-gündüz onun canına dualar oxuyurdu. Amma camaat nə bilirdi ki, padşahın nə dərdi var?.. O fikirləşirdi ki, bəlkə, qardaşım gəlib, buralara çıxar, pulu olmaz, ac qalar. Bütün bu işləri ona görə eləyirdi.

Şah öz yerində şahlıq eləməyində olsun, görək, İbrahimin başına nələr gəldi. Ziyad haramının evində qaldığı vaxtlar onun mal-dövləti o qədər artdı ki, daha haramılığa tövbə dedi. Haramı yoldaşları Ziyad haramısız bir yana çıxa bilmirdilər. Aclarından batıb qırılırdılar. Ayə, neyləyək, Qiyas vəzir bizimlə getmir, başsız qalmışıq. Bir nadürüst oğlu, nadürüst var idi içərilərində, dedi:

– Ayə, onu düzəltmək çox asandır. Bir şeytan muncuğundan olan qarı var. Onu tapmaq lazımdır.

O biri dedi:

– O qarı neyləyə bilər ki?

O dedi:

– Onun əlindən hər şey gəlir, bir ev tikməkdən başqa.

Dedilər:

– De, onda sən bildiyini eləyə bilərsən. Nə danışacaqsan, nə deyəcəksən, tezləşdir.

Oğlan gedib, qarını tapdı. Qarı baxıb, gördü ki, quldur dəstəsindəndir. Dedi:

– Oğul, buyur, eşidirəm.

– Nənə, sənin yanına bir işə gəlmişəm.

Qarı dedi:

– A bala, Allah eləyəydi, xeyir iş olmayaydı.

Dedi:

– Nənə, xeyir iş deyil.

Dedi:

– Amma bu sirr ikimizin arasında qalmalıdır.

Oğlan dedi:

– Nənə, əlbəttə ki, ikimizin arasında qalacaq.

– Oğul, onda sözünü de görüm, nə deyirsən?

– Sözüm budur ki, Ziyad haramı bizimlə haramılığa getmir. Gərək, onun evindəki oğlanı oradan didərgin salasan.

Qarı sevincək dedi:

– Bıy, nənən ölsün, ona nə var ki... Amma mənə bir ay vaxt ver, düzəldərəm.

Qarının əlində şeytan çubuğundan bir təsbeh var idi. Ona görə də buna şeytan qarı deyirdilər. Qarı bu dəfə həmin təsbehi gizlədib, özünə yüsürdən bir təsbeh aldı, qara-qənövüzdən özünə bir paltar tikdirdi, qara çarşab saldı, qara sandal geydi. Əlinə bir cəvərə alıb, küçə ilə en gedib, uzun gəlməyə başladı. Hərlənib-hərlənib, axır ki, yönünü saldı Ziyad haramının evinin yanından. Başladı qışqırmağa:

– Ay çərçi xırdası alan.

– Ay nənə, ay nənə, bəridən gəl, – deyə, qaravaşlar qarını çağırdılar.

Qarı dedi:

– A...z kimsiniz, kimin qaravaşlarısınız?

Dedilər:

– Biz Sürəyyə xanımın qaravaşlarıyıq.

Qarı dedi:

– Ay çəpəllər, mən səhv düşüb, buraya gəlmişəm. Mən onun torpağına ayaq basarammı?!

Qızlar dedilər:

– Nənə, o nə sözdür?

Qarı dedi:

– Onu çox yaxşı bilirsiniz. O çəpəlin biridir. Ona hələ xanım

da deyirsiniz?

Qaravaşlar kor-peşman geri qayıtdılar. Onlar gəlib, xanımın yanına çatdılar. Xanım soruşdu:

– A qızlar, o qarı nə satırdı?

Qızlar dedilər:

– Xanım, hər şey satırdı, amma bizə çox sərt bir cavab verdi.

Xanım dedi:

– Nə dedi, axı?!

– Onu özündən soruşun.

Qızlar gəlib, gördülər ki, qarı gedir.

Xanım dedi:

– Ay qızlar, qoymayın getməyə. Qaçın dalınca, qarını tutun, gətirin buraya.

Qızlar qarının dalınca qaçıb, ona çatdılar, qarının qabağını kəsib, dedilər:

– Nənə, xanım səni çağırır.

Qarı yenə dediyini dedi:

– Nənə sizə qurban, mən onun torpağına ayaq basmaram.

Qızlar dedilər:

– Niyə, nənə?

Axır ki, qızlar qarını al-dilə tutub, gətirdilər. Qarı küləfirəngiyə daxil oldu. Xanım ayağa qalxıb, qarıya yaxınlaşdı. Üzünü ona tutub, dedi:

– Ay nənə, xoş gəlibsən, səfa gətiribsən.

Qarı dedi:

– Heç, xoş günün olmasın. Bu qızların xətrinə gəlmişəm bu qapıya. Yoxsa, ölsəydin, bu qapıya ayaq basmazdım.

Xanım təəccüblənmiş halda soruşdu:

– Nənə, niyə, nə olub? Niyə belə danışırsan?

Qarı dedi:

– A...z, o Ziyad haramı tapıb gətirdiyi gədə gedib orada-burada ağzını boş-boş qoyub, ağlına gələni danışır. Hələ, sən eşitməyibsən ki, bir çobanın düdüyündə çalınırdı ki, «İsgəndərin buynuzu var, buynuzu»? İndi sən onun gününə düşübsən.

Xanım mat-məəttəl qarıdan soruşdu:

– Nənə, sən nə danışırsan, o nə deməkdir ki, mən onun gününə düşmüşəm?

Qarı bir az da özünü düzəltdi:

– Necə yəni, nə cür, bəyəm, eşitmirsən, bu velədızna oturub-durub hər yerdə deyir ki, Ziyad haramının arvadı gecə özünündür, gündüz də mənim?

Xanımın gözləri az qaldı ki, hədəqəsindən çıxsın. Dili tutar-tutmaz dedi:

– Nənə, nə danışırsan?!

Qarı dedi:

– İmanım kirpi dərisində olsun ki, mən hələ, indiyə qədər yalan danışmamışam.

Xanım dedi:

– Nənə, yaxşı, mən bilərəm, o bilər.

Qarı qalxıb, qızlara sapdan-sancaqdan verdi. Bir az da puldan-paradan alıb, çıxıb getdi. Qarı gedəndən sonra Sürəyyə xanım çox qəmgin, bikef oturmuşdu. İbrahim hər gün ov ovlayıb, quş quşlayıb, at oynadıb, axşamlar evə gəlirdi. Axşam düşəndə İbrahim yenə qayıdıb gəldi. Gördü ki, Sürrəyya xanım çox bikefdir. Həmişə olduğu kimi, yenə soruşdu:

– Anayi-mehriban, nə tahərsən?

Sürəyyə xanım qalxıb, onun üzündən öpərdi: “Gəl qadan alım, balama qurban olum“– deyərdi. Amma indi İbrahimə dedi:

– Kəs səsini, ananı tanıyırsan.

İbrahim dedi:

– Ana, nə olub?

Xanım hirsli-hirsli dedi:

– Sən nə danışdığını yaxşı bilirsən.

İbrahim qarının buradan çıxdığını görmüşdü. Axşam oldu. Ziyad haramı gəldi. Çörək yox, xörək yox. Hamı bikef idi. Dedi:

– Xanım, niyə eləyirsən?

Sürəyya xanım dedi:

– Tapıb gətirdiyin bu xort, gör, nə danışır?

Hamısını Ziyad haramıya söylədi. Ziyad haramı inanmadı. Dedi:

– Ay övrət, o adam gör, nə adamdır? Xudavəndi aləm, onu bizə qismət eləyəndən sonra bizim varımız, dövlətimiz artıb. Sən ağlına gələni danışma.

Xanım dedi:

– Yox, ya gərək məni öldürəsən, ya da onu.

Ziyad haramı baxıb gördü ki, yox, heç cür imkan yoxdur. Nökəri çağırıb, dedi:

– Mənim atımı yəhərlə.

Ziyad haramı xəncəri belinə bağlayıb, çıxdı qapıya. Ata minib, dedi:

– İbrahim, oğul, sən də gəl.

Dedi:

– Qoy mən atımı yəhərləyim.

Dedi:

– Yox, lazım deyil, tərkimə min.

İbrahim sıçrayıb, mindi onun tərkinə. Arvad baxıb, gördü ki, Ziyad haramı İbrahimi aparır. Dedi;

– Haradan gətiribsən, apar, orada öldür. Oğru pişiyi dəyirmanda azdırarlar.

Ziyad haramı İbrahimi gətirib çıxardı günbəzin yanına. Qəf-

lətən qamçını əlindən saldı. Üzünü ona tutub, dedi:

– Oğul, qamçı əlimdən düşdü, düş, qamçını mənə ver.

İbrahim sıçrayıb, atdan düşdü. Ziyad haramı da atdan düşdü.

İbrahimə badalaq vurub, yerə yıxdı. Tez onun əllərini bağladı. Xəncəri çıxarıb, boğazına söykəyib, dedi:

– De görüm, başından böyük nə qələt eləyibsən?

İbrahim dedi:

– Vallah, mən nə günahın sahibi olduğumu bilmirəm.

Ziyad haramı dedi:

– İndi sənin başını kəsəndə biləcəksən, günahın var, ya yox?

İbrahim dedi:

– Onda, icazə ver bir-iki qatar söz deyim.

Ziyad haramı dedi:

– De, amma tez ol. Cəhənnəmdə səni çoxdan gözləyirlər.

Aldı İbrahim:

Başına döndüyüm, Ziyad haramı,
Öldürmə, Allaha bağışla məni.
İtkin qardaş bağlamadı yaramı,
Öldürmə, Allaha bağışla məni.

Çərxi-fələk yada salıb, andırdı,
İtkin qardaş ciyərimi yandırdı.
Beyman qarı gəlib, yaman qandırdı,
Öldürmə, Allaha bağışla məni.

Dərd əlindən düyünlüyəm, dağlıyam,
Qürbət eldə dərdim kimə ağlayam?.
İbrahiməm, Zülal şahın oğluyam,
Öldürmə, Allaha bağışla məni.

Ziyad haramı həm bunun cavanlığına rəhm elədi, həm də şah oğlu olmasından ehtiyatlandı. Öz-özünə dedi: «Bir gün bu işin üstü açılar, məni bundan pis eləyərlər».

– Ə, o nə qarı idi?

İbrahim dedi:

– Şeytan qarının bizdən çıxıb, getdiyini gördüm.

Ziyad haramı barmağını dişlədi. Ürəyindən keçəni dilinə gətirdi:

– Mənim evimi yıxan odur.

İbrahimin əlini açdı. Üz-gözündən öpüb, dedi:

– Oğul, sən burada dur, mən gedim qarını tapım.

İbrahim burada gecə yatmaqda olsun, görək, başına nə iş gəldi. Gecənin bir vaxtı aləmi-röyada bir nurani ağsaqqal ona badə verib, nuş etdirəndən sonra barmağını onun gözləri qarşısında haçalayıb, dedi:

– Oğul, nə görürsən?

Bunu deyib, şəhadət barmağını haçaladı.

İbrahim dedi:

– Uzun-uzun bir yol görürəm. Sonra böyük bir şəhər görürəm. Deyəsən, Misir şəhəridir. Qəribə imarət görürəm. Bir də bir nazənin sənəm görürəm.

Ağası dedi:

– O sənin sevgilindir. Onu sənə, səni də ona buta verirəm.

Gecənin bir vaxtı İbrahim ayılıb, gördü ki, sabaha yaxındır, aldı, görək, nə dedi:

Aləmi-röyada, gördüm vəyğada,
Dilimi öyrətdim, ya sana, Mövla.
Bir Allahı iki bilən kafərdi,
İllah şəkk eyləsə, ya sana, Mövla.

Çöl quşuydum, çöl ovunun kanında,
Ovladılar səhrasında-çölündə.
Yeddi təbəqədə merac evində,
Verdi xətabanı ya sana, Mövla.

İbrahim din bəslər abid içində,
Müdəmma zülflərin abid içində.
Ərəb nisbətində, tabut içində,
Qalxdı, cavab verdi həsana, Mövla.

İbrahim gecəni sabah eləyib, yol başladı getməyə. Ağası hansı səmtə demişdi, o səmtə getdi. Bir neçə gün gedəndən sonra bir karvana rast gəldi. «Salam əleyküm, əleykümə salam»dan sonra İbrahim dedi:

– Qoca, icazə ver, səndən bir söz xəbər alım.

Sövdəgər dedi:

– Oğul, gəl əyləş, günorta namazımızı qılaq, yeməyimizi yeyək, füqara adama oxşayırsan. Ondan sonra sən deyərsən, mən də qulaq asaram.

Oturdular. Namaz qıldılar. Qurtarandan sonra Sövdəgər dedi:

– Oğul, buyur.

İbrahim fıkirləşdi ki, dərdini şeirlə desin. Aldı, görək, nə dedi:

İbrahim:
Başına döndüyüm, gül üzlü qoca,
Xoca, bir yar deyim, ver nişan, barı.
Nə günüm gün keçir, nə gecəm-gecə,
Xoca, bir yar deyim, ver nişan, barı.

Xoca Saleh:
Başına mən dönüm, gül üzlü oğlum,
Oğul, sən adın de, mən isnad verim.
Sənə yedirərəm qəndiynən, noğul,
Oğul, sən adın de, mən isnad verim.

İbrahim:
Baxçaların baharıdır, yazıdır,
Qəzəllərin söhbətidi, sazıdır.
Salığnan Fətəli xanın qızıdır,
Xoca, bir yar deyim, ver nişan, barı.

Xoca Saleh:
Mən gələndə pəncərədə durmuşdu,
Ağ üzünə halqa birçək vurmuşdu.
Firəngi qayçıynan ucun vurmuşdu,
Oğul, sən adın de, mən nişan verim.

İbrahim:
İbrahiməm, öz canımdan bezaram,
Gecə-gündüz «qardaş» deyib, gəzərəm.
Sevgilimi pünhan-pünhan gəzərəm,
Xoca, bir yar deyim, ver nişan, barı.

Xoca Saleh:
Xoca Saleh xocaların gözüdür,
Şirin-şirin söhbətidi, sözüdür.
Salığ verdin Fətəli xan qızıdır,
Oğul, sən adın de, mən nişan verim.

Bəli, əzizlərim, söz tamama yetdi. Xoca Saleh İbrahimi gətirib, öz gəcavəsinin yanında rahat elədi. Yemək-içmək hazır oldu. İbrahim gecəni burada qalıb, sabah elədi. Sabahlar üzünüzə xeyirliklə açılsın. Sabah çay-çörəyini yeyəndən sonra Xoca Saleh həmin yolu İbrahimə göstərib, dedi:

– Oğul, bax, bu yol ilə düz Herat şəhərinə gedəcəksən. Yol qırağında böyük bir imarət görəcəksən. Bax, o, Hürnisə xanımın imarətidir.

Bu sözü deyib, İbrahimi yola saldı. İbrahim getməkdə olsun, sizə haradan xəbər verim – Hürnisə xanımdan.

Hürnisə xanım üç gün bundan qabaq yatıb, vaqiəsində bir dərviş gördü. O da aləmi-röyada İbrahimi Hürnisə xanıma göstərib, dedi ki, o gördüyün oğlanı sənə buta verirəm. Hürnisə xanım da elə o gündən başındakı qırx qaravaşını çağırıb, onlara dedi:

– Bu boyda, bu buxunda, bu yaşda, çiynində saz, belə bir oğlan gəlib, buradan keçəcək. Onu görən kimi mənə xəbər eləyin.

Həmin gündən bunlar yol gözləməyə başladılar. Hürnisə xanım da pəncərədən yollara baxırdı. Günlərin birində baxıb, gördü ki, həmin aləmi-röyada gördüyü oğlandır. Qızları çağırıb, dedi:

– Qızlar, bax, o gördüyünüz oğlan vaqiəmdə gördüyüm oğlandır. Qoymayın, başqa yerə gedə.

İbrahim imarətin qabağından keçib, getmək istəyirdi. Hürnisə xanım küləfirəngiyə çıxıb, dedi:

– Ay cavan oğlan, bir ayaq saxla.

İbrahim başını qaldırıb, yuxarı baxanda gördü ki, küləfirəngidən bir xanım boylanır. Hürnisə xanım özünü tanımazlığa vurub, dedi:

– Oğlan, kimi axtarırsan? Haradan gəlib, haraya gedirsən?

İbrahim dedi:

– Xanım, yolçuyam, heç kimi də axtarmıram, yolumla gedirəm. Hürnisə xanım qızlara dedi:

– Siz onun ağzını danışığa tutun, mən özümə bəzək verim, paltarımı geyinim, gəlim.

Xanım gedib, qənövüzdən, qavırqotdan, hindiqotdan elə bir libas geyindi, elə bir bəzək vurdu ki, gəl görəsən. Qaşlarına sürmə, vəsmə yaxdı, üzünə ənlik-kirşan vurdu, gülə-gülə küləfirəngiyə çıxdı. Aldı, görək, Hürnisə xanım nə dedi, biz də nə eşitdik:

Çiyni sazlı gedən oğlan,
Qayıt, gəl bəri, gəl bəri.
Mən olum boyuna heyran,
Qayıt, gəl bəri, gəl bəri.

İbrahim fikirləşdi ki, ola bilər ki, ala çəkirlər məni. Mən ona bu saat başqa cür cavab verməliyəm:

İbrahim:
Pəncərədən baxan gözəl,
Qayıdıb, gələ bilmərəm.
Bir yarım var səndən gözəl,
Qayıdıb, gələ bilmərəm.

Hürnisə:
Gözəllərin gözü mənəm,
Aşıqların sözü mənəm.
Sevgilinin özü mənəm,
Qayıt, gəl bəri, gəl bəri.

İbrahim:
Dağların başı dumandır,
Dindirmə, halım yamandır.
Yarımın adı Yəməndir,
Qayıdıb, gələ bilmərəm.

Hürnisə:
Buyurarlar sənə fərman,
Olaram dərdinə dərman.
Hürnisəndir sənə qurban,
Qayıt, gəl bəri, gəl bəri.

Hürnisə xanım qızlara dedi:
– Sözünün təxəllüsündə, görün, nə deyir?
Aldı, görək, İbrahim nə dedi:

Yolçuyam, yoldan qalmaram,
Canımı oda salmaram.
İbrahiməm, səni almaram,
Qayıdıb, gələ bilmərəm.

Söz tamama yetdi. Hürnisə xanım özü yerə düşdü. İbrahimə əl uzadıb, salam verdi. İbrahim onun əlindən tutanda, baxıb, gördü ki, bu, əl deyil, mığrı pambığıdır. Dedi:

– Oğlan, Hürnisə xanım mənəm, məni sənə buta veriblər. Buyur, gedək imarətə.

İbrahim gəldi imarətə. Xanım qaravaşlara tapşırdı:

– Birinizin ağzından çıxmasın. İbrahim burada qalacaq.

İbrahim bir neçə gün burada qalandan sonra dedi:

– Mən darıxıram. Mən işsiz dura bilmirəm, gərək, məni bir

işə qoyasınız.

Xanım dedi:

– Hələ, atama-anama deyəcəyəm, bizi məscidə aparıb, kəbin kəsdirib, toy eləyəcəklər.

Qız qaravaşın birini göndərib, anasını çağırtdırdı. Anası gəldi, hal-əhvaldan sonra soruşdu:

– Qızım, nə olub, qadan alım, dərdin-çorun nədir, məni niyə çağırtdırıbsan?

Hürnisə qaravaşların birini göndərib, İbrahimi çağırtdırdı, dedi:

– Ana, vaqiəmdə ağam məni buna – bu oğlana, onu da mənə buta verib.

Anası dedi:

– Ay bala, ağana qurban olum. Səni belə gözəl bir oğlana buta verənə canım sədəqə olsun!

Doğrudan da İbrahim dünya gözəli idi. Yusif-Kənan onun əlinə su tökməyə yaramazdı. Anası çox şad olub, dedi:

– Qızım, gedim, atana deyim, oğlanı yanına çağırtdırsın, bir, ağlını, huşunu yoxlasın, görsün kimdir, nə karədir? Bəlkə, a bala, səydəşin, yersiz-yiyəsizin biridir.

Fətəli xan İbrahimi yanına çağırtdırdı. İbrahim şah oğlu idi, bir şahzadə salamı verdi, əl köksünə qoydu, baş əydi, ikram elədi. Kürsü göstərdilər, əyləşdi. Fətəli xan dedi:

– Oğul, nəslin-nəcabətin varmı, kimsən, nə karəsən? Yerin-yurdan haradır?

İbrahim dedi:

– Ey qibləyi-aləm, qəribəm. Şah oğluyam, amma qismət elə gətirdi ki, indi cəlayi-vətənəm.

Xan hər şeyi başa düşdü, çox çək-çevirə salmadı. Öz adamlarını çağırtdırıb, İbrahimin toyunu başladı. Toy başlandı, nə

başlandı. Yeddi gün, yeddi gecə toy elədilər. Hürnisə xanımı İbrahimə verdilər.

Bəli, əzizlərim, bunlar burada qalmaqda olsun, İbrahim bir neçə gündən sonra Hürnisə xanıma dedi:

– Mən bir iş istəyirəm.

Dedi:

– Atam nə cür iş desən, sənə verər.

İbrahim dedi:

– Yox, başqa iş istəmirəm. Mənim ticarət işindən çox xoşum gəlir.

Şəhərdə bir halvaçı Musa kişi var idi. Fətəli xan Musa kişini çağırtdırıb, dedi:

– Mənim bu göyümü (kürəkənimi) yanına götür, sən halvanı bişir, bu da dükanda satıcı olsun.

Musa kişi dedi:

– Mənim gözüm üstə.

İbrahimi aparıb, halvaçı Musanın yanına – dükana qoydular. İbrahim burada işləməyə başladı.

Sizə haradan xəbər verim – Dağıstanda Şəmİİ Cuhud adlı bir yəhudidən. Yəhudi Süleyman xanın qızına aşiq olmuşdu. Tez-tez Süleyman xanın yanına gedib, deyirdi:

– Qızını mənim oğluma ver.

O da deyirdi ki, get oğlunu gətir, qız bəyənsə, verərəm. Bu da gedib, oğlunu gətirib. Qız baxıb, görür ki, ayə, bu bir dəri, bir sümükdür, yörü-yöndəmi aynıtdır. Bir ay, iki ay keçəndən sonra yəhudi gedib, deyirdi ki, qardaşım oğluna almaq istəyirəm. Süleyman xan deyir ki, get, həmən oğlanı gətir, qız bəyənsə, verərəm. Şəmil Cuhud qızı onların adına istəyib, özü almaq istəyirdi. Axırda, baxıb gördü ki, bu kələyi baş tutmadı. Şəhər-bəşəhər düşüb, elə bir adam, yəni, elə bir cavan oğlan gəzirdi

ki, qız gedəndə ayrı bir söz tapmasın, bəyənsin. Bu fikirlə qatırı minib, yola düşdü. Onun bir qatırı var idi, adına Maça qatır deyirdilər. Yəhudi onun nalını həmişə tərs vurdurardı. Şəmil Cuhud gəzə-gəzə gəlib, Herat şəhərinə çatdı. Karvansarayda qapını bağlayıb, şəhəri gəzməyə başladı. Gəzə-gəzə gəlib, bazara çatdı. Baxıb, gördü ki, bazarda böyük bir növbə var. Bu da gəldi. Birindən xəbər aldı:

– Ayə, bu nə olan işdir, camaat niyə bura toplaşıb?

Dedilər:

– Burada halva satılır.

Şəmil Cuhud gülüb, dedi:

– Niyə, bu şəhərdə bircə yerdə halva satırlar?

Dedilər:

– Yox. Bu camaat halva satanın gözəlliyinə görə bura toplaşıb. Bir alan gəlib bir də alır.

Şəmil Cuhud də sıraya durdu. Xeyli adamdan sonra bunun da növbəsi gəlib çatdı. Yəhudi dedi:

– Mənə də halva çək, ay bala.

Şəmil Cuhud bir kirvəngə halva çəkdirdi. Pulunu verib, qurtarana qədər gözü Ibrahimin üzündə qaldı. Geri qayıtdı, karvansaraya gəldi. Gecə burada qaldı. Sübh tezdən durub, düşdü şəhərin canına. Harada ki, camaat var, ağsaqqal var, oraya gedirdi. Hərəsinə bir söz deyir, bir söz öyrənirdi. Daha doğrusu, halvaçı Musanın kökünü, nəcabətini, atasını, anasını, yeddi arxa dönənini xəbər alıb, adlarını dəftərinə yazır, gətirib, karvansarayda bir sandığa qoyurdu. Bu şəhərdə bir neçə gün qalıb, Musanın bütün qohumlarının adını öyrəndi. Bir gün də bir soraq tutdu ki, Musanın bir əmisi oğlu Qulam o vaxtdan gedib; itib, tapılmayıb. Bunları da gətirib, sandığa qoyub, gəldi halvaçı Musanın yanına. «Salam əleyküm, əleyküm salam»dan sonra tez Musanın

boynunu qucaqladı. O üzündən, bu üzündən öpüb, dedi:

– Ə, mən Qulamın oğlu döyüləmmi? O vaxt Qulam buradan başını götürüb, gedib, Dağıstanda yaşayıb. İndi bu sorağı mən almışam, eşitmişəm, Herat şəhərində mənim belə qohumlarım var. O gün də gəlib, burda halvaçı dükanının qabağında duranda xəbər aldım: – Ə, bu kimin oğludur? Elə, gədəyə qanım qaynadı. Dedilər, halvaçı Musanın oğludur. Elə ki, mən eşitdim ki, bu sənin oğlundur, mən də Allaha şükr elədim ki, nəsil-nəcabətimizdə belə bir oğlan var.

Halvaçı Musa İbrahimi oğulluğa götürmüşdü. Ona görə də hamı ona halvaçı Musanın oğlu deyirdi.

Musa kişi öz qohumlarına xəbər eləyib, bir böyük məclis düzəltdirdi ki, deməzsənmi, əmisioğlu tapılıb. Camaat tökülüşüb, ona gözaydınlığına gəlirdi:

– Allaha şükr! Ay Musa, Allaha şükr! Deyəsən, əmin oğlu gəlib.

– Hə, şükr içində olasınız, oğlunuz sağ olsun. Qulamın özünü də görməsək, oğlunu görmək qismət oldu bizə.

Musa soruşdu:

– Nə var, nə yox?

Dedi:

– Sağlığın, bir gün evdə oturURdum, atamın bir sandığı var idi, onu heç kim açmırdı. Bir gün mən açdım. Gördüm, bu şəhərdə çox adam ona borcludur. Həmin sandığı eləcə, içi dolu buraya gətirdim. İndi gözüm görmür, yazı köhlənib. Deyirəm, sabah bu gədəni verəsən, gedə mənimlə o kağızdan oxuya. Adamların kim olduğunu bilim, nisyələrimizi yığaq.

Musa dedi:

– Bu nə sözdür, lap mən də gedərəm.

Dedi:

– Yox, canım, səni qoymaram əziyyət çəkəsən.

Musa dedi:

– Onda, oğlum İbrahim, gecdəndən (səhər o başdan) qalx, əminlə get karvansarayda o kağızları oxu, qoy getsin pulunu yığsın.

İbrahim dedi:

– Baş üstə.

İbrahim gəlib, Hürnisə xanımla söhbət eləyib, bir az rahatlandı. Gecə bunların hər ikisi yenə yuxu gördü. İbrahim gördü ki, Şəmil Cuhud bunu Dağıstana aparır. Hürnisə də vaqiəsində gördü ki, İbrahimi Dağıstana aparırlar.

Hər ikisi səhər tezdəndən qalxıb, bir az yeyib-içəndən sonra, İbrahim gördü ki, Hürnisə yaman kədərlidir. Onun sözlü adama oxşadığını görən İbrahim soruşdu:

– Xanım, nə olub, niyə belə fikirlisən?

Xanım özünü saxlaya bilmədi, birdən hönkürtü ilə ağlamağa başladı. Qaravaşlar töküldülər.

– Xanım, sizə nə oldu?

Aldı, görək, xanım nə dedi:

Başına döndüyüm, qurban olduğum,
Sən gedirsən Dağıstana, İbrahim.
Alışıb, oduna büryan olduğum,
Sən gedirsən Dağıstana, İbrahim.

İbrahim baxdı, onun yuxusu xanıma da agahdır. Odur ki, dedi:

– Qardaş dərdi bir yandan, yar dərdi də o biri yandan. Dərdimi özüm tək çəkmək istəyirdim. İndi səni də dərdə saldım.

Hər şey sevgilisinə əyan olandan sonra aldı, görək, İbrahim

nə dedi, biz də nə eşitdik:

Badi-sabah yuxusundan oyanmış,
Niyyət qoyub Dağıstana gözlərin.
Əlvan birçəkləri qana boyanmış,
Niyyət qoyub Dağıstana gözlərin.

Hürnisə müşk-ənbər qoxuyan qara saçlarından üç tel ayırıb, mərmər sinəsinin üstünə endirib, gözündən qanlı yaşlar axıda-axıda aldı, görək, nə cavab verdi:

Əmdik-əmdik yarın ləbindən, qandıq,
Pərvanə tək eşqin oduna yandıq.
Yəhudi boyuna kəsdirib sandıq,
Sən gedirsən Dağıstana, İbrahim.

Şəmil Cuhud istədiyini bulmasın,
Yuvasında çır deyəni qalmasın,
Hürnisəni yanar oda salmasın,
Sən gedirsən Dağıstana, İbrahim.

İbrahim baxdı ki, xanım, qaravaşlar züy-züyə gedir, bunların ağlamasına özü də məəttəl qalıb, aldı, görək, sözünün o biri xanəsində nə dedi:

Yəhudi şəhərdə bir qılınc asdı,
Gələni-gedəni sındırıb, kəsdi.
Herat şəhərini almaqdı qəsdi,
Niyyət qoyub Dağıstana gözlərin.

Gəlib, bu şəhərdə bir qala yapdı,
Gələni-gedəni sındırıb, çapdı.
İbrahim axtardı, yar, səni tapdı,
Niyyət qoyub Dağıstana gözlərin.

Söz tamama yetdi. Xanım, qaravaşları İbrahimi öpüb, yola saldılar. İbrahim getdi. Hürnisə fikirləşdi ki, İbrahimgil hansı yol ilə gedəcəksə, orada yəhudinin qabağını kəsib, pul versəm, bəlkə, İbrahimi ondan ala bildik.

Bəli, İbrahim gəlib, Şəmil Cuhudun yanına çatdı. Şəmil Cuhud sandığı irəli çəkib, içindəki kağızdan İbrahimə verib, dedi:

– Başına dönüm, bu şəhərdə olan adamları tap.

İbrahim əyildi ki, yaxdanın lap dibindən kağızları çıxarsın, Şəmil Cuhud tez bunun ayağından qaldırıb, sandığa basdı. Sandığın qapağını bağladı. Tez bir qatırın üstünə qoyub, möhkəm-möhkəm sarıdı. Özü Maça qatıra minib, üstündə sandıq olan qatırı da onun quyruğuna bağladı. Şəmil Cuhud Hürnisə xanımın imarətinin yanından gəlib, keçmək istəyəndə, xanım irəli yeriyib, yolu kəsdi, aldı, görək, nə dedi:

Ay Yəhudi, sən Allahı sevərsən,
İnsaf eylə, gəl aparma yarımı.
O nə yoldur, ona qulluq edirsən?
İnsaf eylə, gəl aparma yarımı.

İbrahim sandığın içindən dilləndi:

– Yəhudi, səni and verirəm dininə, mənsəbinə, bir az ayaq saxla, mən ona cavab verim.

Yəhudi dedi:

– Ay gic, nə cavab verəcəksən ona, kiri, səsini kəs!

İbrahim Cuhuda yalvara-yalvara aldı, görək, nə dedi:

Ay nazənin, özün bədnam eyləmə,
Hər kəs olsa, əldən qoymaz yarını.
Xəncər alıb, bağrım başın teyləmə,
Hər kəs olsa, əldən qoymaz yarını.

Hürnisə xanım qızlara dedi:

– Qatırın noxtasından asılın, yalvaraq, görək, nə deyir, bəlkə, insafa gələ.

Hürnisə:

Pul istəsən, yüz tüməndən pul verrəm,
Qul istəsən, neçə-neçə qul verrəm.
Var istəsən, sürü-sürü mal verrəm,
Ay yəhudi, gəl, aparma yarımı.

İbrahim baxdı, Hürnisə İbrahimdən ötrü hər zada əl atır, amma Yəhudi yola gəlmir ki, gəlmir. Dedi:

– Hürnisə, özünü biabır eləmə, eldən ayıbdır.

İbrahim:
Gəl heç kəsə bağışlama qulunu,
Ara yerdə bada vermə pulunu.
El içində gödək etmə dilini,
Hər kəs olsa, əldən qoymaz yarını.

Hürnisə:
Hürnisəni qəm-qüssəyə doyurma,
Allahın var, yarı məndən ayırma.

Ayırsan da, qul adına buyurma.
İnsaf eylə, gəl aparma yarımı.

İbrahim:
İbrahiməm, dərya deyil, adayam,
Saqilər içində duru badəyəm.
Zülal şah oğluyam, mən şahzadəyəm,
Hər kəs olsa, əldən qoymaz yarını.

Söz tamama yetdi, yəhudi qatıra bir şallaq çəkdi. Qatır bayaqdan əli üstə qalxdı, yola düzəldi. Gəlhagəl, üç ay on günə gəlib, Dağıstana çatdılar. Yəhudi qatırı sürdü karvansaraya. İbrahimi da sandıqdan çıxarıb, yaxşı yemək-içmək verib, rahat eləyəndən sonra dedi:

– Oğul, mən səni öldürməyə gətirməmişəm. Mənim bir məqsədim var, onu yerinə yetirəndən sonra səni buraxacağam, gedib, öz yarına qovuşarsan.

İbrahim dedi:

– Nədir, sənin o istəyin məndən?

Şəmil Cuhud dedi:

– Çox asan bir işdir, mən səni gətirmişəm ki, Süleyman xanın qızını alıb, mənə verəsən. Ondan sonra hayana gedirsən get, sənin öz işindir.

İbrahim soruşdu:

– Mən nə təhər alacağam?

Şəmil Cuhud dedi:

– Mən sənə nə desəm, elə eləyərsən!

İbrahim dedi:

– Baş üstə.

Şəmil Cuhud dedi:

– Süleyman xan səndəıı xəbər alsa ki, sən kimin oğlusan, deyərsən, Şəmil Cuhudun. Bundan başqa heç bir söz deməzsən. Qızı alandan sonra hər şey öz yerinə düşəcək.

İbrahim razılaşıb, dedi:

– Baş üstə, nə desən, elə də olacaq.

Şəmil Cuhud gedib, elçi daşının üstündə oturub, gözləməyə başladı.

Süleyman xan adamlarına dedi:

– Gedin, görün, o kişi nə istəyir?

Gəlib, salam verib, Şəmil Cuhuddan nə murada gəldiyini soruşdular:

Şəmil Cuhud dedi:

– A bala, gedin, xana deyin ki, onun qızına elçiliyə gəlmişəm.

Bunlar gəlib, xana dedilər:

– Xan sağ olsun, o kişi deyir ki, qızının elçiliyinə gəlmişəm.

Xan dedi:

– Gedin, gətirin mənim yanıma.

Şəmil Cuhudu xanın yanına gətirdilər. Şəmil Cuhud ədəblə baş əydi, ikram elədi. Süleyman xan baxdı, bu, çox qanan, elmli bir adama oxşayır. Onunla söhbətə başlayıb, soruşdu:

– Buyur, məqsədini söylə!

Şəmil Cuhud dedi:

– Mətləb sahibi olasan, xan! Mən gəlmişəm, Allahın buyruğu, peyğəmbərin şəriəti ilə, əgər rəva bilsən, mənimlə qohum olasan, qızını mənim oğluma verəsən.

Süleyman xan dedi:

– Oğlun haradadır?

Şəmil Cuhud dedi:

– Xan sağ olsun, burada, Ala Xocanın yanındadır.

Xan dedi:

– Get, oğlunu buraya, mənim yanıma gətir.

Şəmil Cuhud tez gəlib, İbrahimi yanına salıb, apardı. Yolda öyrətdi ki, dediyim kimi eləyərsən.

Bunların hər ikisi gəldi imarətə. Şəmil Cuhud girdi içəri, yenə salam verib, əleyk alandan sonra İbrahimi çağırıb, dedi:

– Gəl, bala, gəl, utanma.

İbrahim içəri girdi. Süleyman xana şahanə baş əyib, ikram elədi, salam verib, əl köksünə qoydu.

Xan baxıb, gördü ki, Şəmil cəhənnəm kösövü kimidir. Amma oğlu olduqca mərifətli, olduqca gözəl bir cavandır. Hüsnünü çox bəyənib, soruşdu:

– Bala, sən Şəmilin oğlusan?

İbrahim dedi:

– Səki, Süleyman xan.

Xan dedi:

– Şəmil, bu nə deyir?

– Xan sağ olsun, onu mən mollanın yanından gətirirəm. Bu mollasına o qədər «səki» deyib ki, dilinin əzbəri olub. Yəni, molla Quran-Kitabı istədikcə, o deyib ki, səkidədir. Yadında o qalıb. Həm də səndən utanır.

Süleyman xan bir molla çağırtdırıb, dedi:

– Mənim qızımın siğəsini bu oğlana oxu. Qoy bu oğlanla sənin yanında söhbət eləsin. Görüm, qızım bu oğlanı bəyənirmi? Bəyənsə, hər ikisinin dilindən kağız gətir.

Molla dedi:

– Baş üstə.

Molla siğəni oxuyub, tapşırdı ki, oğlanla qızı onun yanına gətirsinlər.

Molla qızdan soruşdu:

– Qızım, de görüm, bu oğlanı bəyənirsənmi?

Qız dedi:
– Molla əmi, icazə ver, mən sözlə deyim, sən də yaz, atama apar.
Molla razı olub, dedi:
– Buyur, qızım.
Qızın adı Şəhrəbanı idi. Şəhrəbanı aldı, görək, nə dedi:

Başına mən dönüm, ay molla baba,
Molla, bəy babama yazginən, versin.
Kəmərin qurşasın Məkkəyi-Kəbə,
Molla, bəy babama yazginən, versin.

Molla baxdı ki, qızın getmək fikri var. Dedi:
– Qızım, baş üstə. Dediyini yazıb, atana çatdıraram. İndi, görüm, oğlan nə deyir?
Molla baxdı, oğlan çox utancaqdır. Amma qız cilov gəmirir. Aldı, görək, İbrahim mollaya nə cavab verdi:

Başına mən dönüm, ay molla baba,
Bizim dinlər hamı dindən hayıfdır.
Kəmərin qurşasın Məkkəyi-Kəbə,
Bizim dinlər hamı dindən hayıfdır.

Molla baxdı ki, gədə qızı istəmir. Gədə, deyəsən, səydir; din nədir, zad nədir? Molla yazmağa başlayanda qız mollanın əlindən tutdu.
– Ay molla baba, o deyəni yazma. Mən dediyimi yaz. O, yol gəlib, yorğundur. Onun üçün elə deyir.

Aldı Şəhrəbanı:
Oğlan gəlib bu sevdaya dayanmaz,
Gülgəz birçəkləri əlvan boyanmaz.
Necə, mən bəyənəm, oğlan bəyənməz,
Molla, bəy babama yazginən, versin.

Molla dedi:

– Qızım, atanın tapşırığıdır, mən düzünü yazacağam. Sonra bir zad olar, boynumu vurdurar.

Aldı İbrahim:
Başıma qoymuşam ədalət tacı,
İtibdir qardaşım, ağzımdır acı.
O dünya, bu dünya, o mənə bacı,
Bizim dinlər hamı dindən hayıfdır.

Molla baxdı, oğlan ayrı cür başladı. Dedi:

– Qızım, daha başqa söz ola bilməz. Özün görürsən ki, bu sənə bacı deyir. Daha bu iş baş tuta bilməz.

Qız dedi:

– A kişi, bir qoy sözümüzün axırını deyək. O da özünü düzəltsin, sən tələsmə. Bu gün sən bizimlə məşğul olmalısan, yoldan çıxanı yola gətirməlisən.

Molla dedi:

– Qızım, görmürsən, tır deyib, gendə durur. Utanma, bala, çəkinmə. Bu qızı sənə verirlər, de görüm, nə deyirsən?

İbrahim dillənmədi. Qız dedi:

– Qoy mən sözümü deyim, o da özünü tarazlasın.

Aldı Şəhrəbanı:

Şəhrəbanıyam, köksüm bəndin açaram,
Yaxşını, yamanı mən də seçərəm.
Babam da verməsə, qoşulub qaçaram,
Molla, bəy babama yazginən, versin.

Molla dedi:

– Ay qız, mən neyləyim, oğlan razı deyil.

Şəhrəbanı dedi:

– Onun dediyini yazma, de ki, oğlan "hə" dedi.

Bunu eşidib, aldı, görək, İbrahim nə dedi:

İbrahiməm, əslim ay Qaradağlı,
İtibdir qardaşım, ciyərim dağlı.
Yəhudi olanın kim olar oğlu,
Bizim dinlər hamı dindən hayıfdır.

Molla hər şeyi olduğu kimi yazdı. Qız nə qədər xahiş elədisə, molla baxmadı. Yazıb, eşiyə çıxmaq istəyəndə gördü ki, Şəmil Cuhud qapının ağzında durur. Şəmil Cuhud mollanın qabağını kəsib, dedi:

– Molla, səni dünya malından qane eləyəcəyəm. Gəl sən o kağızı dəyiş.

Şəmil Cuhud sehrbazın, cadügərin biri idi. İstəyəndə daşı, torpağı yığıb, bir «ismi-əzəm» oxuyub, qızıl-gümüş eləyirdi. Baxan elə bilirdi ki, qızıldır, ləl-cəvahiratdır. Tez-tələsik bunlardan bir kisə mollaya verdi. Molla dedi:

– Qızım, bax, sənin xətrinə bu kağızı dəyişirəm.

Şəhrəbanı xanım sevindiyindən dedi:

– Molla, imanın kamil olsun. Mən də anamla sənin nəmərini alıb, verəcəyəm. Dünya malı dünyada qalacaq, molla əmi,

yaxşılıq elə.

Molla Süleyman xanın yanına gəlib, dedi:

– Hər şeyi yoluna qoyub, gəldim.

Sonra kağızları Süleyman xanın qabağına qoydu. Xan baxdı ki, qızı razıdır. Deyir, verməsə də qaçaram. Amma, oğlan heç bir söz yazmayıb. Eləcə, "hə" deyib. Dedi:

– Şəmili çağırın, gəlsin.

Şəmil gəldi.

– Xan sağ olsun, eşidirəm, nə desən, boynum qıldan nazikdir.

Süleyman xan dedi:

– Mənim şəhərimdə bir imarət tikdirib, hazır olanda gəlib, deyərsən. O zaman mən qızımı sənin oğluna verərəm. Ona görə ki, bir qızdır, gözümdən uzağa qoya bilmərəm.

Şəmil Cuhud əl köksünə qoyub, dedi:

– İcazə ver, qulluğundan mürəxxəs olaq.

Dedi:

– Get, işin avand olsun.

Şəmil Cuhud tez özünü bazara salıb, bir bənna tapdı. Bənna dedi:

– Buyur ağa, görüm, nə deyirsən?

Şəmil Cuhud dedi:

– Mənə ev lazımdır. İki mərtəbəli bir evi neçə günə tikə bilərsiniz?

Bənna dedi:

– Hər şeyi hazır olsa, üç-dörd aya, bəlkə, başa gətirə bilərik.

Şəmil dedi:

– A kişi haqqından çəkinmə, sən, elə bil, üç bina tikirsən. Onun haqqını verəcəyəm, mən oğluma toy eləyirəm, bir elə gözləyə bilmərəm. Tezləşdir. Özünə çoxlu yoldaş götür. Bu iş ləngiyəsi iş deyil.

Söylədi ki, mən filankəslə qohum oluram. O da belə istəyib. Qadan alım, bənna, durma, işə başla.

Bənna dedi:

– Yerini göstər, görək, neyləyirik...

Şəmil Cuhuda xan yer göstərib, demişdi: "Cüyür talası var, mənim yaylaq yerimdir. İmarəti orada tikərsən." Şəmil Cuhud həmin yeri ustaya göstərdi. Usta pulunu alandan sonra dedi:

– Bir aya kimi ev çağ-çillə hazır olacaq. Qorxma, get, sən toyuna hazırlaş. Bundan arxayın ol.

Şəmil Cuhud geri qayıdıb, başladı toya hazırlaşmağa. Bir aya bənna evi hazırladı. Şəmil Cuhud gəlib, gördü ki, ev hazırdır. Daşı-torpağı yığıb, bir «ismi-əzəm» oxuyub, qızıla çevirdi. Ustalara verib, yola saldı. Gəlib, Süleyman xana dedi:

– Xan sağ olsun, mənim evim hazırdır, icazə ver, toyu başlayım.

Süleyman xan dedi:

– Gələn adna axşamı gəlib, gəlini apararsan.

Şəmil Cuhud gəlib, toya hazırlaşmağa başladı. Ətlik heyvanlar alıb, aşbaz çağırıb, hər nə ki, hazırlıq var, hamısını tamamladı. Adna axşamı gün çıxmazdan qabaq bir gəcavə bəzəyib, gətirdi Süleyman xanın qapısına. Xan baxdı, oğul toyu eləyir deyə, çox sevinir, amma kişi təkdir. Nökər-naibə tapşırdı ki, Şəmil kişinin toyuna kömək eləyin. Toy başlandı. Gəlini gətirib, imarətə düşürdülər. Camaat yeyib-içib, oxuyub-oynayıb, hərə öz evinə dağılışdı. Cuhud İbrahimi çağırıb, dedi:

– Al bu xəncəri, gecə qızla yatanda aranıza qoy, əgər əlin-əlinə dəysə, əlini; ətin-ətinə dəysə, ətini kəsəcəyəm. Dilin-dilinə dəysə, dilini dibindən qoparacağam.

Axşam qızın yanında yatmaq məqamı gəldi. İbrahim xəncəri çıxarıb, ikisinin arasına qoydu. Qız baxdı ki, iş baş tutmadı. Qaldı ki, neyləyim, necə eləyim. Beləcə yaşadılar. Bir-neçə həftə

beləcə ötüşdü. Bir gün qızın anası dedi: Qızımın qaynanası yox-dur, gedim, görüm, nə təhər dolanır. Öyüd-nəsihət verim, yol göstərim.

Xanım durub, qızının yanına gəldi. Qızı ilə, yeznəsi ilə öpüşdü. Gördü, bunlar bikefdirlər. Xanım işi anlamaq üçün qızı yanladı:

– Qadan mənə gəlsin, nədən korluğun var? Bikef dəyirsən gözümə.

Qızı ağladı. Anası yenə dedi:

– Anan ölsün, niyə ağlayırsan?

Şəhrəbanı xanım dedi:

– Ana, mən bu oğlana getmirəm.

Xanım dedi:

– A niyazadı qancığı, özün sevib, seçmədinmi?

– Yox, indi getmirəm.

Arvad əlini atıb, üzünü cırdı. İki əli oldu, bir başı. Qız aldı, görək, nə dedi:

Başına döndüyüm, gül üzlü ana,
Ana, vallah, bu oğlana getmirəm.
Əmmişəm südünü mən qana-qana,
Ana, vallah, bu oğlana getmirəm.

Anası dedi:

– Ay çəpəl, bəs niyə yazırdın ki, babam da verməsə, qoşulub, qaçaram. İndi nə olub, de?

Şəhrəbanı dedi:

Səhər tezdən durub, gedir oynuna,
Bivəfadır ortaq olmam deyninə.
Öpmək-cummaq gəlmir onun eyninə,
Ana, vallah, bu oğlana getmirəm.

Anası işi başa düşüb, qızına dedi:

– Qızım, eybi yoxdur, axırı yaxşı olar, sən ağıllı ol, oğlan yaxşı oğlandır.

Şəhrəbanı aldı sözün o biri xanəsini:

Qoyun deyil, qoyunlara qatmayım,
Öküz deyil, çodarlara satmayım.
Qadın deyil, sarmaşmayım, yatmayım,
Ana, vallah, bu oğlana getmirəm.

Anası dedi:

– Bəs, kimə getmək fikrində idin?

Qız dedi:

– Əmim oğlu Məmmədbağıra gedəcəyəm:

Arı desən, qızıl güldən arıyam,
Duru desən, çeşmələrdən duruyam.
Şəhrabanıyam, Məmmədbağır yarıyam,
Ana, vallah, bu oğlana getmirəm.

Anası başa düşdü ki, qız atası evindən gələn kimidir. Odur ki, dedi:

– Qızım, gedim, atana deyim, sən bir az döz. Yəqin ki, atan bu işə bir əncam qılar.

Arvad eşiyə çıxıb, getməkdə olsun, sizə xəbər verim Şəmil Cuhuddan. Şəmil Cuhud vəziyyəti bildi. Hazırlaşdı ki, bu saat xan məni çağıracaq. Arvadın xanın yanına çatmasından bir az keçmişdi ki, xan Şəmil Cuhudu çağırtdırdı. Şəmil əl köksündə baş əydi. Xan qəzəblə soruşdu:

– Ayə, şoqərib oğlu, şoqərib, bu nə işdir, mənə de görüm.

Şəmil Cuhud elə ağladı kı, Süleyman xan məəttəl qaldı.

Dedi:

– Ə, niyə ağlayırsan?

Dedi:

– Xan sağ olsun. Sən elə bilirsən ki, mənim kimim-kimsəm yoxdur. O toy deyildi, mən elədim. Oğluma mən özüm tapşırmışam ki, bala, bacı-qardaş kimi yatın. Mən xandan icazə alacağam, gedib, öz elimdə başımı açıb, toy eləyəcəyəm. Bəs bu toydur ki, mənim qohumum, qardaşım, bacım qol qaldırıb, bir nübarımın xeyir işində oynamasın?.. Onda ölüm mənə fərzdir.

Süleyman xan Şəmil Cuhudun sözünə inandı. Onun ağlayıb, sızlamasından təsirlənib, dedi:

– İndi ki, belə oldu, gəlinini də götür, get öz elinə, orada toy elə.

Şəmil Cuhud bu sözü eşidib, razılaşdı. Gəcavə bəzəndi. Şəmil Cuhud gedib, karvansarayda saxladığı qatırı gətirdi. Hər şey hazır olandan sonra xan dedi:

– Aparın, bizim torpaqdan ötürün.

Bir xeyli gedəndən sonra Şəmil Cuhud dedi:

– Siz qayıdın, biz özümüz buradan o yana yavaş-yavaş gedəcəyik. Siz əziyyət çəkməyin.

Bunlar qayıtdı. Şəmil Cuhud yol başladı. Gəlib, Firəng torpağına çatdı. Bir basəfa çəmənlikdə rahatlanmaq üçün əyləşdilər. Çörək yedilər, qalxıb, yola düşmək məqamında Şəmil Cuhud İbrahimi sandığa qoyub, ağzını bağladı. Sonra sandığı qatırın üstünə qoyub, möhkəm-möhkəm sarıdı. Qız bu işi görüb, mat-məəttəl qaldı. Şəmil Cuhud qıza dedi:

– Min tərkimə.

Qız Şəmil Cuhudun tərkinə mindi. Bir xeyli gedəndən sonra bir qayalığa rast gəldilər. Şəmil Cuhud qatıra bir biz vurub,

buraxdı. Qatır özünü qayadan atdı. Qatır da, sandıq da parça-parça oldu. Amma İbrahimi Allah saxladı. Salamat qaldı. Xudavəndi-aləm adamı öldürməyəndə, öldürmür. Şəmil Cuhud baxdı ki, Firəngistana çatıb. Bir karvansaray tapıb, orada dincəlmək istəyəndə bir də, gördü ki, budur, İbrahim böyürdən çıxdı. Şəmil Cuhud İbrahimi görən kimi başladı yaxasını yırtıb, vay-şivən qoparmağa.

Camaat tez onun başına yığıldı. Nə baş verdiyini soruşanda, Şəmil Cuhud dedi:

– Bu gədə məndən əl çəkmir. Camaldan gözəldir deyə, mənim arvadımı əlimdən almaq istəyir.

Tez bunu xanın yanına apardılar. Xan əmr elədi, meydana dar ağacı düzəltdilər. Firəngistanda belə əməllərin üstündə adamları sorğusuz-sualsız dar ağacından asırdılar.

Xan qızdan soruşdu:

– Bala, söylə görüm, kimsən, kimin qızısan, bu nə işdir, siz törədirsiniz?

Qız aldı, görək, nə dedi:

Bu yəhudi sənə yalan deyirdi,
Əlac sənə qaldı, Firəngin xanı.
Babam məni İbrahimə veribdi,
Əlac sənə qaldı, Firəngin xanı.

Bu sözləri eşidən kimi xan əmr elədi ki, Şəmil Cuhudu tutsunlar. Fərraşlar bir göz qırpımında onun qollarını bağlayıb, cəlladın qabağına çəkdilər.

Qız aldı sözün o biri xanəsini:

Canım qurban İbrahimin canına,
Öldürüb, batmaynan nahaq qanına.
Çapar göndər Dağıstanın xanına,
Əlac sənə qaldı, Firəngin xanı.

Xan dedi:

– Yəhudinin ayağına qandalaq vurun, boynuna gündə asın. Əmr o dəqiqə yerinə yetirildi.

Şəhrəbanı aldı, görək, özünü necə istinad verdi:

Adım Şəhrəbanı, Dan ulduzuyam,
Atamın-anamın bircə qızıyam.
Dağıstanda Süleyman xan qızıyam,
Əlac sənə qaldı, Firəngin xanı.

Süleyman xanın adını eşidəndə xan irəli yeriyib, Şəhrəbanının başını sığalladı. Ona toxtaqlıq verib, dedi:

– Mənim balam, qorxma, əminin yanına gəlibsən.

Xan üzünü İbrahimə tutub, dedi:

– Ayə, yoxsa, sən də yəhudisən?

İbrahim dedi:

– Allah eləməsin, xan! İcazə ver, bir kəlmə də mən deyim. Aldı İbrahim, görək nə dedi, biz də nə eşitdik:

Ay ağalar, ay qazilər,
Mən Əlini Vəli billəm.
Gecə-gündüz əzbərimdir,
Mən Əlini Vəli billəm.

Qızıl gülləri dərsəniz,
Sinəm üstünə sərsəniz.
Əmr eləyib, öldürsəniz,
Mən Əlini Vəli billəm.

Onun bu sözləri xanın çox xoşuna gəldi. Onun yəhudi olmadığını biləndən sonra sevindiyindən bilmədi ki, neyləsin. İbrahim aldı sözün o biri xanəsini:

İbrahiməm, bəxti qara,
Kim eylər dərdimə çara.
Dilimdən çəksələr dara,
Mən Əlini Vəli billəm.

Xan dedi:
– Vəzir, tədbir.
Vəzir dedi:
– Xan sağ olsun, bu yəhudinin boynu vurulsa, onun qanından bircə damcı bizim torpağa düşsə, düz yeddi il burada ruzi olmayacaq. Bunu şəhərin kənarında bir susuz, kor quyu var, ora salaq, qoy orada zülmlə gəbərsin.
Hamı razı oldu. Şəmil Cuhudu aparıb, həmin quyuya atdılar. İki cəlladı da bunun başının üstündə qoydular. İbrahim ilə Şəhrəbanı bir müddət Firəng şahının evində yeyib-içib, dincəldilər. Günlərin birində İbrahim dedi:
– Xan sağ olsun, icazə ver, biz gedək.
Xan hazırlıq görüb, gəcavə hazırlatdırdı. Bunları böyük təmtaraqla yola salıb, adamlarına tapşırdı:
– Aparın, bunları gəmiyə mindirin.
Bunlar dəryanın kənarında getməkdə olsunlar, sizə kimdən

xəbər verim, Şəmil Cuhuddan. Şəmil Cuhud quyuya atılandan sonra işi fırıq görüb, yenə hiyləyə əl atdı. Yağlı dilini işə salıb, quyudan cəlladlara dedi:

– Ay cəlladlar, mən ölürəm, amma həmişə hamıya yaxşılıq eləmişəm. Yanınızda torbanız varsa, buraya sallayın.

Cəlladlar dedilər:

– Gəl, bu torbanı sallayaq, görək, neyləmək istəyir?

Xülasə, bir torba tapıb, salladılar quyuya. Bu lənətə gəlmiş daşı-torpağı yığıb, torbaya doldurub, bir «ismi-əzəm» oxudu. Torbanın içindəkilər dönüb, oldu qızıl-gümüş. Cəlladlar çəkdilər. Baxanda məəttəl qaldılar. Cuhud quyudan yenə səsləndi:

– Bu birinizin payıdır, torbanı bir də sallayın.

Cəlladlar torbanı bir də salladılar. Bir torba qızıl da o birisinin payına düşdü. Cəlladlardan biri dedi:

– Ayə, bu bizim hərəmizə bir torba qızıl verdi. Gəl, biz də yaxşılıq eləyib, bunu quyudan çıxaraq. Çıxıb, getsin. Özümüz də yenə burada bir-neçə gün durandan sonra gedib, xana deyərik ki, Cuhud öldü.

Hər ikisi razılaşdı. Şəmil Cuhudu quyudan çıxarıb, azad elədilər. Şəmil Cuhud dəryanın yanına gəldi ki, gəmiyə minsin. Baxdı ki, İbrahim ilə qız da burdadır. Tez gəminin böyüyünə yaxınlaşıb, dedi:

– Sənə nə qədər qızıl istəsən, verəcəyəm, amma bir sözüm var, gərək, onu yerinə yetirəsən.

Gəminin böyüyü dedi:

– O nədir elə, birdən, çətin iş olar?

Şəmil Cuhud dedi:

– Sənə elə çətin iş deməyəcəyəm. Bax, o qızı görürsən? Onu mən olan gəmiyə mindir. O oğlanı da daldakı gəmiyə mindir. Sənə bir torba qızıl verəcəyəm.

Dünya malı şirindir, insanın evini tamahdan başqa heç nə yıxa bilməz. Şəmil Cuhud özünü dəryanın qırağına verib, bir torbanı qumla doldurdu. Oxuyub-üfürdü, qızıla çevirib, gətirib, gəminin böyüyünə verib, geri durdu. Gəminin böyüyü dedi:

– Gəlin, gəmi yola düşür.

Şəmil Cuhud ilə Şəhrəbanı xanımı bir gəmiyə mindirdi, İbrahimi də zorla o biri gəmiyə atdırdı. İbrahim işi başa düşüb, dedi:

– Mən o bir Allahın ətəyindən tutmuşam. Allaha pənah.

Dərya təlatümə gəldi, gəmilər bir-birindən ayrıldı. İbrahim Şəhrəbanıdan ayrı düşdü. İbrahimin dərdi tüğyan elədi. Gözünün yaşını axıda-axıda aldı, görək, nə dedi:

Ağrın alım, mələkzada,
Gəmim də qaldı dəryada.
Haqq özü yetişsin dada,
Gəmim də qaldı dəryada.

Şəhrəbanı İbrahimin dəryanın üzündə qaldığını görüb, ağlaya-ağlaya aldı, görək, nə dedi:

Qaldım cəlladlar əlində,
Qoymurlar düşəm dəryaya,
Haqq özü yetişsin dada,
Qoymurlar düşəm dəryaya.

Aldı İbrahim:
Çıxıb, qıraqda otursan,
Ağ üzdən busə götürsən,
Aslan adlı bir şah görsən,
De, qardaş qaldı dəryada.

Aldı Şəhrəbanı:
İstərəm fənadan köçəm,
Dostu, düşmanımı seçəm.
İstəyirəm zəhər içəm,
Qoymurlar düşəm dəryaya.

Aldı İbrahim:
İbrahim dəryada qalsa,
Saralıb gül, rəngi solsa.
Aslan şah gər, xəbər alsa,
De, qardaş qaldı dəryada.

İbrahim öz-özünə fikirləşdi:

–Yəqindir ki, Şəhrəbanı Misir şəhərinə gedəcək.

O, eşitmişdi ki, qardaşı Misirin padşahıdır. Ona görə belə deyirdi ki, sevgilisi ona rast gəlsə, özünü istinad versin.

Şəhrəbanı aldı sözünün tapşırmasında, görək, nə dedi:

Şəhrəbanı oldu dəli,
İmdadıma yetsin Əli.
Yəhudiyə deməz «bəli»,
Qoymurlar düşəm dəryaya.

Bəli, əzizlərim, gəmi qırağa çıxdı. Şəmil Cuhud Şəhrəbanını götürüb, Misir şəhərinə gəldi. Şəhrəbanı Şəmil Cuhuda dedi:

– Get, bir imarət yapdır. Elə imarət olsun ki, məndən, səndən başqa oraya heç kim çıxa bilməsin.

Şəmil Cuhud dedi:

– Xanım, bu nətəhər imarətdir? Bunu nətəhər tikəsiyik?

Xanım dedi:

– Ustaları çağır, bir mərtəbə hörüləndə mən onun üstündə olum, sonra o birini başlasınlar, pilləkən qoymasınlar. Sən mənim yanıma gələndə mən səni kəməndlə çəkərəm.

Elə də elədilər. Bina başa gələndən sonra Şəmil Cuhud dedi:

– Hə, indi kəməndi salla, mən də çıxım.

Şəhrəbanı xanım dedi:

– Get, İbrahimin qanlı köynəyini gətir, gəl, ondan sonra səni buraya çıxardaram.

Şəmil Cuhud başı alovlu düşdü düzlər gəzməyə ki, görüm, başıma nə çarə eləyirəm.

Şəmil Cuhud gəzməkdə olsun, sizə haradan xəbər verim – İbrahimdən. İbrahimin gəmisi dalğaların zərbinə tab gətirməyib, batmışdı. İbrahim tək-tənha bir qırıq taxta parçasının üstündə qalmışdı. Əli yerdən-göydən üzülmüşdü. Ümid bir Allaha qalmışdı.

İbrahim sazını sinəsinə basıb, görək, böyük Yaradandan necə kömək istədi:

Ərşi-gürşü, yeri-göyü yaradan,
Ağa, qaldım bu dəryanın üzündə.
Sənə üz tutanlar qalmaz intizar,
Ağa, qaldım bu dəryanın üzündə.

Biz dözmədik bu dünyada beş günə,
Fələk kəmənd atdı ömrüm köşkünə.
Adı bəlli Məhəmmədin eşqinə,
Ağa, qaldım bu dəryanın üzündə.

Yer üzündə, de, azdırmı təpələr,
Yağış orda yağar, burda səpələr,

İbrahimi məhv eləyər ləpələr,
Ağa, qaldım bu dəryanın üzündə.

Söz tamama yetdi. Xudavəndi-aləmin hökmü ilə qiblə səmtindən əsən külək həmin taxta parçasını vurub, çıxardı qırağa. İbrahim otdan-ormandan tutub, taxta parçasının üstündən düşdü. Gəlib, dəryanın qırağında oturub, Misir tərəfə boylana-boylana, aldı, görək, nə dedi, biz də nə eşitdik:

Ağlaram, sızlaram dərya qırağı,
Bəlalı başıma qardaş bulunmaz.
Ağlaram, sızlaram həsrətim çoxdur,
Bəlalı başıma qardaş bulunmaz.

Ağladım, sızladım burda oturdum,
Özüm öz dərdimi təkcə götürdüm.
Urum ölkəsində qardaş itirdim,
Bəlalı başıma qardaş bulunmaz.

İbrahim deyilən ağır eldəndir,
İgid əksikliyi acı dildəndir,
Arvad yad qızıdır, oğul beldəndir,
Oğul ələ düşər, qardaş bulunmaz.

Bir də baxıb, gördü ki, bu tərəfdən bir sürü qoyun çıxdı. Qoyun dəryaya sarı töküldü. Çobanın itləri İbrahimin üstünə yeridi. Vəli çoban onu görüb, dedi:

– Ayə, Alı buraya gəl. Qoyunu yeyəni itlər tapdı.

Alı gəlib, gördü ki, bu, adamdır. Dedi:

– Ayə, ay Vəli, bu qoyun yeyən deyil. Bu, adamdır. Yazıqdır,

itlər onu dağıdacaq.

İbrahim baxdı ki, bunun biri elə bir himə bənddir ki, adamın ciyərini  çıxarsın. Amma o biri yaxşı adama oxşayır. Dəli çobandan canını qurtarmaq üçün sazını sinəsinə sıxıb, aldı, görək, nə dedi:

Çoban qardaş, çoban qardaş,
Mən sizi deyə gəlmişəm.
Mənzili biyaban qardaş,
Mən sizi deyə gəlmişəm.

İbrahimin əlində bir balaca cürə sazı var idi. Vəli çoban dedi:

– Bu yaman çınqır-cunqur eləyir. Bunu onun əlindən alacağam. Özünü də yanımda saxlayıb, çoban eləyəcəyəm.

İbrahim çobanın bu sözündən yaman tutuldu. Dərdi tüğyan elədi, aldı, görək, nə dedi:

Əlimdən alma sazımı,
Sənə deyərəm sözümü.
Süleyman xanın qızını,
Dəryada qoya gəlmişəm.

İbrahiməm, budur sözüm,
Dərdimi dəftərə yazım.
Şəhrəbanı iki gözüm.
Mən sizi deyə gəlmişəm.

Söz tamama yetdi. Alı çoban, Vəli çoban İbrahimi tapdıqlarına çox sevindilər. Onu da götürüb, öz olacaqlarına gəldilər. Bir heyvan kəsib, bişirdilər. Ətin yaxşı yerindən İbrahimin qabağı-

na böyük bir nimçə qoydular. İbrahim dəryada çox ac qalmışdı. Bir-iki qismət alıb, əlini çəkdi.

Vəli çoban dedi:

– Yeginən, yeməsən, sən öl, quşqonmazına bircə çomaq endirərəm.

Alı dedi:

– Ay Vəli, onun xətrinə dəymə.

İbrahim altı ay da burada qoyuna getdi. Altı aydan sonra Vəli çoban dedi:

– Mən şəhərə sallaqxanaya heyvan aparacağam.

İbrahim dedi:

– Ay Alı, Vəliyə de, həm ona kömək eləyim, həm də gedim, özümə paltar alım.

Vəli dedi:

– Yox. Bu gedib, şəhəri görsə, qayıdıb, burada durmayacaq.

Alı dedi:

– Durar, qoy getsin.

Gəldilər şəhərə. Heyvanları sallaqxanaya aparıb, qırdırmağa başladılar. Vəli çoban dedi:

– İbrahim, mən şəhəri gəzəcəyəm. Sən burada heyvanlar qırılanda yanında dur, iç yağını dağarcığa yığ. Ay gədə, bir sözlə heyvanlardan muğayat ol.

Bəli, bu getməkdə olsun, sizə haradan xəbər verim – Allah lənət eləmiş Şəmil Cuhuddan. Elə, bu arada o gəzə-gəzə gəlib, sallaqxanaya çıxdı. İbrahimi burada görüb, tez özünü verdi sallaqbaşının yanına. Bic-bic dişini ağardıb, ona dedi:

– Ayə, istəyirsənmi, sənə bir kisə qızıl verim?

Sallaqbaşı dedi:

– Bunun səbəbi nədir, belə?

Lənət olmuş dedi:

– Mən istəyirəm ki, o yanındakı oğlanı öldürüb, qanlı köynəyini mənə verəsən.

Sallaqbaşı az fikirləşəndən sonra İbrahimi yanına çağırıb, dedi:

– Gəl, bir qoyun tut, gətir.

İbrahim bir qoyun tutub, gətirdi. İbrahim ikinci qoyunu gətirəndə sallaqbaşı İbrahimə bir təpik vurdu. İbrahim dığırlanıb, qoyunun yerinə yıxıldı. Sallaqbaşı bıçağı dirədi İbrahimin boynuna. İbrahim dedi:

– Sallaq əmi, nə qayırırsan?

Sallaq dedi:

– Başını kəsirəm.

İbrahim dedi:

– İcazə ver, ürəyimdə bir-iki xanə sözüm var, onu deyim, sonra kəsərsən.

Aldı İbrahim:

Başına mən dönüm, ay sallaq qardaş,
Öldürmə, Allaha bağışla məni.
Ağlaram, eynimdən axar qanlı yaş,
Öldürmə, Allaha bağışla məni.

Başım qoydum sallaqxana daşına,
Rəhm eylə gözümdən axan yaşıma.
Məni çevir balaların başına,
Öldürmə, Allaha bağışla məni.

Dərd əlindən düyünlüyəm-dağlıyam,
Qürbət eldə dərdim kimə ağlayam?..
İbrahiməm, Zülal şahın oğluyam,
Öldürmə, Allaha bağışla məni.

Zülal şahın adı gələndə sallaqbaşı, elə bil, yuxudan ayıldı. Üzünü İbrahimə tutub, dedi:

– A bala, köynəyini soyun, mənə ver.

İbrahim köynəyini soyunub, sallaqbaşıya verdi. Sallaqbaşı İbrahimi buraxıb, dedi:

– Qaç, gözə görünmə.

İbrahim qaçmaqda olsun. Lənətlik Şəmil Cuhud bir kisə daşı-torpağı yığıb, bir «ismi-əzəm» oxuyub, qızıla çevirdi. Gətirib, sallaqbaşıya verib, dedi:

– Ayə, sallaq qardaş, öldürdünmü?

Sallaqbaşı dedi:

– Bəli, öldürdüm. Meyidini də elə yerə saldım ki, yüz il də axtarsalar, tapılan deyil.

İbrahim sallaqxanadan çıxıb, qaçırdı. Bir də Şəhrəbanı baxdı ki, budur, İbrahim qaça-qaça onun imarətinin qabağından keçir. Onu görən kimi sevincək qışqırdı:

– Ayə, bir ayağını saxla.

İbrahim başını qaldırıb, yuxarı baxdı. Gördü, Şəhrəbanıdır bunu çağıran. Şəhrəbanı tez kəmənd atıb, İbrahimə dedi:

–İbrahim, kəməndi sal belinə.

İbrahim kəməndi belinə saldı. Şəhrəbanı onu çəkib, yanına çıxartdı. İki nakam aşiq sarmaşıq kimi bir-birinə sarıldı. Üz-üzdə, dodaq-dodaqda bir-birindən hal-əhval tutdular. Elə bu vaxt Şəmil Cuhud İbrahimin qanlı köynəyi əlində özünü yetirdi imarətin qabağına. Şəhrəbanını səsləyib, sevinə-sevinə dedi:

– Xanım, kəməndi salla.

Xanım dedi:

– Nəyə, görə?

Şəmil Cuhud köynəyi yuxarı qaldırıb, dedi:

– İbrahimi öldürdüm.

Xanım dedi:

– Sən İbrahimi haradan tapdın ki, öldürəsən? Biz İbrahimi dəryada qoyub, gəlmədikmi?

Şəmil Cuhud dedi:

– Tapdım, dəryadan çıxıb, buraya gəlmişdi. Öldürdüm, bu da onun qanlı köynəyidir.

Xanım İbrahimi göstərib, dedi:

– Bəs bu kimdir, Şəmil?

Şəmil tez başına bir xorum ot götürüb, özünü odladı. Tez onu tutub, apardılar Aslan şahın yanına. Şah soruşdu:

– Özünü niyə odlayırsan?

Şəmil Cuhud dedi:

– Əlimə ədalət keçmir, şah. Ona görə özümü yandırıram.

Şah dedi:

– Niyə, nə olub?

Şəmil Cuhud dedi:

– Bir göyçək arvadım var. Onu bir göyçək oğlan əlimdən alır. Firəngə də getdim, orada da məni axtarıb, tapdı. İndi buraya gəlmişəm, dalımca buraya gəlib, çıxıb. Burada, hələ, mənim ayağım tikdirdiyim imarətə dəyməyib, o oradadır. Ona görə də birdəfəlik özümü odlayıram ki, canım qurtarsın.

Aslan şah dedi:

– Bu saat sən baxarsan, onun külünü göyə sovuracağam.

Əmr elədi ki, topların birini imarətə sarı tuşlayın. Sirri-Sübhan vəzir irəli yeriyib, dedi:

– Şah sağ olsun, sənin adına, şayına sığışmaz ki, oğlana top atasan. Hirsini bas, mən gedim, onları buraya gətirim, danışdıraq. Mətləbdən hali olaq, görək nə işdir?

Onun sözləri Aslan şahın ağlına batdı. Sirri-Sübhan getməzdən əvvəl dedi:

– Mən gələnə kimi bu kişini gözdən qoymayın.

Şəmil Cuhud şaha dedi:

– Danışsa, sən də arvadı ona verəcəksən.

Aslan şah gördü ki, Şəmil Cühüd nala-mıxa döyür. Odur ki, dedi:

– Ağlını o biri xana, şaha vermə, çatan kimi boynunu vurduracağam.

Lənət olmuş dedi:

–Hə, onda oldu.

Sirri-Sübhan imarətin qabağına gəlib, səsləndi:

– Qızım, o oğlanı düşürt. Şah şikayətə baxacaq. Bu Aslan şahdır, çox ədalətlidir.

Şəhrəbanı Sirri-Sübhan vəzirə dedi:

– İbrahimi indicə endirəcəyəm sənin yanına. Amma izn ver, ürəyimdə bir neçə xanə sözüm var, onu sənə çatdırım.

Aldı Şəhrəbanı:

İltimasım budur səndən, Sirri-Sübhan, ey vəzir,
Dadi-fələk əlindən gəldim cana, ey vəzir.
Razı olsan, baş qoyum, həşəmətli rikabına.
İçmişəm camı-cəfadan, yana-yana, ey vəzir.

Mənim yarım sağ-salamat, apar şahın yanına.
İlahidən bir od düşsün, o Yəhudin canına.
And verirəm, ol qəsəmə, Rəsul Əhməd şəninə.
Eylə bu dərdimə çarə, Misir-loğmana, ey vəzir.

O məndən razısa, mən də ondan razıyam.
İbrahimin eşqində, ol ataşın suzuyam.
Adım Şəhrəbanıdır, Süleyman xan qızıyam,
Eylə bu dərdimə çarə, düşmə qana, ey vəzir.

Söz tamama yetdi. Şəhrəbanı xanım İbrahimi kəməndlə yerə saldı. Ağlayıb, vəzirə yalvardı: "O Şəmil Cuhud mənim yarım deyil, xahiş edirəm, onun boynunu vurun".

Sirri-Sübhan vəzir İbrahimi Aslan şahın hüzuruna gətirdi. İmarətə daxil oldular. Aslan şah İbrahimə baxdı, ona qanı yaman qaynadı. Amma tanıya bilmədi. Doğru deyiblər, «ağ gün adamı ağardar, qara gün də qaraldar». Aslan şah dedi:

– Bunu belə öldürmək olmaz. Bütün şəhərə elan verin ki, belə bir ədalətsiz iş olub, onu araşdıracağıq.

Carçıların sözlərini eşidənlərin hamısı Misirin mərkəzinə yığıldılar. Ziyad haramı o vaxtdan qarını yedəyinə alıb, gəzirdi. Gəzə-gəzə gəlib, buraya çıxdı. Halvaçı Musa da gəldi. Gəminin böyüyü də gəldi. Sallaq da burada idi. Vəli çoban da gəldi. Cəlladlar hamısı hazır olub, İbrahimi günahkar kürsüsünə çıxardılar. Camaat dedi:

– Bu işi ədalətlə görmək lazımdır.

Aslan şah Vəli çobana dedi:

– Çöl darvazanı kəs, çöldən gələni içəri burax, içəridən çıxanları çölə buraxma.

Vəli çoban padşah-zad qanmırdı. Adına "şıllar" deyirdi. İbrahimi Aslan şahın yanında görüb, dedi:

– Ayə, sən nə gəzirsən bu şılların yanında? Bəs mən səni sallağın yanında qoymamışammı? Heyvan qırdırmırsanmı?

Aslan şah dedi:

– Hər şey düzələr, qoy soruşaq.

Aslan şah İbrahimə dedi:

– De görüm, bu kişinin arvadını niyə əlindən alırsan?

İbrahim Aslan şahın bu sualından yaman təsirləndi. Aldı, görək, nə dedi, biz də nə eşitdik:

Rey şəhərindən çıxdıq biz iki qardaş,
Dilbilməz əlinə düşdüm, neyləyim,
Hərəmiz götürdük bir qiymətli daş,
Dilbilməz əlinə düşdüm, neyləyim?

Rey şəhərinin adı gələndən sonra da "biz iki qardaş, hərəmiz bir qiymətli daş götürdük" kəlmələrini eşidəndə Aslan şahın ağlı başından çıxdı. Taxtından dığırlanıb, təpəsi üstə yerə gəldi. Vəzir, vəkil yetirib, onu qaldırdılar. Şəmil Cuhud dedi:

– Ayə, bu ağılla o mənə arvad alıb, verməyəcək. Qoy mən çıxım, gedim.

Vəzir dedi:

– Darıxma.

Aslan şah ayıldı. Fərraşlara əmr elədi ki, heç kimi çölə buraxmayın. İbrahim aldı sözün o biri xanəsini:

Dərin-dərin dəryalara mən daldım.
Şirincə canımı odlara saldım.
Yoruldum-yoruldum günbəzdə qaldım,
Dilbilməz əlinə düşdüm, neyləyim?

O zaman ki, Rey şəhərindən gəldim,
Yoruldum-yoruldum günbəzdə qaldım,
Ziyad haramıya mən oğul oldum,
Dilbilməz əlinə düşdüm, neyləyim?

Ziyad haramının adı gələndə Ziyad haramı işi başa düşdü ki, bu İbrahim olacaq. Qarını möhkəm tutdu ki, qaçmasın.

Zalım fələk yada salıb, andırdı,
İtkin qardaş ciyərimi yandırdı.
Beyman qarı gəlib, yaman qandırdı.
Dilbilməz əlinə düşdüm, neyləyim?

Canım qurban sənin kimi Aslana,
Əyri qılınc öz qınında paslana.
Üç ay yollar keçdim ol Dağıstana,
Dilbilməz əlinə düşdüm, neyləyim?

Çərxi-fələk məni salıbdı ləngə,
Qovğalı başımdan gəlmişəm təngə.
Neçə gün də mən yol getdim Firəngə,
Dilbilməz əlinə düşdüm, neyləyim?

Qurban olum Musa kimi ataya,
Çərxi-fələk məni saldı xətaya.
Gəmiçilər qərq eylədi dəryaya,
Dilbilməz əlinə düşdüm, neyləyim?

Aslan şah tab gətirə bilməyib, dedi:

– Camaat o biri otağa keçib, bir az rahatlansın, sonra yenə bu işimizə baxarıq.

Camaat çıxandan sonra Aslan şah qardaşının üstünə atılıb, onu bağrına basdı. Onu təpədən-dırnağa duz kimi yalayıb, dedi:

– Qardaş, qadan alım, məni bağışla. Sən çox əziyyət çəkibsən.

Camaat yenidən otağa dolandan sonra Aslan şah taxta çıxıb, dedi:

– Gəlin, günahkarın işinə baxaq.

Aslan şah üzünü İbrahimə tutub, dedi:

– De, görək, bu kişinin arvadını niyə əlindən alıbsan?
İbrahim aldı, görək, sözün o biri xanəsində nə dedi:

On yeddi gün dərya üzündə qaldım,
O dəryadan dürr götürdüm, dürr aldım.
Ayı bir çəpişə mən çoban oldum,
Dilbilməz əlinə düşdüm, neyləyim?

Bir daş idim, bu diyardan atıldım,
Ayaq yalın at köksünə qatıldım.
Yüz tümənə mən qəssaba satıldım,
Dilbilməz əlinə düşdüm, neyləyim?

Aslan şah dedi:
– Cəllad, kimin adı çəkilirsə, onları bir tərəfə yığ. Qollarını da bağla!
İbrahim dedi:

Əzəl gündən atam-anam xan idi,
Mənə kömək duran ol Sübhan idi.
Öldürmədi qəssab, müsəlman idi,
Dilbilməz əlinə düşdüm, neyləyim?

Qadir Allah mətləbləri bitirdi,
Gözü yaşlı xan qardaşa yetirdi.
Sirri Sübhan İbrahimi gətirdi,
Dilbilməz əlinə düşdüm, neyləyim?

Aslan şah dedi:
– Qarını, Şəmil Cuhudu, gəminin başçısını keçirin o biri

tərəfə.

Çoban qardaş dedi:

– Şah sağ olsun, onları mənə ver, çomağımın gücünü yoxlayım.

Aslan şah dedi:

– Verdim onları sənin ixtiyarına.

Çoban onların hərəsinə tək bircə çomaq vurub, cəhənnəmə vasil elədi. Aslan şah halvaçı Musaya dedi:

– O dükan sənindir.

Üzünü Ziyad haramıya tutub, dedi:

– Bu gündən yaşadığın küçənin ixtiyarı sənindir.

Sonra çobana üz tutdu:

– Nə qədər heyvan otarırsansa, onların hamısını sənə bağışlayıram.

Ciqqasını başından götürüb, Sirri-Sübhanın başına qoyub, dedi:

– Əgər sən olmasaydın, mən öz qardaşımı topla öldürərdim.

Sirri-Sübhan dedi:

– Şah sağ olsun, mənə taxt-tac lazım deyil. Sən öz yerində qal. Sənin vəzirin olmaq mənim üçün böyük şərəfdir.

Aslan şah dedi:

– İbrahimin nişanlısını gətirin.

Gəcavə bəzəyib, Şəhrəbanı xanımı gətirdilər. Toyu başlamaq istəyəndə İbrahim dedi:

– Mənim nişanlım Herat şəhərindədir, bu Şəmilin dolaşıq saldığı toydur. İzn ver, gedim, onu da gətirim. İkisini də bir eləyək.

Aslan şah dedi:

– Yox, səni gözümdən qoymaram. Onu mən özüm gedib, gətirəcəyəm.

Aslan şah gəcavə bəzəyib, Sirri-Sübhan vəziri də yanına

alıb, Herat şəhərinə yola düşdü. Bir xeyli gedəndən sonra gəlib, Herat şəhərinə çatdılar. Hürnisə xanımın imarətinin qabağında gəcavə dayandı. Xanım da gecə vaqiəsində İbrahimin bu gün buraya gələcəyini görmüşdü. Ona görə də səbirsizliklə sevgilisinin yolunu gözləyirdi. Aslan şahı görəndə anşırda bilməyib, elə bildi ki, gələn İbrahimdir. Tez sevinə-sevinə qızları çağırıb, İbrahimin gəldiyini, görək, onlara necə xəbər verdi:

Dünəndən gördüm vəyğamı,
Qızlar, budur, yarım gəldi.
Qurtardım yar hicranından,
Qızlar,budur, yarım gəldi.

Aslan şah baxdı ki, gəlin onu İbrahimə oxşadıb. Hiss elədi ki, özünü istinad verməyin vaxtı çatıb. Aslan şah aldı, görək, özünü Hürnisə xanıma necə tanıtdı:

Qız, məni bədnam eləmə,
Gözəl, yarın mən deyiləm.
Bağrımın başın teyləmə,
Gözəl, yarın mən deyiləm.

Aldı Hürnisə:
Gələndə belə deyirsən,
Qəndi-şəkəri yeyirsən.
Bağrımın başın oyursan,
Qızlar, budur, yarım gəldi.

Aslan baxdı, Hürnisə xanım bunu yenə də İbrahimə oxşadır. Öz-özünə dedi: – Gəl, nişan ver ki, mən sənin qaynınam.

Aldı Aslan şah:
Cəmi igidlər başıyam,
Dərd bilənin sirdaşıyam.
İbrahimin qardaşıyam,
Gözəl, yarın mən deyiləm.

Aldı Hürnisə:
Hürnisəyəm, çaşıb huşum,
Zəhərlə bişibdir aşım.
Həm qayınım, həm qardaşım,
Elə bildim, yarım gəldi.

Aldı Aslan şah:
Aslan şaham, çoxdur gücüm,
Misirdən gəlir xəracım.
Həmi yengəm, həmi bacım,
Gözəl, yarın mən deyiləm.

Söz tamama yetdi. Fətəli xan Aslan xanın gəldiyini eşidib, onun pişvazına çıxdı. Qoyunlar qırıldı, qazanlar asıldı, bir vur-çatlasın başladı ki, gəl görəsən. Böyük şadlıqdan-şadyanalıqdan sonra Aslan şah Fətəli xana dedi:

– Gəcavələri bəzə, yengəmi aparmağa gəlmişəm.

Yenə də böyük bir şadyanalıqdan sonra Hürnisə xanımı gəcavəyə qoyub, yola saldılar. Axır ki, onlar gəlib, Misir şəhərinə çatdılar. Aslan şah əmr elədi ki, yeddi gün, yeddi gecə şəhər əhli kef eləsin, şadyanalıq olsun.

Hər iki gözəlin toyunu eləyib, həsrətliləri bir-birinə qovuşdurdular. Bütün toylarda olduğu kimi, bu toylar da duvaqqapma ilə başa çatdı:

Mən səni görəndən bəri,
Halım pərişandı, Maral.
Açılır qoynun içi,
Baği-gülüstandı, Maral.
Ləblərin şəhdi-şəkər,
Xəstəyə dərmandı, Maral.
Dərd bilməz naqis dedi,
Dərd bilən inandı, Maral.
Bu gözəllik sənə qalmaz,
Bu çərxi-dövrandı, Maral.
Lənət gəlsin keşişə,
Aləmdə bir səs elədi.
Qızı getdi, o vermədi,
Balasıyla bəhs elədi.
İki yarı bir-birindən,
Ayırdı, həvəs elədi.
Çəkdi din təəssübünü,
Kərəmə qisas elədi.
Haqq özü qisas alar,
Bu bəxti-divandı, Maral.

Sən bir tərsa qızısan,
Əydin qəddim, dal elədin.
Yıxdın könlüm evini,
Nə yaman xəyal elədin.
Göyçəli aşıq Musanı,
Dərdindən abdal elədin.
Uçurtdun tifaqını,
Dağıtdın,viran elədin,
Mal demirəm, at demirəm,
Can sənə qurbandı, Maral.

# "YETİM HÜSEYN" DASTANI

## Ustadnamə

Hamı xəlq olunub bir qətrə sudan,
Hər keçən ömürə san demək olmaz.
Qəflətdədir, yatıb, qalxmaz yuxudan,
Nalayiq insana can demək olmaz.

Düz çıxar həmişə mərdin ilqarı,
Müxənnəsin olmaz heç etibarı,
Yığar qaynağına şirəni arı,
Çəkməsə nizama, şan demək olmaz.

Əyrilər nə bilər yolu, ərkanı,
Saxlayar qəlbində şəri, böhtanı.
Bədəsil tanımaz yaxşı-yamanı,
Onun süfrəsinə nan demək olmaz.

Ömür şad keçirsə başın tacıdı,
Taleyin bəd gəldi, baxt qıyqacıdı,
Tənəli söz zəhrimardan acıdı,
Bilməyən nadana qan, demək olmaz.

Növrəs dostdan ayrı candan usanır,
Hərcayi sözlərdən hər vaxt utanır,
Hər gündə cəsədi bir qədər yanır,
Ləhzədə alışıb yan, demək olmaz.

Ustadlar ustadnaməni bir deməz, iki deyər. Biz də deyərik iki olsun, dostlar sevinsin, paxıllar yanıb yaxılsınlar.

Bir ay yarım novbahardan keçəndə,
Könül kəşt eyləyib gəzə dünyada.
Sirrini verməynən düşmənə, dosta,
İnanmaynan hər cür sözə dünyada.

Əcəl kəşt eyləyib göydən enəndə,
Hayıf, cavanları saldı kəməndə.
Hər zaman bunları gözüm görəndə,
Köhnə yaram olur təzə dünyada.

Əzrail bir kəsdi görünməz gözə,
Nə ağıla baxır, nə də ki sözə,
İndi də gözünü zilləyib bizə,
Tutub mən fağırı qəza dünyada.

Gecələr qoynuma girən kimsənə,
Gizlin sirlərimi bilən kimsənə,
Öləcəkdi, kimdi qalan kimsənə,
İstəyir yaşasın yüzə dünyada.

Bir insan ki, haqq dediyin bitirsə,
Hər məclisdən bir mərifət götürsə,
Ata-ana sözün yerinə yetirsə,
O, yəqin ki, çəkməz cəza dünyada.

Loğmandan gec olan, ağıldan qanmaz,
Lobbaz adam mərd qabaqdan dayanmaz.

Adam var ki, dediyindən utanmaz,
Hər yerdə danışar üzə dünyada.

Ələsgərin sözün eşitsin ellər,
Bitsin bənövşələr, açılsın güllər!..
Hər zaman oxuyur şeyda bülbüllər,
O da aşıq olub, yaza dünyada.

Ustadlar ustadnaməni iki deməz, üç deyər. Biz də deyək üç olsun, təmiz könüllər nurlansın, xəbis ürəklər odlansın:

Qanana can qurban etmək layiqdi,
Arifə söyləmək «bəli» yaxşıdı,
Bu dünyada aman qanmaz əlindən,
Dərdindən olmasan halı yaxşıdı.

Barsız baxçalardan, qoxusuz güldən,
Ləyaqətsiz qızdan, arsız oğuldan,
Kərəmsiz ağadan, vəfasız quldan,
Bivec kamallıdan dəli yaxşıdı.

Sardan tərlan olmaz, tülküdən aslan,
Mənasız kəlmədən, gülünc dastandan,
Naşükür adamdan, ilqarsız dostdan,
Faydasız diridən ölü yaxşıdı.

Həsir baha getməz atlas-qumaşdan,
Qızıl, yaqut olmaz cövhərsiz daşdan
Mərifətsiz olan naşükür başdan,
Zibilliyin yığın külü yaxşıdı.

Qurban, sat-sərrafa neçədi bir san,
Çox var dəngədəyməz; etməsə ehsan,
Ədalətsiz divan, insafsız insan,
Hər kəs bu mətləbi bili yaxşıdı.

Hə, mənim əzizlərim, sizə haradan ərz eləyim, kimdən deyim, Xorasan vilayətindən. Bu vilayətdə lap qədim zamanlarda padşahlıq eləyən İbrahimdən. İbrahim padşah çox ədalətli, insaflı, elcanlı, yurdunun, ocağının, Allah bəndəsinin qədrini-qiymətim bilən bir insan idi. Padşahlığı dövründə heç kəsi incitməmiş, nahaq qanlar tökməmiş, bir kəsin halal çörəyinə haram qatmamış, qismətinə bais olmamışdı. Allah Təala da İbrahim padşahın bu hərəkətlərindən razı qalıb qoca vaxtında evləndiyi Ərdəbil padşahının qızından ona bir cüt bir-birindən gözəl ekiz oğlan əta eləmişdi. Oğlanlardan birinin adını Məhəmməd, o birinin adını Mehdixan qoymuşdular.

Padşah bu qismətinə min şükürlər deyib, Allah yolunda acların qarnını doydurdu, kasıb-kusuba əl tutdu, kimsəsizlərə həyan oldu. Hamının hayına, harayına yetişdi. Uşaqlar 7-8 yaşına çatanda elm-savad öyrənmək üçün dayələrə tapşırıldı. Günlər keçdi, aylar dolandı. Uşaqlar bütün elmləri oxuyub sinədəftər elədilər. At çapmağın, qılınc vurmağın, qalxan tutmağın sirlərini öyrəndilər. Uşaqlar böyüyüb həddi-buluğa çatdılar. Ağılda, kamalda, vurub-tutmaqda Məhəmməd Mehdixandan, Mehdixan da Məhəmməddən geri qalan deyildi. Bu iki qardaşa bir baxan deyirdi bir də baxım.

İbrahim padşah baxdı ki, ölüm onu haqlayıb. Ona görə sağ ikən oğlanlarına toy elədi. Məhəmmədə İsfahan, Mehdixana isə Təbriz padşahının qızını alıb qırx gün, qırx gecə elə bir toy vurdurdu ki, rüzgarın gözü belə toy-büsat görməmişdi. Toydan

sonra İbrahim padşah oğlanlarını yanına çağırıb dedi:

– Daha mən dünyadan gethagedəm. Vəsiyyətimə yaxşı-yaxşı qulaq asın. Mən öləndən sonra şahlıq tacımı Məhəmmədin başına qoyarsınız. Mehdixan da onun vəziri olsun. İki qardaş ikiniz də ədalətli və rəhmli olun. Heç vaxt xalqı incitməyin. Onda yerin-göyün sahibi sizin ruzinizi başınızdan tökəcək.

Bunu deyib, İbrahim padşah dünyasını dəyişdi. El tökülüb onu böyük hörmətlə dəfn elədi. Onun vəsiyyət elədiyi kimi şahlıq tacını Məhəmmədin başına qoydular, qardaşı Mehdixanı isə ona vəzir təyin elədilər. Qardaşlar başladılar ölkəni ədalətlə idarə etməyə. Aradan bir neçə il keçdi, Mehdixanın bir oğlu oldu. Uşaq çox gözəl olduğundan adını Yusif qoydular. Vaxt gəlib, vədə çatanda Yusifi dayələrə tapşırdılar. Ancaq Məhəmməd padşahın uşağı olmurdu. O hələ çox cavan olduğundan övladsızlığı özünə böyük dərd hesab etmirdi. Əlini də Haqqın ətəyindən üzmürdü. Qardaşının balasını öz balası kimi sevib əzizləyirdi.

Padşah tez-tez dərviş-libas olub ölkəni dolaşar, xalqın gününü-güzəranını öz gözlərilə görür, ondan razı, narazı olub-olmadıqlarını qulaqlarıyla eşidirdi. O hara üz tuturdu, xoş xəbərlər eşidir, böyük sevinclə sarayına qayıdırdı.

Bir gün Məhəmməd şah qardaşını hüzuruna çağırıb dedi:

– Vəzir, çoxdandır rəiyyətin dolanışığından, gün-güzəranından xəbərimiz yoxdur. Get hazırlıq gör, sabahdan ölkəni səyahətə çıxaq, görək xalq necə dolanır, onların günü-güzəranı necə keçir? Bizdən narazılıq eliyən varmı?

Mehdixan vəzir dedi:

– Qibleyi-aləmin əmrini yerinə yetirmək mənim üçün böyük şərəfdir. İzn ver, gedim yol tədarükü görüm.

Padşah dediklərini deyib, tapşırıqlarını tapşırandan conra vəziri hüzurundan mürəxxəs elədi.

Sabah açıldı, sabahlar üzünüzə xeyirliklə açılsın. Məhəmməd padşahla Mehdixan vəzir dərviş-libas olub yola düzəldilər. Az getdilər, uz getdilər, dərələr aşdılar, dağlar keçdilər, bir xeyli at sürəndən sonra gün bathabatda gəlib, bir uca dağın ətəyinə çatdılar. Bir az burada oturub dincələndən sonra baxıb gördülər ki, artıq qaranlıq qarışıb, göz-gözü görmür. Çox düşünüb-daşındılar ki, gecəni harada keçirsinlər. Qorxdular ki, bu çöllü bərri-biyabanda galsalar, qurda-quşa yem ola bilərlər. Getsinlər, hara getsinlər? Bu fikir, xəyalla öz aralarında xeyli dərs-gors öllədilər. Zil qaranlıq olsa da məcbur oldular ki, atları bir az da qabağa sürsünlər. Elə bu vaxt haradansa uzaqlardan bir işıq gördülər. Padşah sevincək vəzirinə üz tütüb dedi:

– Vəzir, deyəsən, Allahın bizə yazığı gəldi. Qurd-quşa yem olmadıq. Odur, işıq görünür. Qaranlıqdan, çətin də olsa, gedək işıq gələn tərəfə. Yəqin ki, orada bəni-insan yaşayır.

Vəzir inamla dedi:

– Elədir, qibleyi-aləm. İşığı ancaq insanlar yandırırlar. Gedək.

Padşah da, vəzir də gecənin zil qaranlığında dəvdənə-dəvdənə bir təhər gəlib, bir dağın ətəyindəki elat yatağına çıxdılar. Bunların atlarının ayaq səsini eşidən çoban itləri harhaharla hürüşməyə başladılar. Onların qarışıq səsləri bütün dağı, dərəni başına götürmüşdü. Bu səs-küyə yaxınlıqdakı sürünün çobanı hay verdi. O, hürüşən itlərin üstünə acıqlanıb, onları susdurdu. Sonra üzünü qaraltılara tutub dedi:

– Ey! Deyin, görüm, siz kimsiniz, gecənin bu vaxtı buralarda neyləyirsiniz? Haradan gəlib, haraya gedirsiniz? Məqsədiniz nədir? Yoxsa əyri-oğru, quldur-qaçaqsınız?

Padşah dedi:

– Çoban qardaş, qorxma, yol adamlarıyıq. Həm də dərviş

babalarıq. Yolumuzu azıb, gəlib buralara çıxmışıq. Əgər imkanınız varsa, bizi bir gecəliyə qonaq eləyin.

Çoban Allah adamıydı. Odur ki, dedi:

– O nə sözdür, dərviş baba. Qonaq Allah qonağıdır. Allaha da qurban olum, onun qonağına da. Belə xoş gəlib, səfa gətiribsiniz. Buyurun, atı alaçığın qapısına sürün, qonaq olun.

Çobanın bu təklifini eşidən kimi padşahla vəzir atlarını alaçığın qabağına sürdülər, atdan düşdülər. Çoban onlara ”xoş gəldin” elədi. Atlarını çidarlayıb yaxınlıqdakı otlağa buraxdı. Özlərini də böyük hörmət-izzətlə çadıra apardı. Qonaqlara yer göstərib rahatladı. Özü isə gedib, sürüdən bir ətli-yağlı öyəc gətirib kəsdi. Soyub, doğrayub qazana doldurdu. Ocaq qalayıb üstünə asdı. Ət pörtləyən kimi qablara çəkib, qonaqların qabağına qoyub dedi:

– Yeyin, baba dərvişlər, utanmayın. Elə bilin öz evinizdir.

Qonaqlar yemək yeyəndə çoban onlara diqqətlə fikir verirdi. Çoban olanda nə olar? Gördü ki, qonaqlar çox layiqli, ağayana adamlardırlar.

Xülasə, üçü də yeyib-içəndən sonra çoban süfrəni yığışdırdı, alaçığın üst tərəfindən qonaqlara rahat yer düzəltdi. Qonaqlar da yatıb, rahatlandılar.

Sabah açıldı. Yatanlar qalxdı. Əl-üzlərini dağların buz kimi sularında yudular. Sonra çoban qonaqları doyunca yedirdib, onlara yol tədarükü gördü. Getmək vaxtı çatanda padşah çobanı yanına çağırıb dedi:

– Çoban qardaş, sən bizə görünməmiş yaxşılıqlar elədin. Onun əvəzində al bu bir parça kağızı özündə saxla. Bəlkə, bir gün gərəyin olar. Yolun biz tərəflərə düşsə, yaxşılığının əvəzini çıxarıq. Biz Xorasan əhliyik. O kağızla bizi axtarıb, tapa bilərsən.

Çoban dedi:

– Dərviş baba, mən bir çoban babayam. Xorasan hara, mən hara? Mənimki, il-müdam elə bu dağlar, daşlardır. Mənə heç bir kağız-filan lazım deyil. Siz ki, mənim qonağım oldunuz, bunun özü mənə böyük hörmətdir. Allah işinizi avand eləsin, sizə yaxşı yol.

Padşah gördü ki, doğrudan da, çoban olanda nə olar, kişinin oğlunun qanacağı, mərifəti varıymış. Odur ki, əl çəkməyib dedi:

– Yox, çoban, az qala xətrimə dəyirsən. Bu heç olmadı. Görürəm layiqli adamsan. Kişi kişinin verdiyini geri qaytarmaz. Bu parça kağız sənə ağırlıq eləmir ki, al yanında saxla. Bəlkə, bir gün mən də sənə gərək olaram. Çoban padşahı diqqətlə dinləyib, dedi:

– O ki, deyirsən saxlayım, nə olar, alıb saxlayıram. Amma yaxşı bilin ki, mənə heç kəsin heç nəyi gərək deyil. Sizin can sağlığınız mənə bəsdir.

Bunu deyib, çoban padşahın ona verdiyi kağızı alıb, cibindəki dəsmalı çıxartdı və ona büküb, alaçığın başındakı dirəklə çadırın arasına dürtüşdürdü. Onlar sağollaşıb ayrıldılar.

Padşahla vəzir yenə xeyli at sürdülər. Gün təzəcə çeştə qalxmışdı ki, qabaqlarındakı dərədən onların qənşərinə bir ana ceyran çıxdı. Bunu görən padşah vəzirinə dedi:

– Vəzir, bu ceyran mənim çox xoşuma gəldi. Ona yaman quşum qondu. Öldürməyə də heyfim gəlir. Gərək onu diri tutam.

Padşah bunu deyib, atını ceyrana tərəf sürdü. Bunu görən ceyran geriyə götürüldü, nə götürüldü. At ceyranın dalından çatamı bilərdi?!

Bundan qeyzlənən padşah Mehdixan dedi:

– Vəzir, mən Xorasan kimi bir ölkənin padşahı olam, bir ceyranı diri tuta bilməyəm. Mən bunu öz namusuma sığışdıra

bilmərəm. Mən getdim ceyranın dalınca, sən də qayıt Xorasana. Ölkəyə mən gələnəcən padşahlıq elə. Bəlkə, mən bir az gec gəldim.

Padşah vəzirin cavabını gözləməmiş atına bir qamçı çəkdi. At ildırım kimi yerindən götürüldü, nə götürüldü. Padşah atının ağzını saldı ceyran qaçan tərəfə. Ceyran qaçdı, Məhəmməd padşah qovdu. Ceyran getdi, padşah getdi. Nəhayət, sürhasür, qaçhaqaç, axır ki, padşah ceyranı gözdən itirdi. Ora-bura baxıb gördü ki, ey dili-qafil, ceyran hardadı? Ceyran, elə bil, bir tikə əppək olub, göyə çəkilmişdi. Qərəz, padşah o yana, bu yana çox vurnuxdu, ceyranı görə bilmədi. Ceyran kolluqların arasından qaçıb, çoxdan dağı o biri üzə aşmışdı.

Padşah əl-əldən üzüldüyünü görüb, geriyə qayıtmaq istədi. Bir də başını qaldıranda gördü ki, hər tərəf qaranlıqlaşıb. Artıq şər qarışır. Bir az keçəndən sonra göz-gözü görmədi. Padşah yenə də qaldı pis vəziyyətdə. Bilmədi irəli getsin, yoxsa geri. Geriyə əliboş qayıtmağı heç kişiliyinə sığışdırmadı. İrəliyə hara getsin? Heç yerdə ins-cins görünmürdü. Ceyran da ki, əldən çıxmışdı. Bu fikir- xəyalda ikən, bir də gördü ki, lap uzaqdan bir işıq görünür. Buna çox sevindi. Yenə də atını sürüb, çətin də olsa işıq gələn yerə gəlib çatdı. Gördü ki, bura evdir. Özü də xeyli aralıda, ayrı evlər də var. Başa düşdü ki, bura obadır. Bu ev də obanın qurtaracağıdır. İşıq da pəncərədən düşürdü. Qaranlıqda pəncərədən baxıb gördü ki, içəridə bir kişi, bir də bir arvad var. Onlar öz aralarında şirin-şirin söhbət edirlər. Gecə yarıya keçsə də hələ yatmayıblar.

Padşah yavaşcadan qapını taqqıldadıb dedi:

– Ay ev yiyəsi...

Bu səsə evin kişisi əlində lopa eşiyə çıxdı. Gördü ki, qapıda dərvişlibas bir kişi xeylağı dayanıb. Padşah kişini görən kimi

ədəblə salam verib dedi:

– Atayi-mehriban, mən dərviş babayam, bir gecəliyə qonaq eləyərsinizmi?

Qoca gördü ki, dərviş çox şəxsiyyətli adamdır, dedi:

– A bala, o nə sözdü deyirsən?! Qonaq Allah qonağıdır. Atdan düş, evə buyur.

Bunu eşidən kimi padşah atdan düşüb, kişiyə ədəb-ərkanla salam verib təmənləşdi. Kişi də ona ”xoş gəldin” elədi. Sonra da atını qapıdakı kərənə bağlayıb, içəri keçdi. Arvad da qonağa ”xoş gəldin” elədi. Ər-arvad, ikisi də Allaha da, qonağa da şükürlər oxudular ki, nə yaxşı onların evinə qonaq gəlib. Kişi tez gedib pəyədən bir erkəc gətirib kəsdi. Soydu, doğradı, verdi arvadına ki, ocaq çatıb bişirsin. Özü də gəldi padşahın yanında oturub ordan-burdan, olub-keçəndən söhbətə başladılar. Ancaq heç soruşmadı ki, ay dərviş, sən nəçisən, nə karəsən, haradan gəlib, hara gedirsən? Heç padşah da bunların kim olduğunu öyrənməyə can atmadı. Çünki ceyranı qovanda o qədər yorulmuşdu ki, danışmağa heyi qalmamışdı. Həm də ki, ac idi.

Padşah bir az dincələndən sonra halı yavaş-yavaş özünə qayıtmağa başladı. Göz gəzdirib gördü ki, evin üst başında bir gərdək asılıb. Elə bil, gərdəyin dalında adam var. Çünki arabir qulağına xışıltı gəlirdi. Bu gərdək padşahı çox maraqlandırdı. Dedi, yəqin, təzə evlənənlər var. Öz-özünə dedi ki, necə olur-olsun gərək bunu öyrənim. Məcbur olub, üzünü qocaya tutub sözünə belə başladı:

– Atayi-mehriban, sənin ismin nədir?

Qoca dedi:

– İsmim İsmayıldır, oğul. Əgər bilmək istəyirsənsə, arvadımın adı da Nabatdır.

Padşah dedi:

– İsmayıl əmi, bəs oğul, uşaqdan nəyiniz var?

Qoca nigaran-nigaran dedi:

– Var, ay oğul. Cəmi-cümlətanı bir qızım var, adı da Gülxardır.

Padşah dedi:

– İsmayıl əmi, bəs, o gərdək kimindir?

Qoca dedi:

– Oğul, o gərdək həmən qızımındır.

Padşah dedi:

– İsmayıl əmi, qıza da evdən gərdək asarlarmı? Görmüşük ki, gərdək oğul evindən asılar.

Qoca dedi:

– Orası elədir, oğul. Ancaq iş elə gətirib ki, biz qızımıza gərdək asmışıq.

Padşah dedi:

– Qızın ərə gedibmi?

– Yox, oğul. Qızımı hələ köçürməmişəm.

Padşah maraqla soruşdu:

– Atayi-mehriban, bəs, onda gərdək nəyə lazımdır?

Qoca dedi:

– Oğul, mənim qızım o qədər çirkindir ki, onu adam üzünə çıxmağa qoymuruq. Ona görə onu həmişə gərdəyin dalında saxlayırıq.

Bunu eşidən padşahı dərd götürdü. Yenidən soruşdu:

– Atayi-mehriban, axı qızının eybi harasındadır?

Qoca dedi:

– A bala, eybi olmamış daha harası qalıb?!. Gözü çaş, qolu çolaq, ağzı əyri, burnu iri, qıçı topal, üzü çil-çil, danışığı kəköy. Hə, qonaq qardaş, məndən hər şeyi soruşdun. Heç özün demirsən ki, adın nədir, kimsən, nəçisən, buraya nə məqsədlə gəlib

çıxıbsan?

Padşah qocadan bunu eşidəndə xeyli fikrə getdi. Öz-özünə dedi ki, padşah olduğunu demə, qalanı nə varsa düzünü söylə. Dedi:

– İsmayıl əmi, mənim adım Məhəmmədir. Özü də yaxşı nəsildənəm. Yerim-yurdum da Xorasandır. Qardaşımla ova çıxmışdım. Axşam üstü qabağımıza bir ceyran çıxdı. Mən ceyranı diri tutmaq istədim. Qova-qova gətirib, sizin bu yerlərdə itirdim. Gecə düşdü.

Bu vaxt Nabat arvad süfrə açdı. Ortalığa Allah verən nazu-nemətlərdən düzdü. Elə ki, yemək vaxtı çatdı, padşah dedi:

– Mən heç nə yeyən deyiləm.

Bu dəfə arvad dilləndi:

– Niyə? Başıma xeyir, ay bala. Bismillah elə, çörəyini ye.

Padşah dedi:

– Mənim şərtim var.

Nabat arvad dedi:

– A bala, o nə şərtdir?

Padşah dedi:

– Nabat xala, hamını Allah yaradıb. Şikəst olanda nə olar? Neçə ki, gərdəyin dalındakı qızınız gəlib süfrənin qırağında əyləşməyib, mən əlimi çörəyə uzadan deyiləm.

Söhbətin hamısını qız eşidirdi. Qulaq asdıqca hiss eləyirdi ki, o çox ağıllı, kamallı, ağayana bir oğlandır. Ürəyində dedi ki, ay Allah, nə ola, subay olaydı. Məni buna qismət eləyəydin.

Ər-arvad baxdılar ki, qonaq sözündən dönənə oxşamır. Ona görə də, məcbur olub gərdəyi qaldırdılar. Padşah gərdəyin dalındakı qızı görən kimi ağlı başından çıxdı. Gördü ki, ayə, nə çolaq, nə şikəst, elə bil, gərdəyin dalında Ay parçası oturub. Bunun gözəllikdə misli-bərabəri yoxdur. Gün kimi hər tərəfə şölə

saçır. Padşah bir könüldən, min könülə Gülxara vuruldu. Az qaldı ki, özündən gedib, yerə yıxılsın. Özünü bir təhər ələ aldı. Ər-arvad dedilər:

– A bala, bu da gərdəyin dalındakı qız. Gördünmü? Di, bismillah elə, başla çörəyini yeməyə.

Bayaqkı qonaq hara, indiki hara. Öz-özünə dedi, ayə, öldü var, döndü yoxdur. Nəyin bahasına olursa-olsun, gərək onunla evlənəm. Üzünü ev sahibinə tutub dedi:

– Məni niyə aldadırsınız? Nə çolaq, nə şikəst. Bu ki, dünya gözəlidir. Neçə ki, Gülxarı mənə verməyibsiniz, çörəyinizə əl uzadan deyiləm.

İsmayıl kişi də, Nabat arvad da halal adamlar idilər. Gördülər ki, qonaq əl çəkəsi deyil. Özü də pis oğlana oxşamır. Arabir qızlarının üzünə baxdılar. Gördülər ki, deyəsən o da razılığa qılımlandı. Çox çək-çevirdən sonra məcbur olub Gülxarı Məhəmmədə verməyə razılaşdılar. Bunu eşidəndə, elə bil, bütün dünyanı Məhəmmədə bağışladılar. Əlini atıb divardan İsmayıl kişinin sazını endirib, sinəsinə basdı, aldı görək nə dedi:

Bir gözəldi şövqün salıb cahana,
Tifilkən bənzətdim gözəl, göz ala.
Aşıq, deyə cahana,
Canım qurban canana,
Xudanın xub bəndəsi,
Xub gəlibdi cahana,
Yaradan yaradıb, salıb cahana,
Gör necə yaranıb gözəl, göz ala.
Bağbansan gir bağa, bağ işini gör.
Bağ becər, bağ bəslə, bağ işini gör.
Aşıq, bağ işini gör,

Becər bağ işini gör,
Ovçusansa, diksin qalx,
Ovun baxışını gör.
Dostsansa dostunun göz yaşını gör,
İstəyir canıma, gözəl, göz ala.

Məhəmmədəm, sözüm deyim sənə, yar,
Tuti dilli, sərvi boylu, sənə yar,
Aşıq deyər sənə, yar,
Olum bağban sənə, yar,
Qış otaqda, yaz bağda,
Mehman olum sənə, yar.
Dolandım dünyanı neçə sənə, yar,
Görmədim sənintək, gözəl, göz ala.

Məhəmməd sözünü qurtarıb, ayağa qalxdı. Dərviş paltarını çıxartdı. Gördülər ki, ayə, bu doğrudan da lap canlara dəyən oğlandır. Boy-buxunu, tərpənişi de, elə bil, şah oğlu şahdır. Axı, o yazıqlar haradan biləydilər ki, doğrudan da Məhəmməd şah oğlu şahdır. Özü də Xorasan kimi bir vilayətin hökmdarıdır. Xülasə, xeyli çək-çevirdən sonra padşah qızın ”hə”sini aldı. Sonra hamısı əlini birlikdə süfrəyə uzadıb yeməyə başladılar.

Üzünüzə sabahlar xeyirliklə açılsın. Məhəmməd sabah qalxıb bir molla çağırtdırdı. Gülxarın kəbinini özünə kəsdirdi. Gərdəyi də bu evdən çıxardıb, o biri evdə asdılar. O gündən başladılar ər-arvad olub yaşamağa.

Məhəmməd burda kef-damaqda olsun, görək vəzir qardaşı Mehdixan necə oldu.

Elə ki, padşah ceyranın dalınca düşdü. Mehdixan da qardaşının tapşırdığı kimi, atının yüyənini geriyə döndərib, başladı

Xorasana getməyə. Axır ki, gəlib Xorasana çatdı. Padşah qayıdıb gələnə kimi ölkəni ədalətlə idarə elədi. Ancaq qardaşının başına nələr gəldiyindən xəbərsiz olduğundan bərk narahat idi. Hamının gözləri yolda idi ki, Məhəmməd şah nə vaxt qayıdıb gələcək. Bunlar burada ümüdləri Allaha, yol gözləməkdə idilər. Məhəmməd də uzaq bir məkanda Gülxar xanımla eyş-işrət sürməkdə.

Padşah bir neçə ay İsmayıl kişinin evində qaldıqdan sonra bir gecə ağlına yerləşdi ki, ey dili-qafil, o boyda taxt-tacı buraxıb düşmüşəm çöllərə. Nədi-nədi, bir gözəlin dərdindən tərki-vətən olmuşam. Axı, mən bir gözəlin əri yox, böyük bir ölkənin hökmdarıyam. Bir hökmdarlığı bir arvadın gözəlliyinə satmaq nankorluqdur. El məni qınayar, daş-qalaq eləyər, nəslimin adını batıraram.

Padşah xeyli fikirləşib, ayağa qalxdı. Öz məqsədini qaynatasına, qaynanasına və arvadına bildirib dedi:

– Xeyli vaxtdır sizin yanınızdayam. Nə vaxtdır elimdən, günümdən ayrı düşmüşəm. Vətən üçün darıxmışam. Mən getməliyəm, razısınızsa, qoyun Gülxarı da aparım.

Məhəmmədin bu təklifinə onlar heç cür razı olmadılar. Axırda belə qərara gəldilər ki, Məhəmməd tək çıxıb getsin.

Getmək məqamı çatanda Məhəmməd qolundakı bazubəndini açıb, belindəki xəncərini çıxardıb Gülxara verərək dedi:

– Mənim əzizim, incimə, qismət beləymiş. Neçə aydır səninlə bir yerdə baş yastığa qoymuşam. Ətrindən doymamışam. Neyləyim. Vətən, el-oba həsrəti məni məcbur eləyir ki, ayrılaq. Mən gedirəm. Məndən sonra oğlum olsa bu xəncəri ona verərsən, qızım olsa bazubəndi. Qoy axtarıb məni tapsınlar. Mənim nişangahlarım onları hər cür bəladan xilas edəcək.

O, bunu deyib qaynatası, qaynanası və arvad ilə görüşüb,

halal-hümmət eləyib, Xorasana tərəf yol başlayanda, dözə bilməyib, geri döndü. Baxanda gördü ki, vallah, Gülxar elə dolub, elə dolub ki, elə bil, bahar bulududur. Elə bir himə bənddir ki, göz yaşını leysan kimi töksün. Məhəmməd də ürəkdən kövrəlmişdi. Padşah olanda, nə olardı? Bilmirdi neyləsin, qalmışdı iki suyun arasında. Arvadına baxıb, kövrəlmiş halda dedi:

– Gülxar, istəyirsən gəl səni də aparım.

Gülxar qəhərdən dolan ala gözlərini ağlamaqdan güclə saxlayıb, dedi:

– Onsuz da ömrümün sonuna kimi mənim sənin kimi istəklim olmayacaq. Ancaq ürəyimdə sənə deyiləsi bir neçə xanə sözüm var. Qoy onları deyim, sən eşit, mənim də dolmuş sinəm bir az boşalıb, yüngülləşsin.

Bunu deyib, Gülxar yasəmən tellərindən bir dəstə ayırıb, sinəsinin üstünə töküb yanıqlı-yanıqlı aldı görək nə dedi. Biz deyək, siz də şad olun:

Gülxar:
İgidlər igidi, igidlər xası,
Məni zülümlərə salıb gedirsən.
Geyinnəm əynimə qəmdən libası;
Məni zülümlərə salıb gedirsən.

Məhəmməd:
Ay nazənin, əlim səndən üzüldü,
Gahdan ağla, gahdan yada sal məni.
Qara bağrım şan-şan oldu, əzildi,
Gahdan ağla, gahdan yada sal məni.

Gülxar:
Atamın evini yıxa bilmərəm,
Anamın üzünə baxa bilmərəm,
Tay-tuş arasına çıxa bilmərəm,
Məni zülümlərə salıb gedirsən.

Məhəmməd:
Bağbanıydım, bağım tağayır oldu,
Dərdi xoyrat əli, tağayır oldu,
Gözüm gördü, кönlüm tağayır oldu,
Gahdan ağla, gahdan yada sal məni.

Gülxar:
Mən Gülxaram, qara gəlib baxtım da,
Görüm, atam viran qalsın taxtında,
Hardan urcah oldun nakam vaxtımda,
Məni zülümlərə salıb gedirsən.

Məhəmməd:
Mən sənə can dedim, sən də mənə can,
Alış mənim kimi, eşq oduna yan.
Dərviş Məhəmmədəm yerim Xorasan,
Gahdan ağla, gahdan yada sal məni.

Ayrılarkən Məhəmməd yenə də dedi ki, Gülxar, bir vaxt gəlib səni aparacağam, nigaran qalma. Amma gördü ki, Gülxar üzünü çevirib, ağlamağa başladı. Məhəmmədə çox ağır olsa da, atını Xorasan səmtinə qamçıladı.

Anası Nabat gördü ki, Gülxarın halı heç özündə deyil. Gözlərinin yaşı da leysan kimi yanaqlarından bir ucdan süzülüb gedir.

Gülxara təskinlik vermək üçün dedi:

– Qızım, nə olub, niyə belə qan-yaş tökürsən? Bir iş idi, oldu. Bəlkə, Məhəmməd bir vaxt qayıdıb gələcək. Adam əlini Allahın ətəyindən üzməz. Özünü ələ al, toxta. Yekə qızsan.

Gülxar anasının bu məsləhətinə cavab vermək üçün qulac saçlarını sinəsinə saz eləyib, yanıqlı-yanıqlı oxumağa başladı:

Əlim yarımdan üzüldü,
Mən ağlaram, qan ağlaram.
Göz yaşım üzə süzüldü,
Mən ağlaram, qan ağlaram.

Nabat arvad dedi:

– Qızım, tək atın nə meydanı olar? Ananı sən balaca ana bilmə. Birini sən dedin, mən eşitdim. İndi də, qoy birini mən deyim, sən eşit. Aldı görək, anası nə dedi, biz nə eşitdik. Eşidənlər də şad olsunlar:

Atan sənə zülm elədi,
Ağlama, qızım, ağlama.
Bağrımın başın teylədi,
Ağlama, qızım, ağlama.

Arvadı bunu deyib, başladı ərinə qarğamağa ki, kişi idi, nə olmuşdu, tez-tələsik yazıq qızın ”hə”sini bir su içimində verib, evimizi yıxdı, qızımızı bədbəxt elədi. İndi əl heç yerə çatası deyil. Əlacı kəsildi, yenə də qızını dilə tutmağa başladı:

– A bala, nə olar, yüzü olub, biri də sən. Bir də ay bala, ərin ayrılanda sənə nə dedi, sənə bir nişanə-zad qoydumu? Yoxsa, elə-belə kirimişcə çıxıb getdi?

Gülxar anasını dinləyəndən sonra belə cavab verdi:

Mən ağlaram yana-yana,
Yandı bağrım, döndü qana,
Bir bazubənd verdi mənə,
Mən ağlaram, qan ağlaram.

Bunu eşidən Nabat arvad görək qızına nə dedi:

Darayıb zülfün hörəyim,
Boya sadağa verəyim,
Gətir bazubəndi görəyim,
Ağlama, qızım, ağlama.

Gülxar gördü ki, anası bazubəndə baxmaq istəyir. Öz-özünə fikirləşdi ki, birdən bazubəndi anama göstərərəm, onun da tamahı güc gətirər, dartıb əlimdən alar, it-bata salar, qalaram belə. Onda uşağım olsa atasından ona verməyə nişangahım olmaz. Yaxşısı budur ki, gəl bazubəndi dan, de ki, yalan deyirdim, hələ yaxşı ki, xəncər barədə ağzımdan söz qaçırmamışam. Ona görə sözünün tapşırmasında görək bazubəndi anasından necə dandı:

Bil, Gülxardı mənim adım,
Aləmi yandırar odum,
Bir söz idi, yalan dedim,
Mən ağlaram, qan ağlaram.

Nabat arvad qızının cavabına o qədər inanmasa da, onun qəlbini sındırmamaq üçün saçını sığalladı, başını döşünə sıxdı, öpdü, oxşadı, ona yenə də bol-bol təsəlli verib, ağlaya-ağlaya sözünün tapşırmasında aldı görək nə dedi:

Bu dünya fanidən-fani,
Bir gün demə Nabat hanı?!
Oda salıb fələk səni,
Ağlama, qızım, ağlama.

Məhəmməd gedən gündən Gülxarın günü ah-vayla keçdi. Nə dərdi-səri azaldı, nə də göz yaşları qurudu. Gözləri Məhəmməd gedən yollardan çəkilmədi. Qulaqları səsdəydi ki, görən Məhəmməd nə vaxt qayıdacaq, ondan soraq verən olacaqmı?

Yaşadıqları bir neçə ayın müddətində Gülxar Məhəmməddən uşağa qalmışdı. Günlər ötüşdü. Doqquz ayın tamamında Gülxar bari-hamiləni yerə qoydu. Onun bir cüt Ay parçası kimi ekiz uşağı oldu. Uşaqlardan biri oğlan, o birisi qız idi. Qız gözəllikdə, elə bil, Züleyxayla ekiz bacı idi. Ona görə də onun adını Züleyxa qoydular. Oğlanın da adını Hüseyn qoydular. ’’Adları ilə böyüsün!” – deyib, xeyir-dua verdilər. Uşaqlar olandan sonra Gülxarın göz yaşları qurumuşdu. Ata-anası da buna çox sevinirdi. İndi onların Ay parçası kimi bir cüt şirin-şəkər nəvələri var idi, elə bil, bütün dərdi, qəmi bu uşaqlar birdəfəlik qovmuşdular.

Dastan dili yüyrək olar. Uşaqlar hər gün bir arpa, bir buğda boyu böyüyüb, yeddi yaşına çatdılar. Anası aparıb uşaqların ikisini də molla yanında qoydu ki, dərs alıb, elmə sahib olsunlar. Uşaqlar elə ağıllı, elə dərrakəli idilər ki, mollanın ağzından nə çıxardı, qır-saqqız olub başlarında qalırdı. Onlar on dörd yaşına çatanda bütün elmləri sinədəftər eləyib, mollaxanadan ayrıldılar. O gündən Züleyxa evdən bayıra çıxmadı. Çünki elə gözəl idi ki, elə bil, lap adı dillərdə söylənən Züleyxanın özü idi. Qorxdular ki, qızı qaçırıb eləyən olar. Ancaq Hüseyn boş durmadı, indi də cəng oyunları ilə başını qatırdı. Dəlisov atlara kəmənd atıb, çılpaq, yəhərsiz minməkdə ad qazandı, qılınc vurmağı, qalxan

tutmağı hamını heyran qoymuşdu. Necə deyərlər, odun-qurdun parası idi. Bir dəqiqə bir yerdə durmazdı. Hara gedirdi, orada dava salırdı. Ancaq tutduğu tay-tuşlarını döyüb, sitardan salardı. Uşaqlar ondan, it ağacdan qorxan kimi, qorxardılar.

Hüseyn yaşadığı obada tay-tuşlarından bir neçəsinin də adı Hüseyn idi. Onları da bir-birindən fərqləndirmək üçün öz aralarında ayama qoymuşdular. Məsələn, birinə "Çolaq Hüseyn", o birinə "Dana Hüseyn", buna da "Yetim Hüseyn" deyirdilər. Ancaq Hüseynin bu ayamadan xəbəri yox idi. Onu deyən uşağın dədəsini yandırardı. Ona görə buna Yetim Hüseyn deyirdilər ki, atası yox idi, onun haradan olduğunu da heç kim bilmirdi.

Bir dəfə uşaqlar cız çəkib, aşıq-aşıq oynayırdılar. Elə oyunun şirin yerində oğlanlardan kimsə dedi ki, ayə aşıqları yığışdırın, Yetim Hüseyn gəlir. Bilirdilər ki, Hüseyn davakünün biridir. Sorğusuz-sualsız onların aşıqlarını əllərindən alıb ya cibinə dolduracaq, ya da hara gəldi tullayacaq. Necə deyərlər, yetənə yetir, yetməyənə də bir daş atırdı.

Hüseyn uzaqdan gördü ki, onun gəldiyini görüb, aşıqları yığışdırdılar. Dana Hüseyn deyilən uşaq da aşıqların hamısını cibinə doldurdu. İndi də aradan çıxıb, əkilmək istəyir. Bunu görən Hüseyn tez dedi:

– Ayə, dana bir bəri qayıt!

Dana Hüseynin ağzı nəydi qayıtmasın. Hüseynin qabağında dayanıb, başını aşağı salıb, lal-dinməz durdu.

Hüseyn acıqlı-acıqlı dedi:

– Aşıqların hamısını tez ciblərindən çıxardıb tök yerə!

Yenə də daşdan səs çıxdı, Dana Hüseyndən yox. Heç o biri uşaqlar da qorxularından dinmədilər. Oğlanın aşıqları çıxartmadığını görən Hüseyn hirsli-hirsli gədəyə bir bərk şillə tutuzdurub dedi:

– Hələ bu dananın məndən aşıq gizlətməyinə bax!

Şillənin açılması ilə Dana Hüseynin eşşək kimi anqırmağı bir oldu. Onun əlindən güclə qopub, evlərinə tərəf götürüldü. Qaça-qaça bağırıb dedi:

– Yetim oğlu, yetim, məni niyə vurursan? Dədənə aşıq borcluyam, dədəsindən xəbərsiz, köpəkoğlu. Bir yavaş, gedib dədəmə deyim, gör sənin başına nə oyun açır.

Bunları eşidən Hüseyn dəli olmadımı!? Mindi cin atına. Düşdü Dana Hüseynin dalınca. Bu vaxt Dana Hüseynin atası gördü ki, oğlu qan-tərin içində evlərinə tərəf qaçır, Yetim Hüseyn də onun dalınca düşüb. Ha burada, ha orda, az qalıb ki, uşağa çatıb parçalasın. Yaxşı bilirdi ki, uşağı yetim Hüseynin əlinə keçsə, daha ondan uşaq olmayacaq.

Dədəsi oğlunun qabağına getdi. Dana Hüseyn atasının dalında gizlənib, hönkürə-hönkürə dedi:

– Ay dədə, bu yetim oğlu, yetim, həm aşıqlarımızı alır, həm də məni döyüb öldürür.

Hirslənmiş kişi tutdu Hüseynin yaxasından, dedi:

– Adə, bu uşağı yiyəsiz görübsən, döyürsən?

Hüseyn acıqlı-acıqlı dedi:

– Görmürsən, hamının içində mənə yetim oğlu, yetim deyir?!.

Kişi dedi:

– Yaxşı, sən yetim deyilsənsə, bəs dədən kimdir? Hə, de görüm. Bu uşağın dədəsi mənəm. Bəs sənin dədən kimdir? Dillənsənə?! Niyə dilin lal oldu? Get, dədəni göndər, mən onunla danışım. Sənə daha sözüm yoxdur.

Bu sözləri eşidəndə, elə bil, Hüseyn yatmışdı, ayıldı. Elə bil, başına bir qazan qaynar su tökdülər. Rəngi allandı. Kişiyə heç bir söz deməyib, kor-peşman geri qayıtdı. Yeriyirdi, amma, elə bil, ayaqları özününkü deyildi. Evə çox pərişan girdi. Bunu görəndə

nənəsi də, babası da, anası da dərin təlaş keçirtdilər. Özlərini yetirdilər Hüseynin yanına. Nə qədər dilə tutdularsa da, Hüseyn dillənmədi ki, dillənmədi. Elə bildilər ki, uşaq azarlayıb. Bərk əl-ayağa düşdülər. Babası, nənəsi loğman, təbib dalınca qaçdı.

Anası göz yaşını sel kimi axıtdı. Handan-hana Hüseyn başını qaldırıb, anasının bulud kimi yağan yaşlı gözlərinə baxdı. Dərdli-dərdli dedi:

– Ana, niyə mənim dədəm yoxdur? Hamı mənə yetim deyir.

Bu sözü eşidəndə Gülxarın ürəyi nanə yarpağı kimi əsdi. Özünü güclə ələ alıb, dedi:

– Oğul, sənin atan var, adı da Məhəmməddir. Yaxşı bir nəsildəndir. Hər gədə-güdənin tayı deyil.

Hüseyn dedi:

– Onda, bəs atam hanı?

Anası dedi:

– Oğul, atan uzaq səfərə gedib, gecikib. Yəqin ki, yaxın vaxtlarda qayıdar.

Hüseyn dedi:

– Yox, ana, mənim onu gözləməyə səbrim yoxdur. Mən bu gündən onu axtarmağa gedəcəyəm.

Anası təlaş içində dedi:

– Ay bala, sən onu necə axtaracaqsan? Axı, sən onu tanımırsan, harada olduğunu bilmirsən.

Hüseyn dedi:

– Ay ana, ola bilməz ki, sən atamın haralı olduğunu bilməyəsən. Mən bunlara inanmıram. Sən südünü mənə halal elə, rüsxət ver, gedim atamı axtarım. Yoxsa, ürəyim partlayar. İndi hamı mənə yetim deyir. Mənim atam ola-ola mənə niyə yetim Hüseyn desinlər!?

Anası dedi:

– Ay bala, sən hələ çox cavansan. Yola-izə də nabələdsən. Gedərsən, başına bir iş-zad gələr, qalaram yaman günə. Gəl, bu daşı ətəyindən tök, insaf elə, bizə yazığın gəlsin. O gözəllikdə bacını da bir elin içində kimsəsiz qoyub gedirsən? Bizim səndən qeyri kimimiz var?

Hüseyn gördü ki, yox anasını dillə yola gətirə bilməyəcək. Ona görə də əlini atıb divardakı sazı endirib, sinəsinin üstünə sıxdı, yanıqlı-yanıqlı aldı görək nə dedi:

Başına döndüyüm gül üzlü ana,
Ana, söylə atam kimdi, gedirəm.
Əmmişəm südünü mən qana-qana,
Ana, söylə atam kimdi, gedirəm.

Anası dedi:

– Ay bala, hansı ciyəri yanmış, səni dəli-divanə eləyib, çöllərə salır. Onun vayına oturum, bu sevdadan əl çək. Sənin atan səfərdən gec-tez gələcək.

Hüseyn gördü ki, anası heç sazla-sözlə də yola gəlmək istəmir. Ona görə də aldı sözün o biri xanəsini, fikirləşdi ki, bəlkə anamın ürəyini yumşaldam, atamın dalınca getməyə mənə rüsxət verə:

Bir gül idim budağımdan dərdilər,
Dərib-dərib pünhan yerə sərdilər.
Aşıq meydanında xəbər verdilər,
Ana, söylə atam kimdi, gedirəm.

Hüseyn gördü ki, anasından yenə bir söz qopara bilmir. Ancaq, deyəsən, anası bir az yumşalıb. Aldı görək Hüseyn sözünün tapşırmasını necə dedi. Biz də deyək, eşidənlər şad olsun:

Hüseynəm dərsimi kamil almışam,
Dədəm var, dədəsiz yetim qalmışam.
Anamı bulunmaz oda salmışam,
Ana, söylə atam kimdi, gedirəm.

– Anası baxıb gördü ki, Hüseyni yolundan saxlamaq mümkün deyil. Əlacı kəsilib dedi:

– Oğul, bil və agah ol, sənin atanın adı Məhəmməddir. Özü də Xorasan vilayətindəndir. Gedəndə də nişangah olaraq mənə yeddi ilin bac-xəracından düzəlmiş bir bazubənd, bir də bir xəncər verib, özü də mənə tapşırıb ki, oğlum olsa xəncəri, qızım olsa, bazubəndi verərsən, axtarıb məni taparlar. İndi ki, əl çəkmirsən, al atan verən xəncəri bağla belinə. Qismət Allahdandır, ümidim var ki, hər şey yaxşı olacaq.

– Yetim Hüseyn anasının xeyir-duasını eşidib, çox sevindi. Atını ifçin yəhərləyib-yüyənlədi. Yol tədarükü görüb, evdən çıxmaq istəyəndə babası ilə nənəsi qayıdıb gəldilər. Gəlib gördülər ki, nəvələri at belində, səfər üstündədir. Məsələdən onları da agah elədilər. Əlacsız qalan nənə də, baba da nəvələrinə xeyir-dua verdilər. Hüseyn atını sürmək istəyəndə, dönüb anasına baxdı. Gördü ki, anası elə bir haldadır, elə bir haldadır ki, gəl görəsən. Ala gözləri bahar buludu kimi dolub. Ürəyi nanə yarpağı kimi əsim-əsim əsir. Deyəsən, dilinə də bir neçə xana söz gəlib. Gülxar elə bu vaxt hörüklərindən bir dəstə tel ayırıb, tökdü mərmər sinəsinin üstünə, aldı görək nə dedi, biz də nə eşitdik:

Başına döndüyüm gül üzlü oğul,
Qürbət eldə gahdan yada sal məni.
Sənə yedirtmişəm qəndinən noğul,
Qürbət eldə gahdan yada sal məni.

Başlayıb ömrümün nə gəlhagəli?
Dərdini çəkməkdən olaram dəli.
Kəmərin qurşasın o ağam Əli,
Qürbət eldə gahdan yada sal məni.

Ərşə çıxır mən Gülxarın nalası,
Viran olsun Lut şəhrinin qalası.
Xorasanda Məhəmmədin balası,
Qürbət eldə gahdan yada sal məni.

– Söz tamama yetdi. Hüseyn yol başladı Xorasan tərəfə. Aşıq dili yüyrək olar, deyiblər. Hüseyn ata süvar olub, az getdi, çox getdi, neçə dərə aşdı, neçə düz keçdi, orada ayla, illə, burada şirin dillə, gəlib bir dağın ətəyinə çatdı. Gördü ki, burada bir dəstə adam var. Atı sürdü düz onların yanına. Adamlar gördülər ki, maşallah, bu elə bir oğlandır ki, heç Yusifi-Kənan da onun əlinə su tökməyə yaramaz. Baxdılar ki, həm çox cavandır, həm də qəribdir. Özü də atının tərkində bir sazı da var. Dedilər, yəqin, haqq aşığıdır, butasının dalınca gedir. Soruşub öyrəndilər ki, oğlan nə aşıqdır, nə də aşiq. Dedilər bəs nəçikarəsən, hardan gəlib, haraya gedənsən? Bunu eşidəndə Hüseynin sinəsinə qeybdən bir neçə xanə söz gəldi. Sazını köynəyindən çıxardıb aldı görək nə dedi:

İraq düşdüm vətənimdən, elimdən,
Baş götürüb Xorasana gedirəm.

Sahibiyəm nə çıxıbsa dilimdən,
Baş götürüb Xorasana gedirəm.

Anam, bacım gözü yaşlı qalıbdır,
Nənəm, babam qəlbinə xal salıbdır,
Yollarımı duman, çiskin alıbdır,
Baş götürüb Xorasana gedirəm.

Hüseyinəm, Məhəmmədin oğluyam,
Bu nə sirdi gərək onu yoxlayam.
Tapam onu, ata kimi qoxlayam,
Baş götürüb Xorasana gedirəm.

Yetim Hüseyn sazla dediyi kimi, sözlə də atasını axtarmağa getdiyini söylədi. Bunu eşidənlərin Hüseynə yazığı gəldi. Xorasanın yolunu ona nişan verdilər. Hüseyn at sürüb, bir neçə mənzildən sonra axır ki, Xorasana çatdı. Cibinə baxıb gördü ki, pulu yoxdur. Heybəsində də çörəyi, yavanlığı qurtarıb. Əlacsız qalıb atını satmağa məcbur oldu. Onsuz da o heç özünə yer tapa bilmirdi. Atı harada saxlayacaqdı? Bu məqsədlə də soruşa-soruşa gedib bazarı tapdı. Atını ucuz qiymətə satıb, özünə bir az yemək alıb, gəldi şəhərin kənarındakı xaraba qalmış evlərdən birinə. Axı, Hüseynin gecələməyə elə bir pulu da yox idi. Atın pulu ilə olsa-olsa az bir vaxtda bir təhər dolana bilərdi. O, axtarıb bir samanlıq tapdı. Başladı orada başını girələməyə.

Hüseyn beləcə hər gün şəhərə çıxır, atın qalan puluna az-dan-çoxdan yemək alıb, gətirib samanlıqda yeyib-yatırdı. Hüseyn samanlıqda pis gündə yaşamaqda olsun, eşit bacısı Züleyxadan. Elə ki, qardaşı Hüseyn evdən çıxdı, anası, nənəsi yalan oldu. Züleyxa Hüseynin dərdindən ağı deyib, ağlamağa

başladı. Gördü ki, ağlamaqla da kar aşmır. Onda belə qərara gəldi ki, oğlan paltarı geyib, qardaşının dalınca getsin. Fikrini anasına dedi. Bunu eşidəndə, elə bil, anası dəli oldu. Nə qədər dil töküb, nə qədər yalvardısa, xeyri olmadı. Əlacsız qalıb, razılıq verdi. Atasından qalan bazubəndi də onun qoluna bağladı. Özü də başa saldı ki, atan Xorasandadır, adı da Məhəmməddir.

Züleyxa tez qardaşı Hüseynin evdə qalan bir dəst köhnə paltarını geyinib, altdan geyinib, üstdən qıfıllandı, üstdən geyinib, altdan qıfıllandı. Atın belinə qalxıb, getmək istəyəndə sinəsinə bir qatar söz gəldi. Aldı görək, anasına öz ürək sözlərini necə izhar elədi:

Xorasana gedən yolum uzaqdı,
Qardaşımın sorağına gedirəm.
Dağlar, düzlər çiskin, soyuq, sazaqdı,
Qardaşımın sorağına gedirəm.

Köhlənimi dağda, düzdə çaparam,
Axır, gedib qardaşımı taparam,
Bir ox kimi öz yayımdan qoparam,
Qardaşımın sorağına gedirəm.

Züleyxayam, Məhəmmədin qızıyam,
Könüllərin çalınmamış sazıyam.
Hər cəfaya, hər zülümə razıyam,
Qardaşımın sorağına gedirəm.

Bunu deyib, atını Xorasana tərəf sürməyə başladı. Az getdi, üz getdi, dərə-təpə düz getdi, neçə-neçə dağları arxada qoydu, nəhayət, bir gün gəlib bir dağın ətəyində cavanlara rast gəldi. Elə

ki, Züleyxa bunlara yaxınlaşdı, ədəb-ərkanla salam verib, əleyk alandan sonra gördü ki, bunlar ona yaman təəccüblə baxırlar. Züleyxa ürəyində elə düşündü ki, yəqin onun qız olduğunu başa düşüblər.

Bu ara bunlardan bir dilli-dilavəri ondan soruşdu:

–Ay bala, ay oğul, sən bir neçə gün bundan əvvəl buradan keçmədinmi? Özü də dedin ki, adım Yetim Hüseyndir.

Bunu eşidəndə Züleyxanın ürəyi bir az toxtaqlıq tapdı. Dedi:

– Buradan keçən mənim qardaşım idi, mənim də adım Həsəndir. İndi qardaşımın sorağı ilə onu axtarmağa gedirəm. Görüm, ya qismət, tapa bilərəmmi?

Cavanlardan başqa birisi dedi:

– Sənin qardaşını Xorasana tərəf yola saldıq. Atasını axtarmağa gedirdi.

Züleyxa dedi:

– Elə mən də Xorasana getməliyəm. Əvvəlcə qardaşımı axtarıb tapmalı, sonra da atamı soraqlamalıyam.

Həmin adamlar dedilər:

– Get, Allah özü sənə kömək olsun. Ancaq bir təvəqqəmiz var.

Züleyxa dedi:

– Buyurun, təvəqqinizi eləyin.

Onlar dedilər:

Qardaşın bizə bir neçə qatar söz çalıb oxudu. Sən də oxusaydın pis olmazdı.

Züleyxa dedi:

– Axı, mənim sazım yoxdur.

Onlar dedilər:

– Eybi yoxdur, biz taparıq.

O saat saz tapıb gətirdilər, verdilər Züleyxaya. Züleyxa sazın

zilini-zil, bəmini-bəm, sinəsinin üstünə müstəkəm eləyib, aldı görək nə dedi:

Bir tərlanı əlimizdən uçurtduq,
Ahu kimi mən hər yanı gəzirəm.
Ovunuzu bərəsindən qaçırtdıq,
Yeri, göyü, asimanı gəzirəm.

Duz basıbdı yaramıza baxtımız,
Əzəlindən yıxılıbdı taxtımız,
Görən, ya Rəbb, olacaqmı vaxtımız,
Qarış-qarış Xorasanı gəzirəm.

Görməmişik atamızın üzünü,
Eşitmədik bircə kəlmə sözünü.
Dağı-daşı, bu çöllərin düzünü,
Çəmən-çiçək, gülüstanı gəzirəm.

Həsrətindən bulud kimi dolduğum,
Çiçək kimi saraldığım, solduğum,
Xeyli vaxtdır gözü yolda olduğum,
Aman-zaman bir insanı gəzirəm.

Züleyxanın dərd başından aşıbdı,
Huşu gedib, başdan ağlı çaşıbdı,
Halı yoxdur, səbri yaman daşıbdı,
Hüseyn adlı bir oğlanı gəzirəm.

– Züleyxa elə yanıqlı-yanıqlı çalıb oxuyurdu ki, adamların qəlbi kövrəlmiş, gözləri yaşla dolmuşdu. Heç onlar fikir

vermədilər ki, Həsən kimi tanıdıqları Züleyxa sözün tapşırmasını necə dedi. Adamlar Züleyxanın gözəlliyinə mat qalmışdılar. Öz aralarında pıçıldaşırdılar ki, elə bil, zalım oğlu Yusifin Züleyxasıdır. Daha hardan biləydilər ki, elə doğrudan da bu qız uşağıdır, adı da Züleyxadır.

Qərəz, cavanlar Züleyxaya dönə-dönə ”çox sağ ol” deyib, Xorasının yolunu ona göstərdilər. Züleyxa da gecəni gündüzə, gündüzü gecəyə qatıb, gəlib Xorasana çatdı. Hələ axşama çox var idi. Züleyxa da qardaşı Hüseyn kimi elədi. Tez-tələsik aparıb atını bazarda dəyər-dəyməzinə satıb, şəhərin kənarına gəldi ki, burada bir təhər gecələsin. Allah kərimdir, görsün sabah başına nə gəlir. Belə də elədi. Atını satıb, heybəsini çiyninə salıb, şəhərin kənarına gəldi. Axtara-axtara bir uçuq samanlıq tapdı. Elə qapıdan içəri girmək istəyəndə qulaqlarına zırıltı səsi gəldi. Əvvəlcə duruxdu, elə bildi ki, onu qara basır. Öz-özünə fikirləşdi ki, cin-şeytan ola bilər. Axı, babası-nənəsi həmişə danışardılar ki, cinlər ən çox samanlıqda, kalafa yerlərdə olar. Züleyxa duruxdu. İstədi ki, geri qayıtsın. Gördü yox, eşitdiyi səs cin, şeytan səsi yox, insan səsidir. Başını bir də içəri saldı. Diqqətlə səs gələn tərəfə baxdı. Gördü ki, burada bir oğlan xeylağı qıvrılıb, zarıyır. Başının üstündəki dirəkdən də bir saz salıb. Züleyxa qorxa-qorxa bir-iki addım irəli gəlib gördü ki, bu zarıyan qardaşı Heseyndir. Saz da onundur. Özünü tir-tab saldı qardışının üstünə. O ki, var ağladı. Gördü ki, Hüseynin halı hal deyil. Onun bu qədər naləsi də təsir eləmədi. Əlacı kəsilib, əlini atıb dirəkdən sazı endirdi. Aldı görək, dərdini yanıb-inildəyən qardaşına necə dedi:

Nə yatıbsan gözü yaşlı,
Oyan qardaş, oyan görüm.

Bacın qalıb can ataşlı,
Oyan qardaş, oyan görüm.

Bu nə gündü, bu nə haldı,
Hay-harayın harda qaldı,
Dərdin məni oda saldı,
Oyan qardaş, oyan görüm.

Züleyxanı çəkmə dara,
Bağrım başı oldu yara,
Yoxsa məni basır qara?
Oyan qardaş, oyan görüm.

– Züleyxa gördü ki, Hüseyn sazın səsinə yavaş-yavaş qımıldanır. Axır ki, Hüseyn gözünü açıb, başının üstündə dil deyib, ağlayan bir oğlan gördü. Diqqətlə fəhmini toplayıb gördü ki, bu bacısı Züleyxadır. Züleyxanı görəndə kövrəlsə də, xeyli toxtadı. Sazı onun əlindən alıb, görək öz dərdini, məlalını necə dilə gətirdi:

Qərib eldə can verirəm,
Ağla məni, ağla bacım,
Gül əkməmiş vay dərirəm,
Ağla məni, ağla bacım.

Anam, «oğul» deyib ağlar,
Bacım müdam qara bağlar,
Nənəm, babam yasım şaxlar,
Ağla məni, ağla bacım.

Yetişmədim muradıma,
Ox tuşlandı qanadıma,
Yaraşmayır heç adıma,
Ağla məni, ağla bacım.

Mürgüləyən bəxt yatıbdı,
Çarx fırlanıb, vaxt çatıbdı,
Atamız bizi atıbdı,
Ağla məni, ağla bacım.

Yaman yerdə axşamladım,
Dostum inlər, gülər yadım,
Yetim Hüseyn qaldı adım,
Ağla məni, ağla bacım.

Züleyxa baxdı ki, qardaşı xəstə-zad deyil, acdır. O, heybəsində olan çörəkdən, yavanlıqdan tez çıxardıb Hüseynə yedirtdi. Gedib yaxınlıqdakı arxdan da bir qab içməli su gətirdi. Yeyib-içəndən sonra Hüseynin gözlərinə işıq, dizlərinə taqət gəldi. Bir-birilərinə başlarına gələnləri danışdılar. Bu qərib eldə samanlıqda kimsəsiz qalan qardaş-bacı yenidən bir-birinə sarılıb hönkür-hönkür ağladılar. Gecənin bir vaxtına kimi oradan-buradan söhbət elədilər. Axırda ’’Allah kərimdir” deyib, yuxuya getdilər. Sabah oyananda Züleyxa heybəsindəki yavanlıqdan süfrəyə qoydu. Yeyib, ala-qarın oldular. Süfrəni yığışdıranda Züleyxa satdığı atın pulunun hamısını Hüseynə verib dedi:

– Qardaş, al bu pulu, bizi bir müddət dolandırar. İndi o vaxta qədər də Allah bir yandan bizə bir qapı açar. İndi, dur get, şəhərə. Axşama bir az yeməkdən-zaddan al gətir. Bəlkə, qulağın şəhərdə bir təzə söz eşitdi. Atamızdan bir soraq verən oldu. Sən

gələnə kimi, mən də buraları sahmana salaram, nə olar samanlıq olanda.

Züleyxa öz işində olsun. Görək Yetim Hüseyn nə elədi. O bacısını görəndən sonra xeyli ürəklənmişdi. Onun fərasətinə də heyran qaldı ki, kişi paltarı geyinib, adını da Həsən qoyub, qardaşını, atasını axtarır. Sonra bacısının verdiyi pulu cibinə qoyub, şəhərə yollandı.

Orda-burda xeyli gəzib-dolaşandan sonra gəlib şəhərin mərkəzi meydanına çıxdı. Baxıb gördü ki, burda bir yerə xeyli adam toplaşıb. Hüseyn ora-bura vurnuxdu ki, bəlkə, atasından bir səs-soraq eşitdi. Odur ki, bu adamlar olan yerə gəldi. Gördü ki, bura halvaçı dükanıdır. Adamlar halva alıb, şirin-şirin yeyirlər. Hüseynin də tamahı keçdi. Bir istədi halvadan bir az alıb yesin. Sonra dedi ki, yox, qoy gözləyim, axşam üstü alıb, isti-isti apararam, bacımla bərabər yeyərik. Buna görə də çəkilib bir daşın üstündə oturdu. Burada da yuxu onu tutdu.

Bu halvaçının adı Əhəd idi, halvasını ən çox qənddən bişirdiyinə görə adına Qənd Əhəd deyərdilər. Qənd Əhəd də dönüb olmuşdu Qəndəhəd. Xülasə, axşam oldu. Qəndəhəd kişi müştərilərin seyrəldiyini görüb, dükanı bağladı. İstədi ki, evlərinə getsin, baxıb gördü ki, dükanın böyründə bir cavan oğlan bərk yuxuya gedib. Özü də bu elə şəxsiyyətdir, elə gözəl qəddi-qamətli bir oğlandır ki, heç demə. Hiss elədi ki, buralar adamı deyil, qəribə oxşayır.

Qəndəhəd kişinin oğlana yazığı gəldi. Onu dümsükləyib qaldırdı. Oğlan ayılıb gördü ki, paho, şər çoxdan qarışıb, göz-gözü görmür. Kişini də görüb tanıdı. Tez soruşdu:

– Ay əmi, bu halvaçı dükanı nə tez bağlandı.

Qəndəhəd kişi dedi:

– Oğul, burda neyləyirsən? Dükan vaxtı çoxdan keçib.

Hüseyn yazıq-yazıq dedi:

– Ay əmi, halva alasıyam.

Qəndəhəd kişi gördü ki, oğlan qəribdir, özü də sözlü adama oxşayır. Odur ki, soruşdu:

– A bala sən kimsən?

Hüseyn dedi:

– Ay əmi, qəribəm, yetiməm, bu şəhərə təzə gəlmişəm.

Bunu eşidəndə halvaçının çiçəyi çırtladı. Onun züryəti yoxuydu. Fikirləşdi ki, Allah yaxşı yetirib. Həm oğulluğa götürərəm, həm də mənə həyan olar, kömək eləyər. Ona görə dedi:

– Oğul adın nədir?

Hüseyn dedi:

– Əmi, adım Hüseyndir. Yetim olduğuma görə Yetim Hüseyn deyirlər.

Halvaçı dedi:

– Oğul, mənim də adım Əhəddir. Halvanı qəndlə bişirdiyimə görə adıma Qənd Əhəd deyirlər. Görürəm, yaxşı oğlansan, gəl keçək dükana, orada söhbət eləyək.

Bunu deyib Qəndəhəd kişi dükanı açdı. Hüseyni də ora dəvət elədi. Əvvəlcə Hüseyn qarnını halvayla doyuzdurandan sonra bacısı üçün də halva almaq istədi. Gördü ki, halvaçı onu buraxmaq istəmir. Hüseyn halvaçının məqsədini anladı. Fikirləşdi ki, gəl sözünü bu adama sazla de. Gözünü gəzdirib gördü ki, halvaçının dükanının küncündə bir saz var. Nə vaxtdandır ki, çalınmadığından toz basıb. Hüseyn cəld qalxıb, sazı divardan endirdi, onun tozunu silib təmizlədi. Zilini zil, bəmini bəm eləyib, görək, özünü halvaçıya necə nişan verdi:

Qoca baba, mən dolanım başına,
Qoca, mən qəribəm, axşam bazarı.

Gəl, rəhm elə gözdən axan yaşıma,
Qoca, mən qəribəm, axşam bazarı.

Qəndəhəd kişi bunu eşidib dedi:

– Ay bala, Ay Hüseyn sən nə qabiliyyətli, nə şəxsiyyətli oğlansan. Nə gözəl səsin, avazın var. Ancaq mənim də sinəmə bir-iki xanı söz gəlib. Olarmı birini də mən deyim?

Hüseyn dedi:

– Buyur, baba.

Aldı görək halvaçı Qəndəhəd nə dedi, biz nə eşitdik:

Qoca baban alsın sənin qadanı,
Oğul, nədi sən qəribin güzarı.
Doğru danış, mətləbini qanım mən,
Görüm, nədi sən qəribin güzarı.

Aldı Hüseyn:
Cavan ikən mən ömrümdən doymuşam,
Ürəkləri oyum-oyum oymuşam.
Bir anam var Lut şəhrində qoymuşam,
Baba, mən qəribəm axşam bazarı.

Aldı Qəndəhəd:
Tanımaram sultanını, xanını,
İsnad versən mənə adı, sanını,
Buyurram cəlladı, allam canını,
Görüm nədi sən qəribin güzarı.

Aldı Hüseyn:
Qürbət eldə yetən yoxdu dadıma,
Anam, bacım büryan oldu oduma.
Yetim Hüseyn çağırarlar adıma,
Qoca, mən qəribəm axşam bazarı.

Hüseynin belə yanıqlı-yanıqlı oxuması halvaçının ürəyini lap kövrəltdi. Dedi, gəl ürəyindən keçənləri sazla-sözlə Hüseynə çatdır, görüm, cavabı nədir? Halvaçı yenidən Hüseynin qəddi-qamətinə, boy-buxununa, ağıl-kamalına ata gözüylə baxdı, görək öz fikrini ona necə çatdırdı:

Qəndəhədəm, dövlətim var, varım var,
Namusum var, qeyrətim var, arım var.
Oğlum olsan, gözüm üstə yerin var,
İndi tutdu sən qəribin güzarı.

Bunu eşidən Hüseyn gördü ki, yox, halvaçı olanda nə olar? Qəndəhəd kişi alicənab, canlara dəyən bir adamdır. Ona görə də onun sözünü yerə salmayıb dedi:

– Qəndəhəd əmi, mən tək deyiləm, bir bacım da var.

Bunu eşidən Qəndəhəd kişi ikiqat sevindi. İstədi ağzını açıb, nəsə desin. Hüseyn onu qabaqladı.

– Qəndəhəd əmi, məni bağışla, qarıxdım, qardaşım da var, əvəzinə bacım var dedim.

Halvaçı dedi:

– Ay bala, daha yaxşı. Qardaşın indi hardadır?

Hüseyn dedi:

– Şəhərin kənarındakı samanlıqda.

Qəndəhəd kişi dedi:

– Bala, Hüseyn, durma, şər qarışmamış get, qardaşını da gətir, gəl evimə. Gedək əvvəlcə evin yerini göstərim, sonra get.

Qərəz, çox söhbətdən sonra onlar birlikdə gəlib Qəndəhəd kişinin evinə çatdılar. Hüseyn evin yerini yaxşı-yaxşı bələdlədi. Oradan da birbaşa bacısının yanına gəldi. Başına gələnləri Züleyxaya danışdı. Sazını da, bacısını da götürüb, halvaçıgilə gəldi. Gördü ki, halvaçı da, arvadı da evin çəpərinə söykənib, onların yollarını gözləyirlər. Halvaçının arvadı çox xoşxasiyyət, şirindil, böyük-kiçik yeri bilən, halal südəmmiş bir zənən idi. Fatma arvad uşaqların ikisinin də o üzündən, bu üzündən dönə-dönə öpdü, bağrına basdı. Cani-dillə xoş gəldin deyib, içəri apardı.

Halvaçı da, arvadı da gördülər ki, uşaqlar qərib, kimsəsiz olsalar da, lap canlara dəyən uşaqlardır. Dedilər ki, Allah bizimkini də belə yetirdi. Fatma arvad uşaqların ikisini də can köynəyindən keçirib, özünə övladlığa qəbul elədi. Sonra süfrə açıldı. Süfrəyə dünyanın yüz nazu-neməti düzüldü. Başladılar şadyanlığa, deyə-gülə bir yerdə çörək yeməyə.

O gündən Hüseyn də, Züleyxa da oldular halvaçı ilə arvadının uşaqları. Bütün şəhər bundan xəbər tutdu. Ancaq uşaqlar öz sirlərini gizli saxlayır, işin axırını gözləyirdilər. Allaha şükür eləyirdilər ki, həm dolanışıq yolları açıldı, həm də bu minvalla əlaltından soraqlaşıb, atalarını tapa biləcəklər.

Halvaçı uşaqları işlətmək istəmirdi. Çünki onun pula-vara ehtiyacı yox idi. Ancaq uşaqlar da boş dayana bilmirdilər. Atalıqlarından xahiş, minnət elədilər ki, onlara da dükanda işləməyə izn versin. Halvaçı çar-naçar razı oldu. O gündən uşaqlar dükanda işləməyə başladılar. Buraya üz tutanların çoxu uşaqların gözəlliyinə tamaşa eləməyə gəlirdi. Qərəz, müştəri o qədər çoxaldı ki, halva bişirib çatdırmaq müşkül işə çevrildi. Odur ki, dükanı

xeyli böyütdülər, işə təzə halva bişirənlər götürdülər. Halvaçı da, arvadı da gördülər ki, uşaqların ayağı çox sayıldır. Onlar gələndən evin bir-bərəkəti birə-beş artıb, pulun-paranın içində itib batırlar, var-dövlət də sel kimi axır.

Uşaqların haqqındakı söz-söhbət bütün şəhəri başına aldı. Hüseynin gözəl çalıb-oxuması onu lap dilə-ağıza salmışdı. Bu xəbər gəzə-gəzə gedib, nəhayət, vəzirin qızı Mahtəban xanımın qulağına çatdı.

Vəzir Mehdixanın üç oğlu, bir qızı var idi. Uşaqlar biri-birindən qoçaq, igid, ağıllı-kamallı idilər. Mahtəban atasının ikinci uşağı idi, gözəllikdə, hüsn-kamalda tayı-bərabəri yox idi. Böyük qardaşı Yusif də hələ evlənməmişdi. Mahtəbanın ərə getmək fikri yox idi. O biri qardaşları hələ uşaq idilər. Məhəmməd padşahın isə övladı yox idi. Ancaq o qardaşının uşaqlarını öz uşaqları kimi sevir, əzizləyirdi. İşlər başını elə qarışdırmışdı ki, Lut şəhərində hamilə qoyub gəldiyi arvadı Gülxarın başına sonralar nələr gəldiyini öyrənməyi tamam yadından çıxartmışdı.

Halvaçının oğlunun səsini, sorağını, eşidən Mahtəban bir gün kənizlərinə dedi:

– Durun, gedək bir şəhəri dolaşağın. Görək nə var, nə yox. Bu şəhərdə də belə bir adət var idi, padşahın, vəzirin, vəkilin qızı şəhərə gəzməyə çıxanda gərək bir kişi xeylağı gözə dəyməyəydi. Mahtəban xanım ən çox xətrini istədiyi kənizi Yasəmənə xəlvətcə bildirdi ki, məni o halvaçının dükanı tərəfdən apar, bəlkə, oğlanı görə bildim.

İşi gərək Allah düzəltsin. Elə ki, carçılar bütün şəhərə car çəkib bildirdilər ki, vəzirin qızı gəzməyə çıxır, hamı dükan-bazarını bağlayıb əkildi. Tərslikdən həmin gün Qəndəhəd kişinin başqa işi olduğundan dükana gəlməmişdi. Dükanı uşaqlar açıb

işlədirdilər. Carçının sözündən heç nə anlamayan Hüseyn gördü ki, birdən-birə müştərilərin ayağı kəsildi, küçə-meydanlar boşaldı. Bu, ona lap qəribə gəldi. Çünki o, belə bir şey görməmişdi. Bir də gördü ki, küçənin baş tərəfindən bir dəstə qız gəlir. Ancaq qabaqda elə bir qız var ki, gözəllikdə Ay, Gün onun yanında bir quruşa da dəyməz. Hüseyn uzaqdan-uzağa bir könüldən min könülə qıza vuruldu. Yasəmən də görəndə ki, halvaçı oğlan dükandadır, sevindiyindən bilmədi neyləsin. Mahtəbanı qucaqlayıb, üz-gözündən öpüb, dedi:

– Xanım, Allah düzəldən işə bəndə neyləyər? Halvaçı dükanı açıqdır. Uşaqlar da ordadır.

Mahtəban maraqla dedi:

– Necə olub ki, onlar dükanı bağlamayıblar? Yoxsa bizi saymır, atamın qəzəbindən qorxmurlar?

Yasəmən dedi:

– Yox, xanım, sadəcə olaraq, bu şəhərin qayda-qanununu bilmirlər.

Mahtəban xanım:

– Bəs, halvaçı?

Kəniz:

– Yaxşı, onları gedək, öyrənək.

Onlar dükanın qabağına çatanda Hüseyn də, Züleyxa da onlara ədəb-ərkanla ”xoş gəldin” elədilər.

Hüseyni görəndə Mahtəbanın az qaldı ürəyi getsin. Yasəmən də o birinə vuruldu. Xanım da, kəniz də güclə özünü ələ aldı. Gördülər ki, ayə, hələ az deyiblərmiş. Mahtəban ürəyindən keçirtdi ki, getdim bu oğlanınam, getmədim qara torpağın. Yasəmən də ürəyində deyirdi ki, ay Allah, nə olardı, o biri oğlan də mənə qismət olardı. Mahtəban uşaqları bərkə-boşa çəkmək üçün dedi:

– Siz nə cürət eləyib bizim qarşımıza çıxıbsınız. Qorxmursunuz ki, atam sizi dar ağacından asdırar?

Hüseyn dilləndi:

– Xanım, axı, biz nə günah iş tutmuşuq ki, bizi dar ağacı ilə hədələyirsən?

Xanım:

– Bilmirsən ki, mən şəhəri gəzməyə çıxanda heç bir kişi xeylağı mənim üzümü görməməlidir?

Hüseyn başa düşdü ki, bayaqki carçıdan sonra şəhər niyə boşalıb. Odur ki, sözün düzünü dedi:

– Xanım, hökm sahibisən, istər dara çəkdir, istər qul elə. Biz iki qardaş bu şəhərə cəmi-cümlətanı bir aydır ki, gəlmişik. Bu vilayətin qayda-qanunundan xəbərimiz yoxdur.

Mahtəban dedi:

– Bəs halvaçı da bilmirdi? O ki, bu yerlidir.

Hüseyn dedi:

– Xanım, halvaçı bu gün başqa yerə getdiyi üçün dükanda yoxdur. İşin tərsliyidir, biz binəvaların qisməti beləymiş.

Məhtəban gördü ki, oğlan, doğrudan da, qiyamət oğlandır. Az qaldı, elə orada ixtiyarı əldən verib desin ki, mən sənə vurulmuşam. Bir də düşündü ki, ey dili-qafil, sən neyləyirsən? Özünü ələ aldı. Hüseyni bərkə-boşa çəkib, qorxutmaq üçün dedi:

– Siz yazıq-zad deyilsiniz. Özünüz qəsdən dayanıbsınız ki, məni görəsiniz.

Hüceyn dedi:

– Xanım, Haqq bilir ki, mən düzünü danışıram. O ki qaldı, sizə baxmağımıza, bu xoşbəxtliyi də Allah özü bizə qismət elədi. Atalar deyiblər: ”Gözələ baxmaq savabdır”.

Mahtəbana aydın oldu ki, Hüseyn də onun gününə düşüb. Ona görə ürəyi bir az rahatlıq tapdı. Öz-özünə yenə də götür-qoy

elədi, öz-özünə dedi: “Öldü var, döndü yoxdur. Qaldım bu oğlanınam, öldüm qara torpağın”. Ayrılarkən dedi:

– Oğlan, bu dəfə səni qərib olduğuna görə bağışlayıram. Bir də belə eləsən, bəxtindən küs.

Hüseyn dedi:

– Baş üstə, xanım.

Hüseyn bildi ki, xanımın saqqızını oğurlayıb. Ona görə rahat oldu. Züleyxa da heç «ağ bir, qara iki» dinib-danışmadı.

Bunlar burada min bir xəyalda qalsınlar, görək Mahtəban xanımın başına nə gəldi.

Mahtəban, elə ki Hüseyni gördü, tamam ixtiyarı əldən verdi. Oradan birbaşa evə gəldi. Tir-tap düşdü yorğan-döşəyə. O yıxılan yıxıldı. Ölkədə təbib, loğman qalmadı ki, gətirməsinlər. Mahtəbanın dərdinə çarə tapılmadı ki, tapılmadı. Mahtəbanın dərdini bir Allah bilirdi, bir özü, bir də sevimli kənizi Yasəmən. Yasəmən də sirrə möhkəm idi. Mahtəban icazə verməsə, başını kəssən də heç kəsə bir söz danışmazdı.

Mahtəban gördü ki, yox, bu minvalla o, doğrudan da yorğan-döşəkdə can verəcək. Fikirləşib, bir kələk işlətdi. Bir gün anasını çağırtdırıb dedi:

– Ay ana, mənim dərdim təbiblik, loğmanlıq, həkimlik deyil.

Anası dedi:

– Bəs nədir, ay qızım? Niyə bizi dağa-daşa salırsan. Sənin dərdini çəkməkdən, day, üzülmüşük. Dərdini de, dərmanı yerin yeddi qatından da olsa atan, əmin tapıb gətirəcəklər.

Mahtəban xanım dedi:

– Ay ana, bu gecə vaqiəmdə gördüm ki, üzü niqablı bir nurani kişi mənə dedi ki, halvaçı Qəndəhədin dükanının yanından axan çayın üstündə bir imarət tikilsə, sən orada yaşasan, sap-sağlam olarsan. Hər gün də yuxudan duranda vaqiələrini, dəstəmaz

alandan sonra o suya söyləsən, azar-bezarın çıxıb gedər. Ömrü-billah xəstə olmazsan.

Bunu eşidən ana sevindiyindən bilmədi, neyləsin. Yaşarmış gözlərinin yaşını iki əlli silib dedi:

– Elə bu, qızım?

Mahtəban dedi:

– Bəli, anacan, elə bu.

Anası dedi:

– Onda ürəyini sərin saxla. Bu saat atana deyərəm. Az vaxtda istədiyin yerdə həmin imarət tikilib hazır olar.

Mahtəban dedi:

– Hə, ana, onda, elə bil ki, mən də sağalmışam.

Anası sevincdən ərinin yanına qaçdı. Qızından eşitdiklərini atasına söylədi. Bu xəbəri Məhəmməd şah da eşitdi. Əmr elədi, halvaçı Qəndəhədin dükanının yanında tez işə başlasınlar. Çox çəkmədi ki, imarət hazır oldu. Mahtəban xanımı qırx incəbel qızla həmin imarətə köçürtdülər. O gündən Mahtəban bircə dəfə də demədi ki, filan yerim ağrıyır. Qız gündən-günə ətə-qana gəldi, daha da gözəlləşdi. Atası-anası, padşah özü də buna çox şad oldular.

Hüseynin eşqi Mahtəbanı yandırıb yaxırdı. Bura köçməkdə onun məqsədi var idi. İstəyirdi ki, buradan dükana lağım atdırıb, Hüseyni gecələr öz yanına gətirsin. Buna görə, o əvvəlcə Yasəmənin köməyi ilə fikrini oğlana çatdırmalı, onun razılığını almalı idi. İndi Mahtəbanın bir ürək, sirr dostu var idisə, o da kənizi Yasəmən idi.

Mahtəban xanım bir gün Yasəməni yanına çağırıb, dedi:

– Yasəmən, yaxşı bilirsən ki, mən səndən başqa heç kəsə sirr vermirəm. Səndən gizli sirrim yoxdur. Bunu Allah da bilir. İndi istəyirəm, sənə bir sirrimi açım.

Yasəmən dedi:

– Xanım, o nə sözdür, danışırsan. Mən sənin yolunda ölümə getməyə də hazıram. Nə lazımsa, de, yerinə yetirim.

Mahtəban dedi:

– Yasəmən, bu gündən mən sənə kəniz gözü ilə baxmıram. Sən oldun qiyamət gününə kimi mənim dost-doğma bacım. İndi bir iş var, iki əməl.

Yasəmən dedi:

– O nədir xanım?

Mahtəban dedi:

– Yasəmən, heç kim bilməsə də, sən yaxşı bilirsən ki, bu imarəti burada halvaçının oğulluğu Hüseynin dərdindən tikdirmişəm.

Yasəmən dedi:

– Elədir, xanım.

Mahtəban dedi:

– İndi dalına qulaq as. Sən, gərək məni oğlanla görüşdürəsən.

Yasəmən dedi:

– Onu necə eləyim, xanım?

Mahtəban dedi:

– Çox asan. Get dükana, həmin oğlana de ki, sənin bişirdiyin halva mənim yaman xoşuma gəlir. O, sənə halva çəkib verəndə, de ki, yaxşı olar ki, qapıya qədər özün aparasan. Qapıya çatanda da deyərsən ki, xanım tapşırıb ki, halvanı oğlanın özü gətirməlidir. O, mütləq mənim yanıma gələcək. Bundan sonra işlər öz qaydasına düşəcək.

Bu məsləhət Yasəmənin lap ağlına batdı. Özü də ürəyində sevindi ki, yaxşı oldu, gedib, o biri oğlanı da mən görərəm, könlüm bir az açılar. Beləcə, ayrılıb hərə öz otağında yatdı.

Sabah açılan kimi Yasəmən kəsdi halvaçının dükanının qaba-

ğını. Hüseyni çağırıb dedi:

– Oğlan, sənin bişirdiyin halva mənim xanımımın bərk xoşuna gəlib. Xanım halva istəyir.

Hüseyn gördü ki, o vaxt gələn qızların içində bu da var idi, özü də qabaqdakı xanımın yanında idi. Bu işdən dalağı sancdı. Dedi:

– Xanım, nə qədər lazımdır?

Kəniz dedi:

– Üç adamlıq.

Hüseyn dedi:

– Yəni üç kirvəngə.

Hüseyn bildi ki, üç kirvəngə, üç adamlıq deməklə nə anlatmaq istəyir. Yəni iki biz, bir də sən. Bunu heç üzə vurmadı. Tərəzidə üç kirvəngə halva çəkdi, səliqə ilə dəsmala büküb, kənizə vermək istəyəndə Yasəmən dedi:

– Oğlan, xanımın evi yaxındı, zəhmət olmasa, qapıya qədər özün apar.

Hüseyn anladı ki, iş nə yerdədir. O, bacısını çağırıb dedi:

– Həsən, sən tərəzidə ol, müştəriləri yola sal, mən də bu xanımı ötürüb, gəlirəm.

Züleyxa eşiyə çıxanda Yasəmən müştəri gözü ilə ona baxdı, yanıb töküldü. Öz-özünə dedi: İlahi belə də gözəl oğlan olarmı? Kənizi də dərd beləcə götürdü. Onlar birlikdə Mahtəban xanımın imarətinin doqqazına çatdılar. Hüseyn əlindəki dəsmala bükülmüş halvanı Yasəmənə uzadanda, kəniz dedi:

– Oğlan, xanım mənə tapşırıb ki, halvanı sən verməlisən. Hüseyn gördü ki, yox, burada bir iş var. Xanımın sözündən də çıxmaq olmazdı. Elə, bunların hamısı Hüseynin də ürəyindən idi. O, içəri girib gördü ki, bu, həmin gördüyü xanımdır. Az qal-

dı, halva əlindən yerə tökülsün. Özünü bir təhər saxladı. Elə, Mahtəban da Hüseyni görəndə bir cür oldu, ixtiyarı əldən verdi.

Mahtəban dedi:

– Hüseyn mənə halva-zad lazım deyil. Səni görəndən dərdindən dəli-divanəyəm. Nə gecəm var, nə də gündüzüm.

Əlqərəz, Mahtəban başına gələnlərin hamısını birər-birər Hüseynə danışdı. Bunu eşidəndə Hüseynin ürəyi qızılgül kimi parlaqlandı, o da Mahtəbanın dərdindən dəli-divanə olduğunu dedi. İki aşiq-məşuq, elə buradaca and içib, əhdi-peyman bağladılar.

Hüseyn naümüd dedi:

– Mahtəban, axı mən yetim oğlanam, sən də vəzir qızı. Bu işin axırı necə olacaq?

Mahtəban xanım ürəkli-ürəkli dilləndi:

– Hüseyn, heç nədən qorxub, çəkinmə. Allah düzəltdiyi işə bəndə heç nə eləyə bilməz. Bizi görüşdürən də qismətimizdir. Bir də, bu qız mənim kənizim Yasəməndir. Sirrə çox möhkəmdir. Bizim bütün sirrimizi özümüzdən başqa bir Allah bilir, bir də o. Sağlıq olsun, bizim işimiz düzələndən sonra, onu da qardaşına alarıq. Sözün bu yerində Hüseyn diksindi. Qızlar elə bildilər ki, halvaçının oğulluğu çox söz danışmağa utanır. Axırda Mahtəban dedi:

– Hüseyn, hər gün bir bəhanəylə mənə halva gətir, görüşək. Yoxsa, səni bir gün görməsəm, çatlayıb ölərəm.

Hüseyn dedi:

– Baş üstə xanım.

Mahtəban dedi:

– Hüseyn, bir daha mənə xanım demə, elə belə, adımı de.

Hüseyn dedi:

– Baş üstə, Mahtəban, mənim ömrüm-günüm.

Mahtəban gülə-gülə dedi:

– Bax, belə. Buna nə demişəm!

Xülasə, bu minvalla hər gün Hüseyn Mahtəbana halva gətirir, onlar burada görüşür, şirin-şirin söhbət eləyir, sabahkı günün həsrətilə ayrılırdılar.

Mahtəban xanım Hüseynə elə bənd olmuşdu ki, ondan heç vaxt ayrılmaq istəmirdi. Arzusu o idi ki, Hüseyn gecəni də sabaha kimi onun yanında qalsın. Çox fikirləşəndən sonra buna da çarə tapıldı. Bir gün söhbət vaxtı dedi:

– Hüseyn, məni ”mənəm-mənəm” deyən çox oğlanlar istəyib. Ancaq heç birini bəyənib getməmişəm. Yəni qismətim sənə imiş. İndi səndən heç gecələr də ayrılmaq istəmirəm.

Hüseyn dedi:

– Mahtəban bu mümkün deyil.

Mahtəban dedi:

– Niyə?

Hüseyn dedi:

– Bəs atalığım deməz ki, gecələr haradasan? Özü də, mən sizə gedəndə görüb bilən olar. Atan duyuq düşər, ikimizin də dərimizə saman təpər.

Mahtəban dedi:

– Qorxma, ona da bir şey fikirləşmişəm.

Hüseyn dedi:

– Fikirləşibsən?

Mahtəban dedi:

– Yasəməni göndərib, kankan gətirdib, buradan düz sənin işlədiyin dükana bir lağım atdıracam. Sən də dükanda lağımın ağzına taxta parçası qoyub, onun üstünə də bir palaz sərərsən. Atalığına deyərsən ki, qoy gecələr dükanda qalım, birdən oğru-zad olar. O sənə icazə verəcək. Elə ki, əl-ayaq çəkildi, dükanın qapısını dalından bağlayıb, lağımdan keçib, yanıma gələrsən. Bir

qədər keçdikdən sonra qardaşını da gətirərsən. Sonrasına bir şey fikirləşərik. Allah kərim Allahdır.

Hüseyn dedi:

– Mahtəban, bu yetim canım sənə də qurban olsun, səni mənə yetirən Allaha da. Başı bu yolda qoymuşam. Axırı da nə olar, olar. Qaradan artıq rəng yoxdur. Sənin yolunda ölmək mənim ən böyük xoşbəxtliyimdir.

Mahtəban dedi:

– Ümidini Allahdan üzmə. Onu çağırsan, darda qalmazsan. Bizim ümidimiz bircə Allahdır. Onun ətəyindən tutan heç vaxt naümid qalmayıb. İnşallah, hər şey yaxşı olacaq.

Həmin günün səhəri Mahtəban Yasəməni göndərib, bir kankan gətirtdi. Ona deyiləsi sözünü dedi, tapşırılasını tapşırdı. Pulunu artıqlaması ilə verib dedi:

– De görüm, bu lağımı neçə günə qurtararsan?

Kankan dedi:

– Xanım, Allah canıma dəyməsə, iki günə.

Kankanın bu cavabı Mahtəbanı yaman sevindirdi. Kankan öz işinə başladı. Hüseyn də axşam dükanda öz otağında oturmuşdu. Bir də gördü ki, qulağına yerin altından guppultu səsi gəlir. Dinləyib gördü ki, kankandır, işləyir.

Getdikcə, səs otağa lap yaxınlaşırdı. Gəlhagəl, nəhayət, gəlib Hüseynin oturduğu yerə çatdı. Hüseyn də öz növbəsində kankana çox razılıq elədi, onun nəmərini verib, yola saldı. Kankan gedəndən sonra Hüseyn Allah, mədəd deyib, lağıma girdi. Düz gəlib, Mahtəban xanımın otağına çıxdı. Bir də gördü ki, budur Mahtəban xanım bağ tərəfdən min nazi-qəmzə ilə ona doğru gəlir. Yetim Hüseynin qəlbi cuşa gəldi, sazının zilini zil, bəmini bəm eləyib, sinəsinə basdı, aldı görək öz qəlbində tüğyan eləyən duyğularını öz sevgilisinə necə bəyan elədi:

Yada salıb, güzar etdin,
Yetişdin dada, xoş gəldin.
Bağda keçən ixtilatı,
Salıban yada, xoş gəldin.

Mahtəban xanım gördü ki, özünün də sinəsi dolub. Odur ki, həmayıl saçlarından bir dəstə ayırıb, cənnət qoxulu sinəsinin üstünə basdı, aldı görək, öz qəlbində tüğyan eləyən duyğularını öz sevgilisinə necə bəyan elədi:

Lağım atdım otağına,
Mən səni görməyə gəldim.
Gül dərməyə budağına,
Bir çələng hörməyə gəldim.

Aldı Hüseyn:
Sevgilim, zülflərin dara,
Həsrətəm qoynunda nara,
Sağ ol, düz çıxdın ilqara
Verdiyin vədə, xoş gəldin.

Aldı Mahtəban:
Hə sözü söyləmək çətin,
Dili olmur məhəbbətin,
Təmiz eşqin, saf niyyətin,
Yolunda ölməyə gəldim.

Hüseyn gördü ki, Mahtəbanın geyindiyi xara paltarı ona çox yaraşır. Odur ki, dedi:

Ay qız geyibsən xaranı,
Könlümə vurdun yaranı,
Yetim Hüseyni, biçaranı,
Salıban yada, xoş gəldin.

Görək, Mahtəban sözünün tapşırmasında nə dedi:

Mahtəbanam, varım vardı,
Namus, qeyrət, arım vardı,
Səndən bir ilqarım vardı,
Sirr sözüm deməyə gəldim.

Onlar beləcə hər gün, hər gecə bir yerdə olur, deyib-gülür, yeyib-içir, saz çalıb, söz oxuyurdular. Yasəmən də onların sirrini pünhan saxlayır, dərdlərinə həmişə şərik olurdu.

Şəhərin halvaçıları gördülər ki, hamı halvanı Qəndəhəddən alır, heç kim onların dükanlarına yaxın düşmür, bunun da səbəbkarının o iki qərib oğlanın olduğunu onlar çox yaxşı bilirdilər. Amma padşahın qorxusundan onlara heç kəs dəyib-dolaşa bilmirdi. Çünki, padşah öz rəiyyətinə nə qədər ədalətli, rəhmli idisə, qəriblərə ondan da çox mərhəmətli idi. Halvaçılar əlacsız qalıb, sözü bir yerə qoydular ki, padşahın yanına gedib, bu işdən onu halı eləsinlər. Bəlkə, ölkənin padşahı bu işə bir əlac elədi. Onlar, beləcə, dəstələnib Məhəmməd padşahın yanına gəldilər. Dərdlərini açıb söylədilər. Ondan kömək istədilər, imdad dilədilər.

Padşah halvaçılara bu işə bir əncam çəkəcəyini vəd eləyib, onları yola saldı. Özü dərviş-libas olub şəhərə çıxdı. Gəzə-gəzə gəlib, düz halvaçı Qəndəhədin dükanının qabağına çatdı. Gördü ki, şikayət eləyən halvaçıların dediyi kimi, şəhərdə halva alan-

ların hamısı bu dükana axışıb gəlir. Nə gedənin sayı azalır, nə gələnin. Öz-özünə fikirləşdi ki, ya Rəbb, bu nə olan işdir. Bir də yadına düşdü ki, halvaçılar ona demişdilər ki, Qəndəhəd özünə bir cüt oğulluq götürüb, hamı onların hesabına o dükandan halva alır. Padşah əyilib baxdı ki, dükanda bir cüt oğlan uşağı var, Ilahi, iki göz ver ki, müdam onlara tamaşa eləsin. Yavaş-yavaş yeriyib, lap uşaqların bərabərinə çatdı. Uşaqlar onu görəndə bir az geri çəkildilər. Hüseyn dedi:

– Baba dərvişə yol verin. Buyur, baba dərviş, sən bizim dükana xoş gəlib, səfa gətiribsən.

Padşah öz-özünə dedi: ’’Xudavəndi aləm, bu necə xilqətdir yaradıbsan. İnsanda da belə qəddi-qamət, boy-buxun, belə gözəl camal, şəstibəst olarmı? Üz-gözlərindən necə də ağıl-kamal, mərifət, qanacaq yağır. Bu uşaqlar, elə bil, padşahın ürəyinə bir cüt köz saldı. Özü də uşaqlar bir-birlərinə çox oxşayırdılar. Padşah dərindən köks ötürdü ki, ya Rəbb nə olaydı, bu uşaqlar mənim olaydı, daş düşüb, qiyamət qopmazdı ki.

Padşah Məhəmməd əlacsız qalıb, yarım kirvəngə halva aldı. Pulunu verdi. İstədi pulunun artığını götürməsin.

Hüseyn dedi:

– Dərviş baba, artıq pul haramdır, bizə haram pul lazım deyil. Al pulunun qalanını.

Məhəmməd padşah gördü ki, bunların həm də mayası haladır. Fikirli-fikirli eşiyə çıxıb, bir daşın üstündə oturub dedi: “Gərək, bu işi axıra qədər izləyəm. Görüm, bu halal südəmmiş uşaqlar kimdir?”

Axşam olub, qaranlıq çökəndə Hüseyn dükanı qıfıllayıb, qardaşı ilə evə getmək istəyəndə gördü ki, bayaq halva alan dərviş daşın üstündə oturub, mürgü vurur. Hüseyn soruşdu:

– Baba dərviş, hamı dağılıb getdi. Biz də gedirik. Sən burda

tək-tənha qalıbsan. Yoxsa qəribsən, gedəsi yerin yoxdur? Gedək, bizim qonağımız ol.

Dərviş Hüseynin bu təklifini üzə vurmasa da, ürəkdən çox sevindi. Elə, onun istədiyi də bu idi. Çünki, bu uşaqlar onun ürəyini ovsunlamışdılar.

Onlar Hüseyn olan yerə çatdılar. Hüseyn qonağı yan otağa keçirtdi. Bir az ordan-burdan söhbət eləyəndən sonra xörək gəldi. Padşah gördü ki, süfrədə nə yoxdur: quş iliyi, can dərmanı. Süfrəni yığışdırandan sonra baba dərvişə yatmağa yer açdılar. Bu vaxt Hüseynin dükanından səs gəldi. O, işin nə yerdə olduğunu bilirdi. Gedib gördü ki, Yasəmən xanımdır. Yasəmən dedi:

– Hüseyn, bu gün niyə belə gec gəldin? Xanım yaman nigarandır.

Hüseyn dedi:

– Get, xanıma de ki, qonağım var, bu gün gələ bilməyəcəyəm.

Yasəmən gedib bir də qayıtdı ki, xanım deyir ki, o nə sözdür, qonağını da götürüb gəlsin, qonaq Allah qonağıdır.

Bu söz Hüseynin ağlına batdı. Elə, padşaha da bu lazım idi. Hüseyn baba dərvişi də götürüb, həmin lağımla düz Mahtəban xanımın otağına çıxdı. Padşah gördü ki, ayə, papaq altda oğlanlar yatırmış. Neçə ilin padşahıyam, belə işi birinci dəfədir ki, görürəm. Öz-özünə söz verdi ki, bu işi gərək axıracan səbrlə izləyim.

Onlar otağa girəndən sonra o biri otaqdan Mahtəban xanım min naz-qəmzəylə bunların yanına daxil oldu, ədəb-ərkanla əvvəlcə baba dərvişə, sonra da Hüseynə xoş gəldin eləyib, dedi:

– Hüseyn, sən belə gecikməzdin.

Hüseyn dedi:

– Xanım, qonağım var idi.

Mahtəban xanım dedi:

– Hüseyn, əvvəla, nə tez yaddan çıxdı, bir daha mənə xanım

demə. Biz aşiq-məşuquq. İkincisi, qonaq Allah qonağıdır. Allaha da qurban olum, onun qonağına da.

Padşah gördü ki, bu qardaşının qızıdır. Heç nəyin üstünü vurmadı. Özü də baxdı ki, onlar çox qanacaqla hərəkət eləyirlər, mərifətli söz danışırlar.

Mahtəban Hüseynə dedi:

– Ay Hüseyn, sən baba dərvişin başını qatmaq üçün çal-çağır, mən də yemək tədarükü görüm.

Hüseyn başladı sazını kökləməyə. Padşah indi anladı ki, qardaşı Mehdixanın qızının o vaxtkı xəstəliyi nə imiş. Bu imarəti nə məqsədlə tikdirirmiş.

Bu ara, Hüseyn sazını kökləyib qurtardı, aldı görək nə dedi:

Naz eyləmə, nazlı dilbər,
Qaşın kamana layiqdir.
Sənin o şirin dillərin,
Sultana, xana layiqdir.

Öldürməz sevən-sevəni,
Niyə öldürürsən məni?
Sənin yolunda öləni,
Saxla, mehmana layiqdir.

Hüseyn deyərlər adıma,
Haqq özü çatsın dadıma.
Bu yetimin imdadına,
Yana pərvanə layiqdir.

Mahtəban xanım gözünün ucuyla baxıb gördü ki, baba dərviş lap fikir-xəyal içindədir. Ona görə də dedi:

– Hüseyn, birini oxudun, birini də oxu, qoy ürəyimiz açılsın.

Hüseyn dedi:

– Mahtəban, sənin sözün sınınca, düşmənin boynu sınsın. Sənin gözəlliyini, gör, ürək necə vəsf eləyir. Mən deyim, sən də eşit:

Hər yetənə gözəl-gözəl deməræm,
Gözəllərdə cürət, kəramət olur.
Zülf pərişan, gərdanına yayılıb,
Özündən bixəbər bir heybət olur.

Gözəl yaranıbsan mərdi-mərdana,
Salıbsan atəşi bu şirin cana,
Zər-ziba paltarda görünür sinə,
Açılsa köynəyi qiyamət olur.

Padşah öz-özünə dedi ki, ayə, gör hələ yetimdir, belə hay-həşirlə çalıb-çağırır. Gör, dədəsi olsa nə tufan qoparar. Elə bil ki, Allah iki gözəlliyi bir adama vermədiyi kimi, bu zavallını də dədəsiz qoyub. Amma görünür ki, bu əsli-zatı olan adamdır. Görünür ki, yaxşı bir kişinin balasıdır. Nə olsun ki, yetimdir. Yetim olsa da çox layiqli oğlandır. Nə olsa da mənim bu uşaqlara quşum qondu, elə bilirəm ki, doğma balalarımdır.

Nə başınızı ağrıdım. O başa qədər yeyib-içdilər, çalıb- çağırdılar. Sabah açılana yaxın hər kəs öz yerinə getdi.

Padşah da saraya getdi. Dərviş libasını soyunub, taxta əyləşdi. Vəziri huzuruna çağırtdırıb dedi:

– Qardaş, gedib dərviş-libas olub, yanıma gələrsən. Vəzir elə də elədi. Padşah dedi:

– Vəzir, mən səni bir yerə aparacağam, ancaq bir şərtlə.

Mehdixan dedi:

– Qibleyi-aləm, o nə şərtdir?

Padşah dedi:

– Vəzir, nə qədər ki, mənlə bir yerdə olacaqsan, gözün nə görsə də gərək dinməyəsən. Yoxsa, şərtimiz pozular. Hər şey alt-üst olar.

Vəzir dedi:

– O nə sözdür, qibleyi-aləm. Sən olan yerdə mənim danışmağa haqqım yoxdur.

Onlar razılaşdılar. Hər ikisi dərviş paltarı geyib, getdilər halvaçı Qəndəhədin dükanının qabağına. Axşam olanda Hüseyn yenə də dükanı bağlayıb, öz otağına getmək istəyəndə gördü ki, dünənki dərviş yenə də daşın üstündə oturub, yazıq-yazıq mürgü vurur, yanında da bir başqa dərviş oturub. Amma bu dərvişlər də bir-birinə yaman oxşayırlar. Elə bil, ekiz qardaşdırlar.

Hüseyn mehriban-mehriban soruşdu:

– Baba dərviş, niyə burada oturubsunuz? Yeriniz yoxdursa, durun bizə gedək, dincəlin, yatıb, rahatlanın. Allah qoysa, sabah öz işinizlə məşğul olarsınız.

Dərvişlərə də elə bu lazım idi. Onlar çəm-xam eləmədən razılıq verib, Hüseyngilə getdilər. Bir az dincələndən sonra dünənki vəziyyət təkrar oldu. Yasəmən Hüseynə dedi ki, əgər qonağı varsa, onu da götürüb gəlsin. Yemək-içmək çoxdan hazırdır.

Hüseyn qonaqlara üz tutub, dedi:

– Baba dərvişlər, getməli yerimiz var. Durun, bizi dəvət eləyirlər. Şam yeməyini orda yeyərik.

Onların üçü də lağıma girib, bir xeyli gedəndən sonra Mahtəban xanımın imarətinə çatdılar. Vəzir bu işlərə lap məətəl qalmışdı. Ancaq şərtə görə dinib-danışmırdı. Çünki, şərti pozsa,

şahın qəzəbinə tuş gələrdi. Bir də, özü də bu işin axırına yetmək üçün axıra qədər səbr eləməli idi.

Vəzir gördü ki, bir azdan yan otağın qapısı açıldı. Qızı Mahtəban min naz-qəmzəylə otağa daxil oldu, əvvəlcə dərvişlərə, sonra isə Hüseynə xoş gəldin eleyib, dedi:

– Hüseyn, süfrə açılana qədər sən bir az çal-oxu, qoy qonaqların başı qarışsın, biz də hazırlıq görək.

Hüseyn ”baş üstə” deyib, sazı sinəsinə basıb, aldı görək nə dedi:

Sinəndə baş verib bir cüt bostanın,
Təzəcə yetişmiş sovqatı kimi.
Dəhanın şəkərdir, şirin zəbanın,
Dodaqların Misrin nabatı kimi.

Hüseyn oxuduqca Mahtəban xanım otaqda, o yana-bu yana tovuz quşu kimi gərdan çəkib, dolanır, vəzir də içini yeyə-yeyə öz-özünə ürəyində deyirdi: ”Vay səni qızdırma aparsın, qız. Sənin ölüb-dirildiyin elə, bu idimi? Eybi yoxdur, bu kef-damağı sənin burnundan piltə-piltə tökmək qalsın sonraya!”

Hüseyn oxuduqca Mahtəban xanım tez-tez ”sağ ol” deyirdi. Yetim Hüseyn də bundan şövqə gəlir, daha böyük həvəslə oxuyurdu:

Atlas mintənəndə xara var indi,
Mərcandı düyməsi, köksü dar indi,
Beyqafildən mah-camalın göründü,
Bədirlənmiş Ayın sabatı kimi.

Kəklik kimi daldan-dala səkməkdən,
Qızıl düymən çal keçirdik dirsəkdən,
Gecə-gündüz həsrətini çəkməkdən,
Hüseynəm, incəldim xayatı kimi.

Saz tamam olan kimi süfrə açıldı. Hamı yedi, içdi, bir vəzirdən başqa. Elə bil, vəzirin boğazında ilan sümüyü qalmışdı. Nə qədər minnət elədilərsə, xeyri olmadı. Elə, "naxoşam" deyib, durdu.

Xülasə, yatmaq vaxtı gəldi. Qonaqların yerini rahatladılar. İlan vuran yatdı, ancaq vəzir yatmadı. Hirsindən az qalırdı ki, dəli olsun. Öz-özünə deyinirdi:

– Yaxşı, çəpəl, sənlə sonra danışaram. Sənin başına olmazın oyun açmaq mənim boynuma. Hələlik, qurban ol qardaşıma.

O başa yaxın yenə hamı qalxdı. Əl-üzünü yuyub, adəti üzrə süfrə başına əyləşdilər. Yeni hamı yedi, vəzirdən başqa. Bunu görüb, Mahtəban Hüseynə dedi:

– Ay Hüseyn, bu biri baba dərviş nasazdır. Nə axşam çörək yedi, nə də səhər. Bilmirəm nə varsa, yaman fikir eləyir. Hələ axşama da çox var. Qonağımızı belə pəjmürdə yola salmaq olmaz. Ona ürəyindən gələn bir gözəl söz oxu, bəlkə, bir az könlü açıla. Qonaqlarımız çox mərifətli adama, görüb-götürmüş kişilərə oxşayırlar. Oxu, qoy onlar da qulaq asıb, sənin səsindən feyziyab olsunlar.

Vəzir için-için yanıb tökülürdü. Ancaq neyləsin? Amanını kəsən kəsmişdi. Hüseyn də sazını kökləyib, xəstə dərvişin könlünə yatan sözləri seçib, oxumağa başladı. Üzünü Mahtəbana tutub, aldı görək, nə dedi, vəzir nə eşitdi:

Xəbər almaq ar olmasın,
O nədir, pəri, qoynunda?
Bimürvətdir gəlmir yola,
Bəsləyir narı qoynunda.

Bunu eşidəndə vəzir az qaldı ki, lap dəli olsun. Bir istədi, durub ikisini də qılıncdan keçirsin. Padşah bunu görüb, vəzirin ayağını basdı. Vəzir içini yeyə-yeyə qaldı. Öz-özünə dedi: ”Yaxşı, qancıq, gör mənə nə oxutdurub, qulaq asdırır. Özü də, utanmaz-utanmaz gör nə də həvəslə qulaq asır. Sənin narını aləmdə xar eləmək mənim boynuma”.

Hüseyn aldı sözün o biri xanəsini. Axı, haradan bilsin ki, bu Mahtəbanın atası idi, yoxsa abırlı sözlər oxuyardı. Oxuduğu bu xanə də lap zayılladı:

Ortalıqda vardı dostluq.
Otağına qədəm basdıq,
Sinən döşək, məmən yastıq,
Sal yataq yeri qoynunda.

Bu kəlmələri eşidəndə, elə bil, vəzirin dədəsini gordan çıxarıb, boğazına çaxır tökdülər. Öz-özünə dedi: ”Oxu, neynək, fürsət sizindir. Lap yaxşı dövran sürürsünüz. İndi görərsiniz, sizə bir toy tutacağam ki, dədənizin toyu yadınıza düşsün. Ərş evinizə kimi sizi yandıracağam”.

Aldı Hüseyn sözünün axırıncı xanəsini:

Ay qız, sən yardan doyubsan,
Bağrımın başın oyubsan,
Hüseyni yetim qoyubsan,
Qalıb əlləri qoynunda.

Söz axıra çatan kimi hərə öz işinin dalınca getdi. Padşahla vəzir də saraya gəlib, dərviş libasını çıxardıb, öz paltarlarını geyib, yerlərində oturdular. Vəzirin halı özündə deyildi. Çırtıq vursaydın qanı damardı. O, qardaşından tədbir gözləyirdi. Gördü ki, padşah da yaman pəjmürdədir, heç dinib-danışmaq istəmir. Məcbur olub, vəzirin özü sözə başladı:

– Qibləyi-aləm sağ olsun. Biz ayrı adamlar deyilik. Dost-doğma, özü də ekiz qardaşıq. Mənim biabırçılığım, sənin biabırçılığındır. Başımıza gələnləri də özün məndən yaxşı bilirsən. Mən şərtimə əməl elədim. İndi tədbirin nədir?

Padşah ağır-ağır dilləndi:

– Vəzir, dediklərinin hamısı doğrudur. Zinakarın bir cəzası var, o da ölümdür. Əmr eləyərəm, onun ikisini də şəhər meydanında dar ağacından asarlar, hamıya görk olar. Sən nə deyirsən?

Vəzir tez dilləndi:

– Qibləyi-aləm, o nə sözdür, hər ikisini də bu saat camaatın qabağında öldür, qoy ürəyim soyusun, adımızı batırdılar. Yoxsa, aləmdə rüsvay olarıq.

Padşah bir az dərin fikrə gedib, hannan-hana dilləndi:

– Qardaş, onları öldürmək mənim əlimdə bir su içimi kimi bir şeydir. Ancaq bilirsən nə var?

Vəzir dedi:

– Yox, qardaş, sən bildiyini mən haradan bilim?

Padşah təmkinlə dedi:

– Qardaş, bu sirri bir sən bilirsən, bir də mən, doğrudurmu?

Vəzir dedi:

– Bəli, qibləyi-aləm.

Padşah dedi:

– Vəzir, əgər, biz onları bu adla camaat qarşısında dara çəksək, özümüz-özümüzü aləmdə biabır eləyəcəyik.

Bunu eşidəndə, elə bil, vəzir yatmışdı, yuxudan ayıldı.

– Qardaş, bəs onda tədbirin nədir?

Padşah dedi:

– Gəl, belə eləyək. Mahtəbanı bura qatmayaq. Onun əvəzinə əmr eləyim ki, iki qardaşın ikisini də dar ağacından assınlar. Qızını da xəlvətcə öldürtdürərik.

Bu tədbir vəzirin beyninə batdı. Dedi:

– İxtiyar sahibisən, nə bilirsən, onu da elə.

Şah əmr elədi ki, dar ağacı qurulsun. Halvaçı Qəndəhədin yanındakı uşaqları dara çəksinlər. Xəlvətcə göstəriş verdi ki, Mahtəbanı zindana salsınlar. Cəlladlar hazır oldu. Qardaşların ikisini də dar ağacının dibinə gətirdilər. Nəyin üstündə dara çəkildiklərini də deyən olmadı.

Cəlladlar kəndiri Hüseynin boğazına keçirmək istəyəndə, o şahdan bir callad amanı istədi:

– Şah sağ olsun, sinəmə bir-iki xanə söz gəlib, qoy onları deyim, sonra bizə neyləyirsən elə.

Padşahın, nədənsə, bu uşaqları öldürməyə əli gəlmirdi. Amma neyləsin, qalmışdı iki suyun arasında. Öz-özünə düşündü ki, belə gözəl uşaqlara qıymaq çox insafsızlıqdır. Ürəyi bir az yumşaldı. Üzünü turşudub dedi:

– De, amma çox uzatma. Sizdən çox şikayətlər var. Çox işlər qarışdırıbsınız.

Hüseyn bilirdi ki, bu xata onlara haradan gəlib. Ona görə üstüörtülü aldı, görək, nə dedi, biz də nə eşitdik:

Bizə böhtan deyib, böhtan atanlar,  
Axtarsın dərdinə dəva bulmasın.  
Məhşər günü ağ ələmin divinə,  
İki dərviş nəslin ora gəlməsin.

Dizlərin titrəsin, qarın sıxılsın,
Ağ əlinə əlvan həna yaxılsın.
Əzəl gələn dərviş evin yıxılsın.,
Həzər elə, bu haqsızlıq olmasın.

Başına qoyubsan qızıldan tacı,
Günahsız ölürlər qardaşla bacı.
Şahım, Yetim Hüseynin budur əlacı,
İki sevgi bir arada ölməsin.

Şah baxdı ki, Hüseyn hər şeyi üstüörtülü dedi. Ancaq iş işdən keçmişdi. Padşah acıqlı-acıqlı dedi:

– Ayə, dilli-dilli ötmə, boğazın kəndirdədir. Tez ol, sözünü de, qurtar, səni asdıracağam.

Bunu eşidən Xorasan şəhərinin bütün halvaçıları bir ağızdan qışqırdılar:

– Qibləyi-aləm, o məlunları tez asdır, canımız onlardan qurtarsın. Yoxsa biz hələ çox əziyyətlər çəkəcəyik.

Padşah bu sözləri eşidəndən sonra üzünü Hüseynə tutub dedi:

– Eşidirsən, hamı sənin ölməyini istəyir. Bəlkə də, sən həm də zinakarsan, bizim xəbərimiz yoxdur.

Hüseyn başa düşdü ki, padşah hansı pərdəyə toxunur. Öz-özünə düşündü ki, yoxsa Mahtəban vəzirin qızı imiş. Bu sirri cəmi bir neçə adam bilirdi. Hüseynin sinəsi sözlə dolu idi. Şahdan bir də iltimas elədi:

– Şah, ölüm ayağında sinəmdə yenə deyiləsi sözlərim var. Onsuz da sənin əlindəyəm. İzn ver, onları da deyim, sonra özün bilərsən, istəyərsən öldürərsən, istəyərsən bağışlayarsan.

Padşah gördü ki, Hüseyn onu tanıyıb, ürəyi bir az yumşaldı, dedi:

– İzndir, amma çox uzatma, padşahın hökmü hökmdür.

Aldı görək, Hüseyn sözünü necə dedi:

Əzəl gələn dərviş, evin yıxılsın,
Gətirib çıxartdın hara Hüseyni?
El yığılıb iltimasın tutmasın,
Eylədin sən bəxti qara Hüseyni.

Hər nə oldu ala gözlü baxandan,
Şirin canım eşq oduna yaxandan.
Zalım cəllad, nə tutubsan yaxamdan,
Gətirdin amana, zara Hüseyni.

Yaxşı ki, bu günü görmədi anam,
Aradım, axtardım, tapılmır atam.
Çatsın köməyimə mənim ol Xudam,
Qoymasın çəkilə dara Hüseyni.

Bu sözlər, elə bil, padşahın ürəyinə od saldı. Düşünüb, danışdıqdan sonra öz-özünə dedi, axı, bu cavanların günahı nədir? Fikirləşib-fikirləşib, axır ki, bir yol tapdı, üzdə üzünü Hüseynə tutub dedi:

– Bala, Allah şeytana nəhlət eləsin. Boy səndə, buxun səndə, yaraşıq, ağıl, kamal səndə. Ancaq elə bir qələt iş tutubsan ki, bunun günahından keçmək olmaz. Mən istəmirəm ki, sizin kimi gözəl-göyçək uşaqların ölümünü insaflı adamlar görsünlər. Heç, mən də görmək istəmirəm. Neyləyək, taleyin qisməti beləymiş. Cəlladlara tapşıracağam ki, aparıb sizi bir bərri-biyabanda öldürüb, qanlı köynəyinizi bizə gətirib, göstərsinlər. Başqa çarəm yoxdur.

Padşah bunları deyib, cəlladlara əmr elədi ki, iki qardaşın ikisini də şəhərdən çox-çox uzaqlara aparıb, öldürsünlər. Sonra əyilib, cəlladın qulağına nəsə xısın-xısın pıçıldadı. Bunu bir cəlladdan başqa heç kəs eşitmədi. Ancaq işləri belə görən Hüseynin ürəyində bir ümid işığı yandı. Getmək vaxtı çatanda Mahtəban Hüseynin yadına düşdü. Sözlər yenə də sinəsində qatar-qatar düzüldü. Bunu padşah da hiss elədi. Cəlladlara dedi:

– Qoy ürəyini boşaltsın.

Hüseyn oxudu:

Axdı-axdı eynim yaşı, sel oldu,
Yarı gördüm, əlin verib yad ələ.
Qanlı sular zənaxdanda göl oldu,
Yarı gördüm, əlin verib yad ələ.

Qoç igidlər öz yurdunda gürz oldu,
Bu dərdsiz igidin dərdi yüz oldu,
Mərd igidə onda ölüm fərz oldu,
Desələr ki, yarın keçdi yad ələ.

Aləm bilir, sən Hüseynin gözüsən,
El içində dürlü-dürlü sözüsən.
Niyə qoydun sinəm üstə közü sən,
Demədinmi: ya yandıra, ya dələ?

Padşahla vəzir baxıb gördülər ki, Hüseyn Mahtəbanı zindana salanda ona yad əlin dəydiyinə heyfslənir. Söz tamama yetən kimi cəlladlar Hüseyni də, oğlan paltarında olan bacısı Züleyxanı da deyilən yerə apardılar. Ora çatanda cəlladlardan biri dedi:

–Padşah xəlvətcə tapşırdı ki, bu uşaqlar heyifdır, öldürmə,

bir çöl heyvanı vurub onların alt köynəklərini həmin heyvanın qanına bulayıb, bizə gətir. Yoxsa vəzir inanmaz.

Bunu deyib, uşaqları soyundurub, alt köynəklərini çıxartmaq istəyirdilər ki, uşaqların birinin paltarının altından bir gümüş xəncər, o birinin qolundan bir qızıl qolbaq çıxdı. Hər ikisinin üstündə də Məhəmməd padşahın nişangahları var idi. Cəlladlar bu işə lap məəttəl qaldılar. Bunu görəndə qoca cəllad dedi:

– Yadınızdadırmı, padşah bir dəfə belə bir fərman verdi ki, mənim bu nişan xəncərimi, bu nişan qolbağımı kimin üstündən tapsanız, tutub yanıma gətirin. Mən onları xeyli vaxtdır ki, itirmişəm. Daha doğrusu, xəzinədən oğurlayıblar. Kim bu adamları tutub gətirsə, onu qiymətli ənam gözləyir. İndi həmin oğruları biz tapmışıq. Aparıb, verək padşaha, deyək ki, itən əşyalarını oğurlayan oğruları tapmışıq.

Hüseyn də, Züleyxa da sevindiklərindən bilmirdilər neyləsinlər. Bildilər ki, Məhəmməd padşah onların axtardığı atalarıdır. Uşaqların sevindiklərini görən cəlladlar bu işə lap məəttəl qaldılar. Dedilər:

– Deyin görək, siz niyə şadlanırsınız? Axı, siz padşahın oğrularısınız. O, birinci dəfə sizi bağışladı, bu dəfə bağışlamayacaq. Sizi camaatın gözü qarşısında dar ağacından asdıracaq. Heç, bir dəfə də uf deməyəcək.

Hüseyn dedi:

– Cəllad, sən saydığını say, gör fələk nə sayır. Sən bizi padşaha çatdır, sonrasından işin yoxdur. Onda bilərsiniz ki, biz kimik və niyə sevinirik.

Uşaqlar dinmədilər. Cəlladlar uşaqların ikisini də şahın hüzuruna gətirdilər və başlarına gələnləri, gördüklərini padşaha danışdılar. Uşaqların üstündən tapdıqları xəncər və bazubəndi onun qabağına qoydular. Elə bil, padşah yatmışdı, ayıldı.

Ayağa qalxıb, ağlaya-ağlaya uşaqlarını bağrına basdı, onlara yer göstərdi. Hamı buna lap heyran olmuşdu. Vəzir yerindəcə quruyub qalmışdı. Biləndə ki, bu, qardaşının uşaqlarıdır, irəli yeriyib, hər ikisini qucaqlayıb, üz-gözlərindən öpdü, bağrına basdı. Sonra padşah da, uşaqlar da başlarına gələnləri danışdılar. Hamı bildi ki, bu ekiz uşaqların biri oğlan, biri qızdır. Məhəmməd padşah əmr elədi, Züleyxanı o biri otağa aparıb, oğlan paltarını soyundurub, şahanə qız paltarı geyindirdilər. Züleyxa oldu əsl Züleyxa. Bu gözəlliyi görənlərin ağlı başından çıxdı.

Geniş əhvalpürsanlıqdan sonra padşah dedi:

– Ay bala, nə yaxşı oldu sizi öldürmədik. Görəsən, sənə kömək duran kim oldu?

Bunu eşidən Hüseyn sazını sinəsinə qaldırıb, onun pənahında duranları, görək, atasına necə tanıtdırdı. Biz deyək, siz də şad olun:

Göydən yerə əmr olundu,
Endi Quran, demirəmmi?
Biri İncil, biri Tövrat,
Biri Zəbur demirəmmi?

Padşah dedi:

– Ay bala, de görüm, sənə daha kimlər kömək durdu?

Aldı Hüseyn sözünün o biri bəndində, görək, atasına nə dedi, o da nə eşitdi:

Məhəmməd Bürağa mindi,
Gözəl məzhəb, yaxşı dindi,
Göydə gəzən Aynan Gündü,
Şahi-mərdan demirəmmi?

Padşah yenə dedi:
– Ay bala, heç bu cəlladlardan sənə rəhmi gələn oldumu?
Hüseyn aldı görək, sözünün o biri xanəsində nə dedi:

İsrafil surunu çala,
Bu dünya kimlərə qala.
Az qalırdı canım ala,
Qoca cəllad demirəmmi?

Padşah yenə dedi:
– Bala, çox qorxdunmu, bəs, sənə daha kim kömək oldu?

Hüseynəm yoxdur günahım,
Ərşə qalxdı ünüm, ahım,
Dada yetdi Nəcəf şahım,
Cənab Əli, demirəmmi?

Söz tamama yetən kimi Məhəmməd şah əmr elədi ki, Lut şəhərindən uşaqlarının anası Gülxarı, nənəsi Nabatı, babası İsmayılı də gətirdilər. Sən demə, vəzir Mehdixanın oğlu Yusif də Züleyxanı görüb, ona vurulmuşdu. Qardaşlar razılaşdılar. Toy tədarükünə başladılar. Məhəmməd padşah uşaqların anası Gülxarla öz toyunu da qatdı bu toylara. Qərəz Məhəmmədlə Gulxarın, Hüseynlə Mahtəbanın, Yusiflə Züleyxanın toyları başladı, nə başladı.

Eşit çobandan. O çobandan ki, padşah qardaşı ilə bir gecə onun qonağı olmuşdu, Məhəmməd padşah da çobana zor-xoş yazılı bir kağız parçası vermişdi. Çoban da onu qoymuşdu alaçığın harmasına. Aradan on beş-on altı il keçmişdi. Bir gün bir oxumuş adam çobanın qonağı oldu. Oradan-buradan söhbətdən

sonra birdən çobanın yadına düşdü ki, o vaxtı qonağın verdiyi kağız harmadadır. Öz-özünə dedi: bir, gətirim görüm, bu adam o kağızı oxusun, görək, orada nə yazılıb. Çox deyirdi, al, bu kağızı saxla, bir gün gərəyin olar. Qərəz, çoban kağızı gətirib, qonağa verdi. Qonaq oxuyub, gördü ki, bunu yazan Xorasan vilayətinin padşahı Məhəmməd şahdır. Yanındakı vəziri də qardaşı Mehdixan imiş. Çoban eşitdiklərinə inanmadı. Qonaq çobana dedi ki, bu günlərdə Məhəmməd padşahın oğlunun toyudur. Bunu eşidən çoban padşahın kağızını cibinə dürtüşdürüb, dedi:

– Qonaq qardaş, mən getdim, sən də başına bir çarə qıl.

Qonaq qalxıb, öz yolu ilə getməyə başladı. Çoban da sürüsünü qabağına qatıb, «Xorasan hardadır» deyib, hayladı. Bir neçə gündən sonra gəlib, şəhərə çatdı. Sürünü düz şahın sarayının yanına apardı. Bunu tez padşaha xəbər verdilər. Padşah əmr elədi ki, çobanı hüzuruma gətirin.

Qərəz, çoban padşahın hüzuruna gəldi. Salam verəndən sonra padşah dedi:

– Çoban, nə istəyirsən?

Çoban dinməz-söyləməz cibindəki kağızı çıxardıb, padşahın qağabına qoydu. Padşah o saat çobanı tanıdı. Ona «xoş gəldin» elədi, yanında yer göstərdi.

Çoban dedi:

– Qibləyi-aləm sağ olsun, eşitdim oğlunun toyunu eləyirsən. Ona görə, mənim bu toya nəmərim otardığım sürümdür. Götür, halal-halal xoşun olsun.

Çobanın bu alicənablığı padşahın lap xoşuna gəldi. Adam göndərib, çobanın köç-külfətini də gətirdilər. Heyvanlarını özünə bağışladı. Üstəlik, ona o qədər ənam verdi ki, çobanın yeddi arxa dönəninə də bəs eləyərdi. Sonra da çobana yaxşı bir imarət tikdirib, ona yaxşı bir iş tapşırdı.

Qırx gün, qırx gecə Xorasanda bir toy oldu ki, gəl görəsən. Toyun qırxıncı günü molla çağırıb, Məhəmmədin kəbinini Gülxara, Hüseyninkini Mahtəbana, Yusifinkini də Züleyxaya kəsdilər.

Aşıq da bu dastanı duvaqqapma ilə tamamladı. Toya mübarəkdarlıq verdi. Biz də böyük ustadımız Aşıq Ələsgərin bir müxəmməsi ilə dastanımızı başa çatdıraq:

Bir gözəl gördüm bu gün,
Canlarda candan artıqdı,
Qaməti sərv ağacı,
Zülfü reyhandan artıqdı;
Qabağı ayna kimi,
Qaşı kamandan artıqdı;
Dodaqları qaymaq kimi,
Dəhanı şandan artıqdı,
Gözləri dan ulduzu,
Şöləsi şamdan artıqdı.

Qoşulub üç gözələ,
Bağları seyran eləyir,
Birisi sağında gedir,
Söhbəti hər yan eləyir;

Birisi solunda durub,
Canını qurban eləyir;
Arxasında biri yenə,
Köksünə fərman eləyir,
Üç qızın ortasında,
Gör, necə divan eləyir;

Özü rəiyyət balası.
Hökmü sultandan artıqdı.

Şah kimi bir divan qurub,
Gözəllərə cərmə kəsər;
Yanaqları əlvan-əlvan,
Mah üzündə tellər əsər;
Durna kimi sığallanıb,
Sağ əlində güllər əsər;
Gahdan silər üz-gözünü,
Gah döşünün üstə qısar;
Ağlımı başımdan alıb,
Ciyərimə dağlar basar;
Buxağında fil-fil cürə,
Xalı mərcandan artıqdı.

Çevrilib dörd yanına,
Deyərsən ki, tərlan baxır;
Çalmasını əyri çalıb,
Telləri altından çıxır;
Zülfünə şana çəkib,
Gözlərinə sürmə yaxır;
Danışar o, şirin-şirin,

Deyərsən ki, bülbül oxur;
Qoynu cənnət bağıdı,
Müşk qoxur, ənbər qoxur;
Boyu xoş bənövşədən,
Ətri süsəndən artıqdı.

Gəl üzünə ayna tutub,
Qələm qaşı əyməlәdi;
Açmış idi köksü bağın,
Məni görüb, düyməlәdi;
Sinəsi ağ billur kimi,
Ətrafı rövşən elədi;
Gül sinəsi havalanıb,
Köynəyi yırtmaq dilədi;
İstədim ki, yaxın gedim,
Yoldaşları hərbələdi;
Dedilər: yaraşmazsan,
Bu xanım səndən artıqdı.

Yeridikcə ikram elər,
Zərli corab gül başmağa;
Hər tərəfə yaxa pulu,
Adət edib oynaşmağa;
Dodaqları məzələnib,
Daldalanıb zər yaşmağa;
Mələklər həya eylər,
Üzbəsurət danışmağa.
Görmədim bərabərin,
Deyəm ki, bundan artıqdı.

Kəklik kimi səkə-səkə,
Yüz işvə-nazla yeriyir;
Ləblərindən peyda olub,
Qəndindən şəkər əriyir;
Gözləri pusqu qurub,
Qoluna qolbaq sarıyır;

Sevdasına könül verən
Vaxtsız, vədəsiz qarıyır;
Müxtəsər, Aşıq Ələsgər,
Ağzında dilin quruyur;
Deyirsən ki, bu bixəbər,
Fəqfur xaqandan artıqdı.

# QEYDLƏR VƏ İZAHLAR

## Gəraylılar

***1. Bilir zəvvar***

Şeiri Niftalı Göyçəli Loru Pəmbək bölgəsindən olan ruhani Molla İsmayılın dilindən Göyçə mahalının Dərə kəndində yaşamış ulu babası Töstülü Məmmədalıya istinadən yazıya almışdır. Şeir ilk dəfə Niftalı Göyçəlinin "Miskin Abdal və Səfəvilər" kitabında (Bakı, 2018) çap olunmuşdur.

***2. Dağlar***

Şeiri Niftalı Göyçəli Loru Pəmbək bölgəsindən olan ruhani Molla İsmayılın dilindən Göyçə mahalının Dərə kəndində yaşamış ulu babası Töstülü Məmmədalıya istinadən yazıya almışdır. Şeir ilk dəfə Niftalı Göyçəlinin "Miskin Abdal və Səfəvilər" kitabında (Bakı, 2018) çap olunmuşdur.

***3. Dünya, səndə nəyim qaldı***

Şeiri Zeynalabdin Cəfərov 1980-ci illərin əvvəllərində 100 yaşında dünyasını dəyişən dayısı İsmayılov Kərəm Oruc oğlundan yazıya almışdır. (Hər ikisi Göyçə mahalının Kərkibaş kəndindəndirlər). Şeir ilk dəfə ''Azad Azərbaycan" qəzetində (09 may 2001-ci il) çap olunmuşdur.

***4. Qocalıram***

Şeir Göyçənin Ağbulaq kəndindən olan 80 yaşlı aşıq Əli Babayevdən yazıya alınmışdır. İlk dəfə ''Miskin Abdal'' kitabında (Bakı, 2001) çap olunmuşdur.

***5. Nədir***

Şeir Göyçəli Aşıq Hacı Bayramovdın yazıya alınmışdır. İlk dəfə ''Miskin Abdal'' kitabında (Bakı, 2001) çap olunmuşdur.

***6. Dönər***

Əslən Göyçə mahalından olan 80 yaşlı tarix müəllimi Əziz Əhmədov bu şeirin, Şəmkirli Süleyman Sadiq oğlunun Tovuz rayonundan Xınnalı aşıq İdrisin dilindən qələmə alındığını bildirir. Şeir ilk dəfə ''Maarifçi'' qəzetində (24 mart 1999-cu il) çap olunmuşdur.

***7. Basın***

Məmməd Aslan tərəfindən ''Ədəbiyyat və incəsənət'' qəzetində (30.11.1974) çap olunmuş bu şeir Qərbi Azərbaycanın Hamamlı (Spitak) rayonunun Qursalı kəndindən olan 78 yaşlı aşıq Bayram İsmayıl oğlu Mustafayevdən yazıya alınmışdır. O, bu şeiri Dərəçiçək mahalının Qaraqala kəndində olan məşhur saz-söz ustası aşıq Alıdan öyrəndiyini söyləyir.

***8. Düsərsən***

1981-ci ildə aşıq Əli Babayevdən yazıya alınmış bu şeir ilk dəfə ''Kommunist'' qəzetində (18.04.1991) çap edilmişdir.

***9. Fələk***

Zeynalabdin Cəfərovun dayısı Kərəm Oruc oğlundan yazıya aldığı bu şeir ilk dəfə ''Palitra'' qəzetində (23.01.2001) çap edilmişdir.

***10. Allah, ölümün haqqdır***

Folklorçu Zeynalabdin Cəfərovun dayısı Kərəm Oruc oğlundan yazıya aldığı bu şeir ilk dəfə ''Palitra" qəzetində (23.01.2001) çap edilmişdir.

***11. Gedin, deyin Lələ bəyə***

Şeir Göyçənin Cil kəndindən olan aşıq Müseyib Nəsibovdan yazıya alınmış və ilk dəfə ''Miskin Abdal" (Bakı, 2001) kitabında çap olunmuşdur.

***12. Yarım***

Şeir Göyçənin Ağbulaq kəndindən olan aşıq Sultanəli Abbasəliyevdən yazıya alınmış və ilk dəfə ''Miskin Abdal" (Bakı, 2001) kitabında çap olunmuşdur.

***13. Bu da məni***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ''Miskin Abdal" (Bakı, 2001) kitabında çap olunmuşdur.

***14. Xos gəldin***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ''Miskin Abdal" (Bakı, 2001) kitabında çap olunmuşdur.

***15. Ağrı dağı***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ''Miskin Abdal" (Bakı, 2001) kitabında çap olunmuşdur.

***16. İsmayıla***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə "Miskin Abdal" (Bakı, 2001) kitabında çap olunmuşdur.

***17. Tapınmışam***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ''Maarifçi" qəzetində (24 mart 1999-cü il) çap olunmuşdur.

***18. Var (mədhiyyə)***

Şeiri Göyçəli Zeynalabdin Cəfərov dayısı Kərəm Oruc oğlundan yazıya almış və ilk dəfə ''Ekspress" qəzetində (06 iyun 2003-cü il) çap olunmuşdur.

***19. İmam Rza (mərsiyyə)***

Şeiri Göyçəli Zeynalabdin Cəfərov dayısı Kərəm Oruc oğlundan yazıya almış və ilk dəfə ''Ekspress" qəzetində (06 iyun 2003-cü il) çap olunmuşdur.

# QOŞMALAR

***1. Ya Əli***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal” (Bakı, 2001) kitabında çap olunmuşdur.

***2. Unutma***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə 1998-ci ildə ’’Bahar-37” kitabında çap olunmuşdur.

***3. Dağlar***

Şeir ilk dəfə ’’Ədəbiyyat və incəsənət” qəzetində (30.11.1974-cü il) çap edilmişdir. Kim tərəfindən söyləndiyi və yazıya alındığı barədə məlumat yoxdur.

***4. A dağlar.***

Şeir ilk dəfə ”Kommunist” qəzetində ”18.04.1991-ci il) çap edilmişdir. Kim tərəfindən yazıya alındığı barədə məlumat yoxdur.

***5. Dağların***

Şeirin bu variantı Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal» (Bakı, 2001) kitabında çap olunmuşdur. Şeirin başqa bir variantını 1998-ci ildə Dəmir Gədəbəyli «Azərbaycan” jurnalında (№9 səh.164.) çap etdirilmişdir.

***6. A yaz ayları***

Kimdən toplanması məlum olmayan bu şeir ilk dəfə «Ulduz" jurnalında (1985, №7) çap olunmuşdur. Başqa bir variantda şeirin 1-ci bəndi belədir:

«Başladı novbahar, çəmən seyrinə,
Çıxıbdır gözəllər, a yaz ayları,
Ətrin qarışıbdır çəmən ətrinə,
Dolanıb gəzərlər, a yaz ayları».

"Miskin Abdal" kitabında (Bakı, 2001) bu bənd getmişdir.

***7. Yar deyə-deyə***

Şeiri Göyçəli Zeynalabdin Cəfərov dayısı Kərəm Oruc oğlundan yazıya almış və ilk dəfə "Azad Azərbaycan" qəzetində (09.05.2001-ci il) çap olunmuşdur.

***8. Gedər.***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə 1998-ci ildə "Bahar-37" kitabında çap olunmuşdur.

***9. Məni***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ''Ağrı dağı" qəzetində (1998, №15) çap olunmuşdur.

***10. Qaldı***

Göyçənin Sarıyaqub kənd sakini Əli Behbud oğlu tərəfindən yazıya alınmış bu şeir ilk dəfə ''Şəmkir" qəzetində (1990) çap olunmuşdur.

***11. Pir idi***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ”El düzümləri, elat söyləmələri” kitabında (Bakı, Azərnəşr, 1993) və sonra ”Ağrı dağı” qəzetində (1998, №11) çap olunmuşdur.

***12. Ağlaram***

Folklorçu professor Sədnik Paşayev tərəfindən yazıya alınmış bu şeir ilk dəfə şair Məmməd Aslan tərəfindən ”Ədəbiyyat və incəsənət” qəzetində (30.11.1974-cü il) çap edilmişdir. Tarixi romanlar müəllifi, yazıçı Əzizə Cəfərzadə ”Bakı -1501” əsərində bu şeirdən istifadə etmişdir.

***13. Əlif-Lam***

Folklorçu professor Sədnik Paşayevdən əldə olunmuş bu şeir ilk dəfə şair Məmməd Aslan tərəfindən ”Ədəbiyyat və incəsənət” qəzetində (30.11.1974-cü il) çap edilmişdir. Şeirin kim tərəfindən söyləndiyi məlum deyildir.

***14. Qocalıq***

Şəmkirli Süleyman Sadiq oğlunun Tovuz rayonundan Xınnalı Aşıq İdrisin dilindən qələmə aldığı bu şeiri tarix müəllimi Əziz Əhmədov çatdırmışdır. İlk dəfə ”Ədəbiyyat” qəzetində (18.12.1998-ci il) çap edilmişdir.

***15. Dönərmi***

Şəmkirli Süleyman Sadiq oğlunun Tovuz rayonundan Xınnalı Aşıq İdrisin dilindən qələmə aldığı bu şeiri tarix müəllimi Əziz Əhmədov çatdırmışdır. İlk dəfə ”Ədəbiyyat” qəzetində (18.12.1998-ci il) çap edilmişdir.

***16. Dolanar***

Şəmkirli Süleyman Sadiq oğlunun Tovuz rayonundan Xınnalı Aşıq İdrisin dilindən qələmə aldığı bu şeiri tarix müəllimi Əziz Əhmədov çatdırmışdır. İlk dəfə ''Ədəbiyyat'' qəzetində (18.12.1998-ci il) çap edilmişdir.

***17. Qocaldım***

Şəmkirli Süleyman Sadiq oğlunun Tovuz rayonundan Xınnalı Aşıq İdrisin dilindən qələmə aldığı bu şeiri tarix müəllimi Əziz Əhmədov çatdırmışdır. İlk dəfə ''Ədəbiyyat'' qəzetində (18.12.1998-ci il) çap edilmişdir.

***18. Nökərəm***

Göyçə mahalının Babacan kəndindən olan aşıq Qədir Vəliyevdən Əziz Əhmədovun yazıya aldığı bu şeir ilk dəfə «Azərbaycan müəllimi'' qəzetində (06.05.1999-cü il) çap edilmişdir.

***19. Ağlaram***

Göyçənin Cil kəndindən olan Abbas Mazanovdan yazıya alınmış bu şeir ilk dəfə «Miskin Abdal'' (Bakı, 2001) kitabında çap olunmuşdur.

***20. Ayaq üstədir***

Göyçənin Cil kəndindən olan Abbas Mazanovdan yazıya alınmış bu şeir ilk dəfə «Göyçə kimi intizarda elim var'' (Bakı, 1999) kitabında çap olunmuşdur.

Göyçəli aşıq Hacı Bayramov bu şeirin başqa variantını söyləmişdir:

Səhərdən bu bağın keştinə vardım,
Bağbanı yatmayıb, ayaq üstədir,
Könlüm pərvaz eylər şahı görməyə,
Seyraqub yatmayıb, ayaq üstədir.

Qoca təbiəti qurur Mikayıl,
Məğribdən məşriqə gəzir Əzrail,
Tanrıdan sədalar verir Cəbrail,
Şeytan da yatmayıb, ayaq üstədir.

Abdalın paklığı düzgün cavabdır,
Doğru söz söyləmək özü savabdır,
Şahim, nə yatıbsan, dünya xarabdır,
Haqq özü yatmayıb, ayaq üstədir.

***(ilk dəfə ”Miskin Abdal” (Bakı, 2001) kitabında çap olunmuşdur)***

Bu şeirin daha bir variantı isə tanınmış folklorçu, professor Sədnik Paşayevə və folklorçu Zeynalabdin Cəfərova görə belədir:

Səhərdən bu bağın keştinə vardım,
Bu bağın bağbanı ayaq üstədir.
Könlüm pərvaz eylər yarı görməyə,
Seyraqub yatmayıb, ayaq üstədir.

Seyraqublar yar köksündən atdılar,
Ağ üzünə yaşıl bürqə tutdular,
Peyğəmbər yanına nişan getdilər,
Gətirib Cəbrayıl, ayaq üstədir.

Haqqa salam verdim, hələf eylədi,
Ya Rəbb, Tur dağında Musa neylədi?
’’Qırxlar” məclisində qulluq eylədi,
Pirim Şahi-Mərdan ayaq üstədir.

Haqqa salam verdim, aldı salamı,
Ya Rəbb, bu gözəllik səndə qalamı?
Yazılıb alına Haqqın kəlamı,
O, qələm tutanlar ayaq üstədir.

Miskin Hüseyn deyər ismim ərəbdir,
Eşqin piyaləsi dolu şərabdır,
Şahım, nə yatıbsan, dünya xarabdır,
Haqq özü yatmayıb, ayaq üstədir.

***21. Olmaz***

Şeiri Abbas Mazanov atası Əli Mazan oğlundan yazıya almışdır və ilk dəfə ’’Miskin Abdal” (Bakı, 2001) kitabında çap olunmuşdur. Şeirin Çaldıran döyüşü ilə bağlı deyildiyi daha çox ehtimal edilir.

***22. Yetiş dadıma***

Şeiri Göyçəli Zeynalabdin Cəfərov dayısı Kərəm Oruc oğlundan yazıya almış və ilk dəfə ’’Paritet” qəzetində (18.12.1998-ci il) çap olunmuşdur.

***23. Biri nə?***

Şeir professor Sədnik Paşayev tərəfindən toplanmışdır, ilk dəfədir, bütövlükdə çap olunur.

***24. <u>Bundan sənə nə?</u>***

Şeir Aşıq Hacı Bayramovdan yazıya alınmış və ’’Miskin Abdal’’ (Bakı, 2001) kitabında çap olunmuşdur.

***25. <u>Ağrı dağı</u>***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal’’ (Bakı, 2001) kitabında çap olunmuşdur.

***26. <u>Dedi</u>***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal’’ (Bakı, 2001) kitabında çap olunmuşdur.

***27. <u>İsmayıl</u>***

Şeir Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ’’Miskin Abdal’’ (Bakı, 2001) kitabında çap olunmuşdur.

***28. <u>Ya bir Allah, ya Məhəmməd, ya Əli!</u>***

Şeiri Göyçəli Zeynalabdin Cəfərov dayısı Kərəm Oruc oğlundan yazıya almış və ilk dəfə ’’Ekspress’’ qəzetində (06.06.2003-cü il) çap olunmuşdur.

***29. <u>Şah dağlar</u>***

Şeiri Göyçəli Zeynalabdin Cəfərov dayısı Kərəm Oruc oğlundan yazıya almış və ilk dəfə ’’Palitra’’ qəzetində (24.07.2001-ci il) çap olunmuşdur.

***30. Getdi***

Şeir professor Sədnik Paşayev tərəfindən toplanmışdır, ilk dəfədir, bütövlükdə çap olunur.

***31. Verəsən***

Şeir professor Sədnik Paşayev tərəfindən toplanmışdır, ilk dəfədir, bütövlükdə çap olunur.

***32. Yaşıldır, yaşıl***

Şeir professor Sədnik Paşayev tərəfindən toplanmışdır, ilk dəfədir, bütövlükdə çap olunur.

***33. Tap***

Şeir professor Sədnik Paşayev tərəfindən toplanmışdır, ilk dəfədir, bütövlükdə çap olunur.

***34. Gen gəz***

Şeir professor Sədnik Paşayev tərəfindən toplanmışdır, ilk dəfədir, bütövlükdə çap olunur.

# TƏCNİSLƏR

***1. El Ata***

Şəmkirli Süleyman Sadiq oğlunun Xınnalı Aşıq İdrisin dilindən qələmə aldığı bu şeir tarix müəllimi Əziz Əhmədovun imzası ilə ilk dəfə ’’Ədəbiyyat” qəzetində (18.12.1998-ci il) çap edilmişdir.

***2. Məni***

Bu təcnis ilk dəfə şair Məmməd Aslan tərəfindən ’’Ədəbiyyat və incəsənət” qəzetində (30.11.1974-cü il) çap edilmişdir.

# DEYİŞMƏLƏR

Hələlik yeganə olan bu deyişməni Zeynalabdin Cəfərov dayısı Kərəm İsmayılovun dilindən yazıya almış və ilk dəfə ’’Kaspi” qəzetində (14.12.2000) çap edilmişdir.

# BAYATILAR

Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış bayatılar ilk dəfə ’’Miskin Abdal” (Bakı, 2001) kitabında çap olunmuşdur.

# DİVANİLƏR

***1. Ya Əli***

Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə «Miskin Abdal" (Bakı, 2001) kitabında çap olunmuşdur.

***2. Qoymaram***

Göyçənin Ardanış kəndindən olan aşıq Kərim Paşayevdən yazıya alınmış və ilk dəfə «Azərbaycan müəllimi" qəzetində (06-12.05.1999-cü ildə) çap olunmuşdur.

***3. Məni***

Kimdən toplanması məlum olmayan bu şeir «Ədəbiyyat və incəsənət" qəzetində (30.11.1974-cü ildə) çap olunmuşdur.

***4. Yol vermədim***

Kimdən toplanması məlum olmayan bu şeir «Ədəbiyyat və incəsənət" qəzetində (30.11.1974-cü ildə) çap olunmuşdur.

***5. Narın üzə bilmərəm***

Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış bu şeir ilk dəfə «Ağrı dağı" qəzetində (1998.№11) çap olunmuşdur.

***6. Zay olmusan***

Bu şeir Zeynalabdin Cəfərov tərəfindən dayısı Kərəm Oruc oğlu İsmayılovdan yazıya almmış və ilk dəfə «Ağrı dağı" qəzetində (1998.№11) çap olunmuşdur.

***7. Yarımçıq divani***

“Qoymaynan Miskin Abdal qəzada həlak olacaq,
Ey könül, gəl düş havadan, axırın xak olacaq. “

(Bu divaninin Çaldıran döyüşündə deyildiyi ehtimal edilir. Beyt ilk dəfə Sədnik Paşayevin imzası ilə Gədəbəyin ”Tərəqqi” qəzetində (24 iyul 1970-ci il) çap edilmişdir.

## DASTANLAR

***1. “Miskin Abdal və Sənubər” dastanı***

Bu məhəbbət dastanı Göyçənin Daşkənd kəndindən olan aşıq Hacı Bayramovdan yazıya alınmış və ilk dəfə ”Miskin Abdal” (Bakı, 2001) kitabında çap olunmuşdur.

***2. “Miskin Abdal və Şah İsmayıl” dastanı***

Bu tarixi dastan Göyçə mahalının Ağbulaq kənd sakini aşıq Abbasəli Abbasovdan yazıya alınmış və ilk dəfə ”Miskin Abdal” (Bakı, 2001) kitabında çap olunmuşdur.

Aşıq Abbasəli Abbasovun etirafına görə, ustadı Aşıq Əsəddən öyrəndiyi bu dastanı o, uzun illər məlum səbəblər üzündən (Miskin Abdalın el arasında övliya kimi tanınması, müqəddəs ocaq sahibi olması) öz repertuarına daxil eləyə bilməmiş, buna görə də, dastanın nəsr hissəsi unudulmuş, yaddan çıxmışdır.

Sonralar o vaxtilə yazıya aldığı dastana aid şeirlər əsasında bu gözəl sənət əsərini yenidən bərpa etmişdir. Folklorlaşma prosesi getmədiyindən dastanın dili və üslubu klassik dastan dilindən və üslubundan əsaslı şəkildə fərqlənməkdədir.

***3. "Aslan şah və İbrahim" dastanı***

Bu dastan Göyçə mahalının Daşkənd kənd sakini Aşıq Hacı Bayramovdan yazıya alınmışdır. Göyçənin, demək olarki, bütün tanınmış saz-söz ustaları bu dastanın Miskin Abdal tərəfindən yaradılmasını birmənalı şəkildə təsdiqləyirlər. Folklorumuzun, xüsusilə, aşıq poeziyasının gözəl bilicilərindən olan Abbas Mazanov da özünün "Göyçə kimi intizarda elim var" (Baki, Gənclik, 1999) kitabında bu barədə maraqlı bilgilər vermişdir.

***4. "Yetim Hüseyn" dastanı***

Bu dastanı Göyçənin Kərkibaş kəndindən olan folklorçu müəllim Zeynalabdin Cəfərov 1980-ci illərin əvvəllərində 100 yaşında dünyasını dəyişən dayısı Kərəm Oruc oğlu İsmayılovdan yazıya almışdır. İlk dəfə "Səfəvilərin böyük övlüyası – Miskin Abdal" (Bakı, 2005) kitabında çap olunmuşdur.

# Mündəricat

# MİSKİN ABDAL – SƏFƏVİLƏRİN BÖYÜK İDEOLOQU, SUFİ ŞEYXİ

***(şeirləri və dastanları)***


**Korrektoru:** **Mahmud Əyyublu**
**Dizayner:** ***Azər Aydın (Dəmirçiyev)***

Çapa imzalanmışdır: 19.12.2018.
Formatı 60x84 1/16.
Həcmi 31 ç.v. Sifariş № 29. Tiraj 300

ADMİU - nun mətbəəsində çap edilmişdir.
Ünvan: Bakı şəh., H.Zərdabi küç., 39a
Tel: 434-50-04

